**B U N Ö M R Ə D Ə**

## *Əjdər Ağayev - 80*



## *Elmi-mədəni irsimizdən*



## *İnnovasiyalar*



## *Arxivimizdən*




**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 08**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

<u>**В этом номере**</u>



<u>**In this number**</u>

# AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ İLHAM ƏLİYEVİN SƏDRLİYİ İLƏ NAZİRLƏR KABİNETİNİN 2017-Cİ İLİN DOQQUZ AYININ SOSİAL-İQTİSADİ İNKİŞAFININ YEKUNLARINA VƏ QARŞIDA DURAN VƏZİFƏLƏRƏ HƏSR OLUNMUŞ İCLASINDA TƏHSİL NAZİRİ MİKAYIL CABBAROVUN ÇIXIŞI



-Möhtərəm cənab Prezident.

Hörmətli toplantı iştirakçıları.

Sizin təşəbbüsünüzlə hazırlanmış və Zati-alilərinizin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş “Təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın qüvvəyə minməsindən artıq dörd il ötür.

İcazənizlə strategiyada müəyyənləşdirilmiş hədəflərə nail olunması istiqamətində cari ilin ötən dövrü ərzində əldə edilmiş nailiyyətlər və gələcək addımlar barədə məlumatı diqqətinizə çatdırmaq istərdim.

Təhsil Nazirliyinin sifarişinə əsasən, qəzalı məktəblərin əvəz edilməsi çərçivəsində 73 modul tipli məktəb quraşdırılıb. Cari ilin sonunadək istifadəyə veriləcək modul tipli məktəblərin sayı 100-ü ötəcək.

Tapşırığınıza əsasən, bu işlər növbəti ildə də davam etdiriləcək, 44 rayonu əhatə edən azkomplektli və qəzalı vəziyyətdə olan 137 kənd məktəbi modul tipli məktəblərlə əvəzlənəcək.

Bununla yanaşı, bu il bir peşə tədris mərkəzi, bir uşaq-gənclər inkişaf mərkəzi, bir tədris-idman bazası, üç universitet üçün kampus və korpuslar tikilib və ya əsaslı təmir olunub.

Qayğınızın növbəti bariz nümunəsi olaraq, paytaxtın Yasamal rayonunda inşa olun-

muş 20 nömrəli məktəbin yeni binası 4 min şagirdin təhsil alması üçün gözəl şərait yaradıb. Yeni dərs ilinin ilk günündə Zatialilərinizin məktəbin açılışında iştirakı və kollektiv qarşısında proqram xarakterli çıxışı şagirdlərin vətənə sədaqət ruhunda tərbiyəsi, milli dəyərlərin qorunması, innovasiyaların, müasir texnologiyaların tətbiqi üzrə qarşıya qoyduğunuz vəzifələr təhsil işçilərinin məsuliyyətini daha da artırıb. Ölkəmizdə təhsilin inkişafına göstərdiyiniz yüksək diqqət və qayğıya görə, cənab Prezident, çoxminli təhsil işçiləri adından Sizə öz dərin təşəkkürümüzü bildiririk.

Əlamətdar haldır ki, Cəbrayıl rayonunun bərpa olunmuş Cocuq Mərcanlı kəndində də sentyabrın 15-də yeni məktəb fəaliyyətə başlayıb, bütün məktəblərdə ilk dərslər Cocuq Mərcanlının bərpası, sakinlərin doğma yurduna qayıtması, dövlətimizin bu istiqamətdə apardığı məqsədyönlü siyasətinə həsr edilib. Bu hadisə ümumi təhsil müəssisələrində şagirdlərin vətənpərvərlik ruhunda tərbiyəsi işinə böyük töhfə verib.

Strategiyaya uyğun olaraq, müəllimlərin fəaliyyətinin stimullaşdırılması sahəsində aparılan işlər 2017-ci ildə də davam etdirilib, 26 şəhər və rayonda 50 min müəllimin bilik və bacarıqları yoxlanılıb, beləliklə ölkə üzrə bütün müəllimlərin diaqnostik qiymətləndirilməsi başa çatıb.

Müəllim peşəsinin ictimai statusunun artırılması istiqamətində aparılan siyasət daha bilikli və hazırlıqlı insanların bu peşəni seçməsinə stimul yaradıb. Belə ki, cari ildə işə qəbul üzrə müsabiqədə iştirak etmək üçün 49 min müəllim elektron ərizə ilə müraciət edib ki, bu da 2013-cü illə müqayisədə üç dəfə çoxdur. Şəffaf və obyektiv təşkil edilən müsabiqə nəticəsində 5 min 644 müəllim işə qəbul edilib.

Həyata keçirilən məqsədyönlü tədbirlər yüksək nəticə göstərən abituriyentlərdə müəllim peşəsinə marağı əhəmiyyətli şəkildə artırıb. Bu il qəbul imtahanlarında 500-dən çox bal toplamış 1359 nəfər müəllimlik ixtisasını seçib.

Cənab Prezident, məktəbəhazırlığın uşaqların gələcək inkişafı və təhsilində müstəsna rolu nəzərə alınaraq, ötən dərs ilində bütün bölgələrdə dövlət büdcəsi vəsaiti hesabına 5 yaşlıların 55 faizi təhsilə cəlb edilib, cari ildə isə 65 faizə çatdırılması nəzərdə tutulub. 2020-ci ilədək bu rəqəmin 90 faizə yüksəlməsi planlaşdırılır ki, bu da dünyanın ən inkişaf etmiş ölkələrinin səviyyəsinə bərabərdir.

Bakı şəhərində birinci siniflərə şagird qəbulu prosesi tam elektronlaşdırılıb, elektron xidmət vasitəsilə 50 minə yaxın uşaq paytaxt məktəblərinə qəbul edilib. Son illərdə birinci siniflərə qəbul xeyli artıb. Belə ki, 2013-cü ildə bu göstərici 138 min təşkil edirdisə, bu il birinci siniflərə 165 min uşaq qəbul olunub.

Strategiyada təhsilin keyfiyyətinin başlıca prioritet elan olunduğu nəzərə alınaraq, 2017-2018-ci dərs ili "Ümumi təhsildə keyfiyyət ili" elan edilib. İlin nəticələrinin təhlili əsasında təhsil müəssisələri üçün keyfiyyət meyarlarının işlənməsi, bu meyarlara uyğun olaraq ümumtəhsil məktəblərinin fəaliyyətinin qiymətləndirilməsi, innovativ müəllimlərin aşkara çıxarılması sahəsində tədbirlər həyata keçiriləcək.

Təhsilə göstərilən dövlət qayğısı, yaradılmış əlverişli şərait nəticəsində son illərdə ümumi təhsil müəssisələrində buraxılış imtahanlarının keyfiyyət göstəricilərində sabit müsbət dinamika davam etməkdədir. Cari ildə yeni təhsil proqramlarının tətbiq edildiyi IX siniflərdə buraxılış imtahanı yeni qaydada təşkil edilib. İki ildən sonra həmin şagirdlərin ilk buraxılışı olacaq və bununla əlaqədar Dövlət İmtahan Mərkəzi ilə birlikdə imtahanların təşkili üzrə yeni mexanizmlər müəyyənləşdirilib. Əgər əvvəllər təhsilalanların nəzəri bilikləri qiymətləndirilirdisə, yeni sistemə əsasən biliklərin tətbiqi üzrə bacarıqlar qiymətləndiriləcək.

Yeni mexanizmə əsasən, məzunun ali məktəbə qəbul üçün topladığı ümumi bal

buraxılış və qəbul imtahanlarındakı nəticələrə əsasən müəyyənləşəcək, məktəb təhsilinin rolu əhəmiyyətli şəkildə artacaq, buraxılış imtahanının nəticəsi ali məktəbə qəbula birbaşa təsir göstərəcək.

Şagirdlərə seçdikləri ixtisas istiqamətləri üzrə daha yüksək kompetensiyalara yiyələnmək imkanı yaratmaq məqsədi ilə bir neçə il bundan əvvəl tam orta təhsil səviyyəsində başlanmış təmayülləşmənin əhatə dairəsi əhəmiyyətli şəkildə genişlənərək 720 məktəbi və 10-cu sinifdə təhsil alan şagirdlərin 35 faizini əhatə edib.

İstedadlı uşaqlarla sistemli işin təşkili nəticəsində ölkədə olimpiada hərəkatı genişlənib, bu məqsədlə olimpiada hazırlıq mərkəzləri yaradılıb. Cari ildə respublika fənn olimpiadalarına 30 minədək şagird qatılıb ki, bu da ötən ilə nisbətən 9 faiz çoxdur. 2017-ci ildə Azərbaycan məktəbliləri dünya fənn olimpiadaları və bilik müsabiqələrində 2 qızıl, 6 gümüş və 32 bürünc medal qazanıblar.

Ümumi təhsildə keyfiyyətin artırılması üzrə həyata keçirilən tədbirlər ali məktəblərə qəbulun nəticələrində də özünü göstərib. Cari ildə ali məktəblərə 37624 nəfər qəbul olub. Tələbə adını qazanmış abituriyentlərin bilik səviyyəsinin yüksəlməsini aşağıdakı rəqəmlər ifadə edir. Son dörd ildə 300-dən çox bal toplayanların sayı 16 faiz, 400-dən çox bal toplayanların sayı 19 faiz, 500-dən bal toplayanların sayı 28 faiz, 600-dən çox bal toplayanların sayı isə 43 faiz artıb.

Bu il ali təhsil müəssisələrinin magistraturasına sənəd verənlərin sayı ötən ilə nisbətən 46 faiz azalsa da, qəbul olanların sayı 36 faiz artıb. Hərbi xidmətdən möhlət hüququ verilməsi ilə əlaqədar ötən illə müqayisədə magistraturaya qəbul olan oğlanların sayı 74 faiz yüksəlib.

Universitetlərin akademik və elmi fəaliyyətdə çevikliyinin, eyni zamanda, müasir korporativ idarəetmə modellərinin tətbiqini təmin etmək üçün müvafiq sərəncamlarınızla Bakı Mühəndislik, Bakı Dövlət, Azərbaycan Dillər, Azərbaycan Dövlət İqtisad universitetlərinə publik hüquqi şəxs statusu verilib.

Təhsil Nazirliyinin təşəbbüsü ilə yaradılmış və hazırda 12 ali təhsil müəssisəsinin iştirak etdiyi “Maarifçi” Tələbə Kredit Fondu aztəminatlı ailələrdən olan 118 tələbəyə təhsil krediti təqdim edib. Onu da bildirirəm ki, cari tədris ilindən aztəminatlı ailələrdən olan tələbələrə təhsil kreditləri faizsiz təqdim olunacaq. Bununla belə, proqramın genişləndirilməsi üçün dövlət dəstəyinə ehtiyac duyulur.

Bakıda yerləşən ali məktəblərdə təhsil alan tələbələrin ehtiyacını nəzərə alaraq, Heydər Əliyev Fondunun təşəbbüsü ilə müasir yataqxana kompleksinin tikintisinə başlanıb. Yataqxana növbəti dərs ilində tələbələrin istifadəsinə veriləcək.

Bu qəbildən olan digər məsələlərdən biri kimi, ali təhsil müəssisələri üçün vahid elmi laboratoriyanın, elmi-tədqiqat mərkəzinin yaradılması məsələsini nəzərdən keçiririk. Belə mərkəzin yaradılması maliyyə vəsaitinə qənaət etməklə yanaşı, ali təhsil müəssisələrinin elmi potensialının reallaşdırılmasına, biliklərin kommersiyalaşdırılmasına və müasir tədqiqat avadanlıqlarından daha səmərəli istifadəyə imkan verər.

Bu il “Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı”nın qəbulundan 10 il keçir. Hazırda proqram üzrə 650 tələbə təhsilini davam etdirir.

Zati-alilərinizin təşəbbüsü ilə yaradılmış və vətəndaşlarımıza xaricə getmədən aparıcı universitetlərin standartlarına uyğun keyfiyyətli təhsil almaq imkanı yaradan Azərbaycan-Fransız Universitetinin (UFAZ) sentyabrın 15-də bərpa işlərindən sonra tədris binasının açılışı olub. Bu təhsil ocağına əcnəbi vətəndaşların marağını xüsusilə qeyd etmək istərdim. Belə ki, burada artıq iki xarici tələbə öz vəsaiti hesabına təhsil alır.

Qeyd etmək istərdim ki, “Yerli ali təhsil müəssisələrinin akademik potensialının təkmilləşdirilməsi üzrə Dövlət Proqramı”nın layihəsi məhz yuxarıdakı prinsiplər əsasında hazırlanıb. Əvvəlki “Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət

Proqramı"ndan fərqli olaraq, yeni proqramda əcnəbi professor-müəllim heyətinin Azərbaycanın aparıcı universitetlərində tədrisə cəlb olunması, onların iştirakı ilə birgə elmi tədqiqatların aparılması kimi yeni məqsədlər əlavə olunub.

İqtisadiyyatın şaxələndirilməsi şəraitində peşə təhsili sisteminin yenidən qurulması, bu sahədə çevik idarəetmənin təmin edilməsi, işəgötürənlərin tələblərinə cavab verən peşəkar kadrların hazırlanması, maddi-texniki bazanın müasirləşdirilməsi, təhsilin məzmununun yenilənməsi və nüfuzunun artırılması istiqamətində müvafiq işlər aparılmaqdadır. Sizin 2016-cı il 20 aprel tarixli Fərmanınızla Peşə Təhsili üzrə Dövlət Agentliyinin yaradılması bu sahədə mühüm addım olub.

Maddi-texniki bazanın yaxşılaşdırılması istiqamətində Bakı, Gəncə və Qəbələdə müasir peşə təhsil mərkəzləri inşa edilib, Mingəçevir və Quba şəhərlərində "ASAN həyat" komplekslərində fəaliyyət göstərəcək "ASAN peşə" təhsil mərkəzlərinin yaradılması işlərinə başlanılıb. Peşə təhsili müəssisələrinin şəbəkəsinin rasionallaşdırılması tədbirləri çərçivəsində 34 müəssisənin bazasında 14 Dövlət Peşə Təhsil Mərkəzi yaradılıb.

Təhsilalanların keyfiyyətli tədris resursları ilə təminatı sahəsində BP şirkəti, UNDP, Avropa İttifaqı və Britaniya Şurasının dəstəyi, yerli və xarici ekspertlərin iştirakı ilə kənd təsərrüfatı və turizm ixtisasları üzrə yeni kurikulum, dərs vəsaitləri hazırlanıb. Hazırda bu istiqamətdə işlər davam etdirilir.

Ötən ildən Təhsil Nazirliyinin "ASAN xidmət"lə birgə reallaşdırılan "ASAN peşə" layihəsi 2017-2018-ci tədris ilində ölkəni tam əhatə edib, ilk peşə-ixtisas təhsili müəssisələrinə elektron sənəd qəbulu yolu ilə 11 min 684 nəfər qəbul olunub. Qəbulda iştirak edənlərin keyfiyyət göstəriciləri üzrə cari ildə müsbət dəyişikliklər müşahidə olunub, sənəd verənlərin arasında attestat qiymətləri "4" və "5" olanların sayı ötən illə müqayisədə üç dəfə çox olub.

Əmək bazarının tələbatının daha dolğun təmin edilməsini, iqtisadiyyatın prioritet inkişaf istiqamətlərini, xüsusilə rayonların ixtisaslaşmasını nəzərə alaraq, cari tədris ilindən mövcud ilk peşə-ixtisas təhsili müəssisələrində 22 yeni ixtisas üzrə kadr hazırlığına başlanıb. Ənənəvi kənd təsərrüfatı sahələrinin bərpa edilməsi ilə bağlı "Pambıqçı", "Baramaçı", "Tütün ustası" kimi ixtisaslarla yanaşı "Suvarma sistemlərinin operatoru", "Soyuducu qurğularda məhsulların saxlanması və anbarlanması üzrə operator", "Bitkiçilik mütəxəssisi", "Aqroservis mütəxəssisi", "Heyvandarlıq mütəxəssisi" kimi yeni ixtisaslar üzrə kadr hazırlığına start verilib.

Bununla belə, peşə təhsili sistemində bir sıra problemlər də mövcuddur ki, bunlar Strateji Yol Xəritəsində nəzərdə tutulmuş tədbirlərin icrasına mane olur. Maddi-texniki bazanın köhnələrək tam sıradan çıxması, peşə-ixtisas təhsili sistemində çalışanların əməkhaqqının əmək bazarında uyğun ixtisaslar üzrə əməkhaqqı səviyyəsindən xeyli aşağı olması bu sahədə mövcud olan ən ciddi problemlərdəndir.

Cənab Prezident, Sərəncamınıza əsasən növbəti ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illik yubileyi dövlət səviyyəsində təntənəli surətdə qeyd olunacaq. Fürsətdən istifadə edərək, Azərbaycanda ilk ali təhsil ocağı olan Bakı Dövlət Universitetinin 2019-cu ildə 100 illiyinin dövlət səviyyəsində qeyd olunması barədə məsələni diqqətdən keçirməyinizi Sizdən xahiş edirəm.

Möhtərəm cənab Prezident, oktyabrın 3-də Müəllimlər Günü münasibətilə bir qrup təhsil işçisi fəxri adlara və dövlət təltiflərinə layiq görülüb. İcazə verin, çoxminli təhsil işçiləri adından göstərdiyiniz diqqət və etimada görə Sizə ən dərin minnətdarlığımı bildirim.

Diqqətinizə görə təşəkkür edirəm.

.

# 2017-2018-Cİ DƏRS İLİNİN “ÜMUMİ TƏHSİLDƏ KEYFİYYƏT İLİ” ELAN EDİLMƏSİ BARƏDƏ AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRİNİN ƏMRİ

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” sənədində təhsilin keyfiyyəti başlıca strateji prioritet elan olunmuş, ümumi təhsil müəssisələrinin şagird və məzunlarının keyfiyyət göstəricilərinin yaxşılaşdırılması aktual məsələ kimi irəli sürülmüşdür.

Ölkəmiz üçün müasir düşüncəli və rəqabətqabiliyyətli insan kapitalının formalaşdırılmasında ən kütləvi təhsil sahəsi olan ümumi təhsil xüsusi əhəmiyyətə malikdir. Ona görə də ümumi təhsilin səmərəlilik və effektivliyinin yüksəldilməsi, şagirdlərin dövrün çağırışlarına uyğun keyfiyyətli təhsillə əhatə olunması, onların cəmiyyətdə tələbyönlü şəxsiyyət, vətənpərvər ruhlu yetkin vətəndaş kimi tərbiyəsi daim diqqət mərkəzinə çəkilən mühüm vəzifə hesab olunmuşdur.

Azərbaycanda dövlət müstəqilliyinin bərpasından sonra ümumi təhsilin inkişafına dövlət qayğısı xeyli güclənmiş, onun mütərəqqi dünya təcrübəsi zəminində məqsəd, məzmun və mahiyyət baxımından yenidənqurulması, habelə şagird nailiyyətlərinin qiymətləndirilməsində müasir texnologiyaların tətbiqi istiqamətində islahat xarakterli tədbirlərin həyata keçirilməsinə başlanmışdır.

Ümumtəhsil məktəb şagirdlərinə dərsliklərin pulsuz verilməsi, bölgələrdə təlim-tərbiyə şəraitinin yaxşılaşdırılmasına, növbəliliyin əsaslı şəkildə azaldılmasına xidmət edən yüzlərlə yeni məktəb binalarının inşası, maddi və mənəvi cəhətdən köhnəlmiş məktəblərin əsaslı təmiri və onların müasir avadanlıqlarla, o cümlədən informasiya-kommunikasiya texnologiyaları ilə təchizi, pedaqoji və rəhbər pedaqoji kadrların seçilib yerləşdirilməsində ciddi qayda dəyişikliklərinin edilməsi, müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsində sağlam rəqabətin yaranması və onların əməkhaqqının artırılması ilə nəticələnən diaqnostik qiymətləndirmələrin keçirilməsi, dərs ilinin müddətinin uzadılması, istedadlı şagirdlərin olimpiada hərəkatının gücləndirilməsi, dövlət ümumtəhsil məktəblərində uşaqların məktəbəhazırlıq təhsilinin təşkili, tam orta təhsil səviyyəsində təhsilin təmayülləşməsinin tətbiqi də ümumi təhsilin keyfiyyətinə birbaşa təsir göstərən əhəmiyyətli tədbirlərdəndir.

Yerlərdə aparılmış monitorinq və araşdırmalar göstərir ki, son illər Nazirlik tərəfindən ümumtəhsil məktəb şagirdlərinin təlim nailiyyətlərinə nəzarətin gücləndirilməsi sayəsində bölgələrdə ümumi təhsil üzrə keyfiyyət göstəricilərində, xüsusilə də buraxılış imtahanları və ali məktəblərə qəbulun nəticələrində əvvəlki illərlə müqayisədə nəzərəçarpan irəliləyişlər müşahidə edilməkdədir. Bununla belə, o da etiraf olunmalıdır ki, ümumi təhsilin hazırkı keyfiyyət səviyyəsinin davamlı surətdə yaxşılaşdırıl-

ması üzrə təsirli tədbirlərin görülməsi ən zəruri vəzifə kimi meydana çıxır.

Qeyd olunanları nəzərə alaraq, ümumi təhsil sahəsində müasir dövrün çağırışlarına əsaslanmaqla inkişafı şərtləndirən keyfiyyət dəyişikliklərinə nail olmaq və bu prosesdə yerli təhsili idarəetmə orqanlarının, məktəb pedaqoji kollektivlərinin imkanlarını səfərbər etmək məqsədilə "Azərbaycan Respublikasının Təhsil Nazirliyi haqqında Əsasnamə"nin 13.5-ci bəndini rəhbər tutaraq

**ƏMR EDİRƏM:**

1. 2017-2018-ci dərs ili ölkənin dövlət ümumi təhsil müəssisələrində "Təhsildə keyfiyyət ili" elan olunsun.

2. "Təhsildə keyfiyyət ili" çərçivəsində həyata keçiriləcək tədbirləri əhatə edən Nazirliyin Fəaliyyət planı təsdiq edilsin (1 nömrəli əlavə).

3. 2017-2018-ci dərs ilində ümumi təhsilin keyfiyyətinin yüksəldilməsi ilə aktual problemlərə həsr olunmuş pedaqoji mühazirələr keçirilsin. Pedaqoji mühazirələrin keçirilmə qaydaları təsdiq olunsun (2 nömrəli əlavə).

4. Naxçıvan MR Təhsil Nazirliyi, Bakı Şəhəri üzrə Təhsil İdarəsi, Gəncə Şəhər Təhsil İdarəsi, rayon (şəhər) təhsil şöbələrinə tapşırılsın ki:

4.1. Şura iclaslarında və təhsil işçilərinin sentyabr konfranslarında 2017-2018-ci dərs ilinin "Təhsildə keyfiyyət ili" elan olunmasının əsas məqsədi və mahiyyəti, bununla əlaqədar qarşıda duran vəzifələr haqqında məktəb rəhbərlərinə ətraflı məlumat versinlər, eyni məzmunlu məlumatların məktəb pedaqoji kollektivlərinə çatdırılmasını təmin etsinlər;

4.2. "Təhsildə keyfiyyət ili" ilə bağlı Nazirliyin Fəaliyyət planında nəzərdə tutulan hədəflərin vaxtında yerinə yetirilməsi istiqamətində məqsədyönlü təşkilati-pedaqoji tədbirlər həyata keçirsinlər;

4.3. Pedaqoji mühazirələrin müəyyən olunmuş qayda üzrə təşkili üçün zəruri tədbirlər görsünlər.

5. Ümumi və məktəbəqədər təhsil şöbəsi (A.Əhmədov), Təhsilin inkişafı proqramları şöbəsi (E.Əmrullayev):

5.1. Nazirliyin Fəaliyyət planının yerlərdə yerinə yetirilməsini müntəzəm nəzarətdə saxlasınlar, nəzərdə tutulan tədbirlərin icrası ilə bağlı yerli təhsili idarəetmə orqanlarına təşkilati-metodik köməklik göstərsinlər.

5.2. Fəaliyyət planının yerinə yetirilməsi vəziyyətini öyrənmək məqsədilə yerlərə ezamiyyələr təşkil etsinlər, dərs ili ərzində seçmə yolla təhsil şöbələrinin (idarələrinin) müdirlərinin Nazirlikdə hesabatlarını dinləyib müvafiq təkliflər hazırlasınlar.

6. İnformasiya şöbəsi (E.Əliyev) əmrin əlavələri ilə birlikdə yerlərə göndərilməsini, "Azərbaycan müəllimi" qəzetində dərc olunmasını və Nazirliyin internet saytında yerləşdirilməsini, habelə "İl"lə bağlı "Azərbaycan müəllimi" qəzetində xüsusi rubrika açılmasını təmin etsin.

7. Əmrin icrasına nəzarət nazir müavini Ceyhun Bayramova həvalə olunsun.

**Mikayıl Cabbarov,**
***Azərbaycan Respublikasının təhsil naziri***
***28 avqust 2017-ci il***
***№261***



# TƏHSİLDƏ DƏYƏRLƏR İLİNDƏN KEYFİYYƏT İLİNƏ DOĞRU

**Məhəbbət Vəliyeva,**
*Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri*

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” sənədində ümumi təhsil müəssisələrinin şagird və məzunlarının bilik keyfiyyətlərinin yüksəldilməsi aktual məsələ kimi irəli sürülmüşdür.

Ümumi təhsil sahəsində müasir dövrün çağırışlarına əsaslanmaqla inkişafı şərtləndirən keyfiyyət dəyişikliklərinə nail olmaq və bu prosesdə yerli təhsili idarəetmə orqanlarının, məktəb pedaqoji kollektivlərinin imkanlarını səfərbər etmək məqsədilə Azərbaycan Respublikasının təhsil naziri cənab Mikayıl Cabbarovun 28 avqust 2017-ci il tarixli 261 nömrəli əmri ilə 2017-2018-ci dərs ili “Ümumi təhsildə keyfiyyət ili” elan olunmuşdur.

Qeyd edim ki, ötən il Bakı şəhəri təhsil işçilərinin ənənəvi sentyabr konfransında çıxışı zamanı cənab nazir 2016-2017-ci dərs ilini “Təhsildə dəyərlər ili” elan etmişdi. Dəyərlərə əsaslanan cəmiyyətdə formalaşan səxsiyyət və onun tamlığı da məhz vətənpərvərlik, dövlətçilik, milli-mənəvi köklərə bağlılıq, bəşəri dəyərlərə hörmət hisslərinin aşılanması ilə birbaşa əlaqəlidir. Ötən tədris ili təkcə dəyərlər ili kimi deyil, eyni zamanda keyfiyyətin artırılması istiqamətində görülən bir sıra işlər, yaddaqalan hadisələrlə əlamətdardır.

Hazırda Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyində 307 ümumi təhsil məktəbi (onlardan 278-i tam orta məktəb, 3-ü ümumi orta məktəb, 18-i məktəb-lisey, 7-si lisey və 1-i gimnaziya), 3 xüsusi tipli ümumi orta məktəb və 7 əyani-qiyabi (axşam) tam orta məktəb olmaqla, cəmi 317 məktəb fəaliyyət göstərir. Hesabat ilinin sonuna kimi bu məktəblərdə 28165 nəfər müəllim 392869 nəfər şagirdin təlim-tərbiyəsi ilə məşğul olub. 2015-2016-cı dərs ili ilə müqayisədə müəllimlərin sayında 2, şagirdlərin sayında 11 faiz artım müşahidə olunub.

Təhsil islahatlarına, ilk növbədə, ölkənin elm və mədəniyyət, intellektual və beyin mərkəzi olan Bakı məktəblərində başlanılması sınaqdan keçən layihələrin əhatə dairəsinin tədricən ölkə miqyasında genişləndirilərək tətbiq olunması, həmçinin burada ölkə üzrə təhsil alan ümumi təhsil müəssisələrinin şagirdlərinin təxminən üçdə birinin cəmlənməsi ilə bağlıdır. Bu baxımdan təhsilin inkişafı üzrə Dövlət Strategiyasında ümumi təhsillə bağlı müəyyənləşdirilən strateji istiqamət və hədəflərə çatmaqda Bakı Şəhəri üzrə Təhsil İdarəsinin və Bakı şəhəri təhsil işçilərinin qarşısında daha böyük öhdəliklər durur.

2016-2017-ci dərs ilində Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyində olan ümumtəhsil müəssisələrinin direktorlarının iştirakı ilə məktəblər üçün müxtəlif istiqamətlər üzrə 2 nümunədə “Ümumtəhsil müəssisəsinin illik Fəaliyyət Planı” hazırlanmış, icrası ilə bağlı müvafiq tədbirlər həyata keçirilmişdir. Vahid Fəaliyyət Planının hazırlanmasında məqsəd ümumi təhsilin səmərəlilik və effektivliyinin yüksəldilməsi, şagirdlərin dövrün çağırışlarına uyğun

keyfiyyətli təhsillə əhatə olunması, onların cəmiyyətdə tələbyönümlü şəxsiyyət, vətənpərvər ruhlu yetkin vətəndaş kimi tərbiyəsi istiqamətində bütün təhsilalanlar üçün əlverişli təhsil mühitinin və bərabər imkanların yaradılması idi. Bununla yanaşı, hesabatlılığı təmin etmək məqsədilə müxtəlif ölkələrin təcrübəsinə əsaslanaraq yeni hesabat formaları hazırlanmışdır.

Yeni dərs ilində mövcud təcrübəyə istinadən hər bir müəssisə illik fəaliyyətin təşkili və idarə olunması istiqamətində fərdi Fəaliyyət Planına əsaslanacaq.

“Xoşbəxt şagird - keyfiyyətin ən vacib göstəricisi” kimi

2016-2017-ci dərs ilinin əvvəlində məktəblərdə təlim-tərbiyə prosesinin düzgün təşkili, keyfiyyətin daha da dayanıqlı olması, “keyfiyyətli təhsilvermə”, “xoşbəxt şagird - keyfiyyətin ən vacib göstəricisi” kimi amilləri əsas götürərək səmərəli məktəb ideyasının bir dəyərə və ənənəyə çevrilməsini təmin etmək məqsədilə Bakının bütün məktəblərinin iştirakı ilə 12 inzibati rayonda “Məktəb seminarları” təşkil olunmuşdur. Hər rayon üzrə keçirilmiş təcrübə mübadiləsində 12 istiqamət üzrə həmin rayonda fəaliyyət göstərən məktəblərin nümayəndələri iştirak etmişdir.

Bu seminarlar inzibati heyət (direktor, təlim-tərbiyə işləri üzrə direktor müavinləri, təşkilatçı müavinlər, UBR, psixoloq, kitabxanaçılar), valideyn icmasının fəal üzvləri, 9-cu sinif şagirdləri, fənn müəllimləri ilə fənlər bloku (I blok- riyaziyyat, informatika, fizika, kimya, biologiya; II blok - Azərbaycan dili, ingilis dili, tarix, coğrafiya) üzrə aidiyyəti mövzular ətrafında sessiya və müzakirələr həyata keçirilmişdir. 3296 nəfərin iştirak etdiyi tədbirin hesabatlılığı və nəticələrin təhlili təmin olunmuşdur.

Dərs ilinin yekunları ilə bağlı iyun ayında keçirilən məktəb seminarları illik fəaliyyətin təhlili, mövcud problemlərin həlli yolları, hesabatlılıq, növbəti dərs ilində qarşıda duran vəzifələrə həsr olunmuşdur.

Ümumilikdə, il ərzində məktəb seminarlarında 8000 nəfərdən artıq təhsil işçisi iştirak etmişdir.

Bu növ müzakirələrin və seminarların hər bir rayonda ayrı-ayrılıqda keçirilməsində başlıca məqsəd daha çox sayda təhsil prosesinin iştirakçılarını ölkədə aparılan islahatlarla bağlı maarifləndirməklə yanaşı, prosesin hər bir iştitakçısına lazımi dəstək göstərmək və fəaliyyətlərini istiqamətləndirməkdir. Təhsildə keyfiyyətin təmin olunmasında məktəb seminarlarının səmərəliliyinə əminlik yeni dərs ilində də bu istiqamətdə fəaliyyəti davam etdirməyə əsas verir.

Məktəbəhazırlıq proqramı bütün beşyaşlıların 65 faizini əhatə edəcək.

Təhsildə keyfiyyətə təsir edən əsas amillərdən biri də uşaqların məktəbəhazırlıq mərhələsini keçməklə təlimə başlamasıdır. Ümumi təhsildə keyfiyyəti təmin etmək məqsədilə əvvəlki illərdə Azərbaycan Respublikası təhsil nazirinin müvafiq əmrinə əsasən, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyində olan bir sıra məktəblərdə ödənişli əsaslarla məktəbəhazırlıq kurslarının təşkili pilot layihəsinə start verilmişdir.

5 yaşlı uşaqların məktəb təliminə hazırlığı ilə əlaqədar onların psixoloji dayanıqlığının artırılmasını, əhatə olunduqları aləmə və təhsil mühitinə uyğunlaşdırılmasını, ünsiyyət və birgə fəaliyyət bacarıqlarına yiyələnməsini təmin etmək, bununla da ibtidai təhsilə keçidi asanlaşdırmaq məqsədilə yaradılan hazırlıq qruplarında həftədə 4 gün olmaqla 12 məşğələ keçirilmişdir. Məktəbəhazırlıq qruplarına cəlb edilən uşaqların tədris vəsaitləri ilə təminatı dövlət hesabına olmuşdur.

2016-2017-ci dərs ilində Bakı şəhərindəki dövlət ümumi təhsil müəssisələ-

rində ilk dəfə olaraq dövlət hesabına 261 məktəbdə fəaliyyət göstərən 839 məktəbə-hazırlıq qruplarında 23130 uşaq təhsil almışdır.

İlk dəfə 2017-2018-ci dərs ili üçün Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki ümumi təhsil müəssisələrində məktəbə-hazırlıq qruplarına qəbul elektron sistem (mektebeqebul.edu.az) vasitəsilə həyata keçirilmişdir. Burada əsas məqsəd vətəndaş məmnunluğunun, məktəb-valideyn münasibətlərində şəffaflığın təmin olunması, sənədlərin qəbuluna sərf ediləcək zaman və insan resurslarına qənaət edilməsidir.

Yeni dərs ilində 266 ümumi təhsil müəssisəsində 845 məktəbəhazırlıq qrupu fəaliyyət göstərəcəkdir. Əgər 2015-2016-cı dərs ilində məktəbəhazırlıq proqramı bütün beşyaşlıların 24, 2016-2017-ci dərs ilində 55 faizini əhatə edirdisə, 2017-2018-ci dərs ilində artıq bu göstərici 65 faizdir.

Son üç dərs ilində Azərbaycan Respublikası təhsil nazirinin 27 fevral 2015-ci il tarixli 242 nömrəli və 19 fevral 2016-cı il tarixli 108 nömrəli əmrlərinə əsasən, Bakı şəhərinin ümumtəhsil məktəblərinin, Təhsil Nazirliyinin birbaşa tabeliyindəki lisey və gimnaziyaların I sinfinə şagird qəbulu Bakı Şəhəri üzrə Təhsil İdarəsi tərəfindən ərizələrin onlayn qeydiyyatı aparılmaqla elektron sistem vasitəsilə həyata keçirilir. Birinci sinfə elektron sənəd qəbulunun tətbiqi “Dövlət orqanlarının elektron xidmətlər göstərməsinin təşkili sahəsində bəzi tədbirlər haqqında” Azərbaycan Respublikası Prezidentinin 23 may 2011-ci il tarixli Fərmanının tələblərinin həyata keçirilməsini təmin etmək üçün təhsil sahəsində əhaliyə göstərilən elektron xidmətlərin dairəsinin genişləndirilməsi, şagird kontingentinin uçot sisteminin təkmilləşdirilməsi məqsədilə tətbiq edilir. Bildiyiniz kimi, layihənin məqsədi I sinfə qəbul üçün ərizələrin elektron qeydiyyatı vasitəsilə təhsil sahəsində əhaliyə göstərilən elektron xidmət dairəsini genişləndirmək, şagird sıxlığı ilə əlaqədar problemləri vaxtında müəyyənləşdirib prosesin düzgün və səmərəli idarəolunmasını təmin etmək, şagird kontingentinin uçot sistemini təkmilləşdirmək, vətəndaş məmnunluğunu təmin etmək və müraciət prosesini sadələşdirməkdir.

Sənəd qəbulu ötən illərdə olduğu kimi, www.mektebeqebul.edu.az elektron sistemi vasitəsilə həyata keçirilmiş, lakin bu ildən Bakıda I sinfə qəbul qaydalarında bir sıra yeniliklər tətbiq edilmiş, valideynlərə sənəd qəbulu zamanı məktəbi, bölməni və müəllimi seçmək imkanı verilmişdir. Digər bir yenilik isə lisey və gimnaziyalara qəbulla bağlıdır. Təhsil Nazirliyinin birbaşa tabeliyindəki ümumi təhsil müəssisələrinin, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin nəzdindəki 160 nömrəli klassik gimnaziya və 287 nömrəli “Zəkalar” liseyinin I sinfinə qəbul, ilk növbədə, həmin ümumi təhsil müəssisələrinin müəyyən edilmiş mikro-ərazisində yaşayan vətəndaşların ərizələrinin qeydiyyatı, müsabiqədənkənar qəbulu vasitəsilə aparılır ki, bu da süni sıxlığın qarşını alır.

Digər ərazilərdə yaşayan valideynlərin uşaqları isə həmin ümumi təhsil müəssisələrinə yalnız müsabiqə yolu ilə qəbul üçün qeydiyyatdan keçə bilərlər. Həmin uşaqlar üçün müsabiqə iyun ayı ərzində keçirilmişdir.

Sirr deyil ki, paytaxtın bəzi məktəbləri uşaqların I sinfə qəbulunda müxtəlif meyarlara və subyektiv seçimə əsaslanırdı. Qəbulun elektron sistem vasitəsilə tənzimlənməsi eyni zamanda məktəblər arasında tədrisin səviyyəsinə görə fərqin və digər vacib amillərin aradan qaldırılmasına ciddi təsir edəcək vasitələrdən biridir.

Uşaqların I sinfə qəbulunun elektron sistem vasitəsilə həyata keçirilməsi prosesində şagird yerinin az, lakin sıxlığın

yüksək olduğu məktəblərdə mikroərazi prinsipi tətbiq olunur. Belə ki, paytaxt üzrə ümumi təhsil müəssisələrinin təxminən 15 faizə yaxın bir hissəsində I sinfə qəbul mikroərazi prinsipi əsasında aparılır. Bu, proqnozlaşdırılan və əvvəlki illərin təcrübəsi əsasında ehtimal olunan süni sıxlığın qarşısının alınması, həmin məktəblərin mikroərazisində yaşayan uşaqların təhsil hüququnun təmin olunması məqsədlərinə xidmət edir.

Bir sıra məktəblərə müxtəlif səbəblərdən şagird axınının çox olması ərazidə yaşayan uşaqların həmin məktəblərdə təhsil almaq imkanını bəzən məhdudlaşdırırdı. Bu isə insanların haqlı narazılığına, azyaşlı uşaqların lüzumsuz yerə yollarda vaxt itirməsinə səbəb olurdu. Hazırkı yanaşma əsasında hər bir uşağın yaşadığı ərazi üzrə ən yaxın dövlət ümumi təhsil müəssisəsində təhsil alması üçün bütün imkanlar yaradılmışdır.

Ümumilikdə, paytaxtın ümumi təhsil müəssisələrinin böyük əksəriyyətində, yəni 85 faizindən çoxunda heç bir ərazi prinsipi tətbiq edilmir.

Daha bir yenilik uşaqların məktəbə müsahibədənkənar qəbul olunmasıdır. Belə ki, valideyn-qanuni nümayəndə I sinfə qəbul üçün uşağın sağlamlığı haqqında tibbi arayış (forma 26U) təqdim etdiyindən uşağın psixoloji durumunun müəyyənləşdirilməsinə və müsahibəyə ehtiyac qalmır.

Əvvəlki illərdə rus bölməsi üzrə I sinfə qəbul olunan şagirdlərin təlim dili səviyyəsi sənəd qəbulu zamanı məktəblərdə yoxlanılırdı. Əslində, bu daha çox subyektiv amillərə söykənir və bir sıra hallarda verilən qərarların özünü doğrultmadığı müşahidə edilirdi. Uşağın təlim dilini lazımi səviyyədə bilməsinin onun təlim nəticələrinə təsiri haqqında və bundan irəli gələn digər məsələlərlə bağlı valideynlərlə izahat işi aparılsa da, bəzən onlar təkidlə uşaqlarının məhz rus dilində təhsil almasına üstünlük verirlər. Odur ki, builki I sinfə qəbul prosesində bu məsələdə daha çox maarifləndirmə, düzgün istiqamətləndirmə ilə tənzimlənmə işləri aparılmış, seçim valideynlərin öhdəsinə buraxılmışdır.

Uşaqların məktəbəhazırlıq təhsilinə cəlb olunmasının əhatəliliyinin ilbəil artdığını nəzərə alaraq, yaxın illərdə bu məsələnin də öz səmərəli həllini tapacağına əminik.

Əgər 2015-2016-cı dərs ili üçün ümumtəhsil məktəblərinə qeydiyyatdan keçirilmiş uşaqlardan 37102 nəfəri 6 yaşı tamam olan, 2436 nəfəri 6 yaşı tamam olmayan, 2016-2017-ci dərs ilində 38071 nəfəri 6 yaşı tamam olan, 2488 nəfəri isə 6 yaşı tamam olmayan uşaqlar idisə, yeni dərs ilində göstərici xeyli artmışdır. Belə ki, 11 sentyabr 2017-ci il tarixinə olan məlumata əsasən, 1-ci sinifdə oxuyacaq şagirdlərin 39961 nəfəri 6 yaşı tamam olan, 5462 nəfəri isə 6 yaşı tamam olmayan uşaqlardır.

Ümumilikdə, 1-ci sinfə qəbul olan uşaqların sayının 46000-dən çox olacağı gözlənilir.

Təhlillər göstərir ki, uşaqların I sinfə qəbulunda elektron qeydiyyat sisteminin tətbiqi vətəndaşların elektron xidmətlərdən istifadə imkanlarının genişləndirilməsi ilə yanaşı, şagird yerlərinin və ya pedaqoji kadrların çatışmazlığı ilə bağlı problemləri vaxtında aşkar edib qabaqlayıcı tədbirlərin həyata keçirilməsi üçün geniş imkan yaradır.

Müşahidələrə əsasən, elektron sistem vasitəsilə uşaqlarını müstəqil olaraq I sinfə qeydiyyatdan keçirən valideynlərin sayı ilbəil artır. 2015-2016-cı dərs ili üçün 129, 2016-2017-ci dərs ili üçün 20403, 2017-2018-ci dərs ili üçün 31515 uşaq şəxsiyyət vəsiqəsi ilə qeydiyyatdan keçirilmişdir. Bu ərizələrin qeydiyyatı məsələlərində vətəndaşlara kömək göstərmək məqsədilə artıq 3-cü ildir ki, paytaxt üzrə 50-dən çox Alternativ Qeydiyyat Mərkəzi fəaliyyət

göstərir.

Məktəbəhazırlıq qrupunu bitirərək məktəbə müsahibədənkənar qəbul olunan 6 yaşı 16 sentyabr-31 dekabr tarixlərində tamam olan uşaqların statistik göstəriciləri 2015-2016-cı dərs ili üçün 760, 2016-2017-ci tədris ili üçün 1122, 2017-2018-ci dərs ili üçün 4047 təşkil etmişdir.

“Sağlam təhsil - sağlam millət” layihəsi genişlənir

Təhsil Nazirliyi tərəfindən həyata keçirilən “Sağlam təhsil - sağlam millət” layihəsi çərçivəsində paytaxtın bir sıra ümumi təhsil müəssisələrində “Sağlam təhsil” sinifləri fəaliyyət göstərir. Layihənin əsas məqsədi fiziki-psixi, mənəvi sağlam, yüksək təlim və yaradıcılıq nailiyyətlərinə malik vətəndaş yetişdirməkdən ibarətdir. Layihə xüsusi aktuallıq kəsb etdiyindən müəllimlər və məktəb rəhbərləri üçün sağlam təhsil texnologiyalarının tətbiqi və prosesinin idarəedilməsi ilə bağlı davamlı olaraq metodik, tibbi-gigiyenik və psixoloji istiqamətlərdə təlimatlandırma tədbirləri reallaşdırılmışdır. Layihə 2016-cı ildə də davam etdirilərək əhatə dairəsi genişləndirilmişdir.

Qeyd edək ki, 2014-cü ildə layihədə 6 məktəb üzrə 15, 2015-ci ildə 35 məktəb üzrə 52, 2016-cı ildə 35 məktəb üzrə 49 sinif iştirak etmişdir. Yeni dərs ilində 37 məktəb üzrə 52 sinif layihə əsasında fəaliyyət göstərəcək. Dörd il ərzində ümumilikdə, 41 məktəbdə 168 sinfin “Sağlam təhsil - sağlam millət” layihəsinə cəlb olunması nəzərdə tutulur.

Ötən dərs ili ərzində Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki ümumi təhsil məktəblərində 387373, xüsusi- ümumi orta məktəblərdə (xüsusi siniflərdə) 3344, əyani-qiyabi axşam məktəblərində (qruplarında) isə 2603 şagird olmaqla, ümumilikdə, 392869 şagird təhsil almışdır.

Bakı Şəhəri üzrə Təhsil İdarəsinin nəzdindəki ümumi təhsil məktəblərini IX sinif üzrə 27708, XI siniflər üzrə 19525, XII sinif üzrə 599 nəfər bitirmişdir.

2016-2017-ci dərs ilinin sonunda bütün məzunlara yeni nümunəli attestatlar təqdim olunmuşdur. Təhsildə xüsusi nailiyyətləri ilə seçilən IX siniflər üzrə 544, XI siniflər üzrə 801, ümumilikdə, 1345 məzuna fərqlənmə attestatı, XI sinfi bitirən 26 məzuna xüsusu nümunəli attestat və qızıl medal, 3 məzuna xüsusi nümunəli attestat və gümüş medal verilmişdir.

Yeni məzmun əsasında buraxılış imtahanları

Bildiyiniz kimi, son illər Təhsil Nazirliyi tərəfindən məktəblərin keyfiyyət göstəricilərinin müəyyənləşdirilməsi IX sinif şagirdlərinin buraxılış imtahanlarının nəticələrinə əsaslanır. Aydındır ki, bu mərhələdə məktəblərin göstəricisinin yüksək olması şagirdlərin tam orta təhsil səviyyəsində uğurlu təhsilə yiyələnməsinə zəmanət verir.

İslahatın tətbiqindən sonra ilk dəfə olaraq ötən dərs ilində IX siniflərdə təhsil alan şagirdlərin buraxılış imtahanları yeni məzmun (kurikulumlar) əsasında həyata keçirilmişdir. Buraxılış imtahanlarının nəticələrinə əsasən, 2016-2017-ci dərs ilində hər iki fəndən müvəffəq qiymət alan şagirdlərin faiz göstəricisi 2015-2016-cı dərs ilinə nisbətən 4,75 faiz artmışdır.

2015-2016-cı dərs ili ilə müqayisədə 2016-2017-ci dərs ilində XI sinif şagirdlərinin də buraxılış imtahanlarının nəticələrində artım müşahidə olunmuşdur. Nəticələrə əsasən, ana dili fənni üzrə 2,46, riyaziyyat fənni üzrə 1,21, xarici dil üzrə isə 3,71 faiz daha yaxşı nəticə göstərilmişdir.

Hər iki təhsil səviyyəsi üzrə nəticələrin artmasına baxmayaraq, paytaxt məktəblərində daha yüksək göstəricilər əldə etmək istiqamətində fəaliyyəti daha da təkmilləşdirmək qarşıda duran başlıca vəzifədir.

Məlum olduğu kimi, 2017-2018-ci dərs

ili üçün ali məktəblərə qəbul imtahanlarının nəticələrində müsbət dinamika müşahidə olunub. Buna səbəblərdən biri də qəbul imtahanlarının iki dəfə keçirilməsi, bununla da abituriyentlərin öz qəbul nəticələrini yaxşılaşdırmaq imkanı qazanmasıdır. Ümumilikdə, yüksək bal toplayan abituriyentlərin sayı artmış, Bakı məktəblərinin məzunları ali məktəblərə qəbul imtahanlarında yüksək nəticə göstərmişlər. Bu il Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki ümumi təhsil müəssisələrinin 5 nəfər məzunu maksimum nəticə göstərərək 700 bal toplamışdır.

Təmayülləşmənin tətbiq olunduğu məktəblərdə daha yüksək nəticələr əldə edilir.

Ümumi təhsildə keyfiyyətə birbaşa təsir edən amillərdən biri 2017-2018-ci dərs ilinin "Ümumi təhsildə keyfiyyət ili" elan edilməsi barədə təhsil naziri cənab Mikayıl Cabbarovun 28 avqust 2017-ci il tarixli 261 nömrəli əmrində təsbit olunan tam orta təhsil səviyyəsində tədrisin təmayüllər üzrə təşkili məsələsidir. Bu məqsədlə son iki dərs ilində bu sahədə ciddi addımlar atılmış, vaxtilə Bakı şəhərinin 8 məktəbində sınaq layihə kimi tətbiq olunan tam orta təhsil səviyyəsində təhsilin təmayüllər üzrə təşkil edildiyi pilot məktəblərin şəbəkəsi ardıcıl olaraq genişləndirilmişdir.

Tam orta təhsil səviyyəsində təmayülləşmənin tətbiqində əsas məqsəd ümumi orta təhsil səviyyəsində təhsil nailiyyəti ilə fərqlənən, bu və ya digər fənn qrupu üzrə təhsil almağa xüsusi meyil və maraq göstərən, ali məktəbdə təhsilini davam etdirmək potensialına malik şagirdlərin müəyyən edilməsi və onlara səmərəli təhsil şəraitinin yaradılmasından ibarətdir.

2015-2016-cı dərs ilində ölkə üzrə 50, o cümlədən Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki 33 müəssisə həmin layihəyə cəlb edilmişdir. 2016-2017-ci dərs ilində isə 58 məktəbin 176 sinfində təhsil müxtəlif təmayüllər (texniki, riyaziyyat-iqtisadiyyat, humanitar və təbiət fənləri) üzrə təşkil edilmişdir. Təhsil Nazirliyi tərəfindən bu il ilk dəfə kombinəedilmiş təmayül siniflər üçün tədris planları təsdiq olunmuşdur.

Tam orta təhsil səviyyəsində təhsilin təmayüllər üzrə təşkil olunduğu pilot məktəblərdə problemlərin öyrənilməsi, təhlili və müvafiq təkliflərin hazırlanması məqsədilə həmin müəssisələrin rəhbərləri ilə ötən dərs ili ərzində 2 dəfə müşavirə və seminarlar keçirilmişdir. Həmçinin, pilot müəssisələrin rəhbərləri onlara verilmiş tapşırıq əsasında gələcəkdə pilot müəssisələrin fəaliyyətinin daha da təkmilləşdirilməsi üçün müəllimlərin və valideynlərin rəy və təkliflərini öyrənmişlər. İlkin təhlillər tam orta təhsil səviyyəsində təmayülləşmənin tətbiq edildiyi məktəblərdə daha yüksək nəticələr əldə olunduğunu deməyə əsas verir.

2017-2018-ci dərs ilində Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki 212 məktəbin Azərbaycan bölməsinin 432 sinfində 10077, o cümlədən, 46 məktəbin rus bölməsinin 67 sinfində 1378 şagirdin təhsil alması nəzərdə tutulmuşdur. Ümumilikdə, 212 ümumi təhsil məktəbində 11455 şagirdin təhsil alacağı 499 təmayül sinfin təşkil olunması planlaşdırılır.

Paytaxt məktəbliləri Beynəlxalq olimpiadaların qalibləri arasında da xüsusi yer tutur. Ötən dərs ilində şagirdlərin fənlərə olan meyil, maraq və bacarıqlarını müəyyənləşdirmək, istedadlı məktəbliləri üzə çıxarmaq məqsədilə VI və VII sinif şagirdləri arasında fizika, kimya, biologiya, riyaziyyat və informatika fənləri üzrə fənn müsabiqələri keçirilmişdir. Fənn müsabiqələrinin ilk mərhələsində Bakı şəhəri üzrə 3000 nəfərə yaxın şagird iştirak etmiş, respublika fənn olimpiadalarında Bakı Şəhəri üzrə Təhsil İdarəsinin nəzdindəki məktəblərdə təhsil alan şagirdlərdən 49 nəfəri qalib olmuşdur. Həmin şagirdlərdən 7-si qızıl, 13-ü gümüş,

29-u bürünc medal qazanmışdır.

Yeri gəlmişkən, qeyd edək ki, uzun illər beynəlxalq olimpiadalarda qazanılan uğurlar Təhsil Nazirliyinin birbaşa tabeliyindəki məktəblərlə yanaşı, özəl məktəblərin payına düşürdü. Onu da qeyd etmək yerinə düşər ki, Təhsil Nazirliyinin beynəlxalq olimpiadalara hazırlıq prosesini təkmilləşdirməsi və daim diqqət mərkəzində saxlaması şagirdlərin parlaq nəticələr əldə etməsinə əlverişli imkan yaradır. Təsadüfi deyil ki, ötən dərs ilində də Azərbaycan məktəbliləri beynəlxalq fənn olimpiadalarında nailiyyətlər əldə ediblər. Sevindirici haldır ki, bu il Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyində olan məktəblərdə təhsil alan şagirdlərin də adları bir çox yerli və beynəlxalq olimpiadaların qalibləri sırasındadır. Belə ki, 212 nömrəli tam orta məktəbin şagirdi Fikrət Əmirbəyli “ADA” Universitetinin təşkilatçılığı ilə keçirilən II İngilis dili Olimpiadasında qalib olaraq Böyük Britaniyada yay kursunda ödənişsiz iştirak hüququ qazanmışdır.

Bakı şəhəri 160 nömrəli Klassik Gimnaziyanın X sinif şagirdi Nəriman Mirişov 51-ci Beynəlxalq Kimya Olimpiadasında gümüş, Bakı şəhəri 291 nömrəli “Ekologiya” liseyinin şagirdi Turan Bayramlı İndoneziyanın Bali şəhərində yeniyetmələrin 13-cü Beynəlxalq Elm olimpiadasında bürünc, 27 nömrəli tam orta məktəbin X sinif şagirdi Rafael Saddatimov Türkiyənin İzmir şəhərində İnformatika üzrə Beynəlxalq Olimpiadada bürünc medal qazanmışlar.

“Sabahın alimləri” VI Respublika Müsabiqəsində 291 nömrəli “Ekologiya” liseyinin şagirdi Elşən Nağızadə və 299 nömrəli məktəb-liseyin şagirdi Elgün Alışev qalib olmuşlar. Müsabiqədə kompüter elmləri üzrə qalib olan 299 nömrəli məktəb-liseyin şagirdi Elgün Alışev 2017-ci ilin may ayında ABŞ-da İntel ISEF-Beynəlxalq Elm və Mühəndislik Sərgisində iştirak hüququ qazanmışdır. Nəticədə məktəblimiz robototexnika ve süni intellekt kateqoriyasında “Eşitmə qabiliyyəti zəif olan insanlar üçün vizual köməkçi” adlı layihəsinə görə Qətərin Tədqiqatlar Fondunun xüsusi mükafatına layiq görülmüşdür.

Məktəblilərin təfəkkürünün inkişafına təkan vermək, yerli və beynəlxalq olimpiada və bilik yarışlarında iştirak təcrübəsi qazandırmaq, istedadlı, xüsusilə yüksək məntiqi təfəkkürə malik şagirdləri vaxtında aşkara çıxarmaq üçün onları daim həvəsləndirmək və elmə olan marağını artırmaq təhsilin əsas hədəflərindəndir. Bunun üçün müxtəlif fəaliyyətlərin təşkil edilməsi bu istiqamətdə keyfiyyətin əldə olunmasına müsbət təsir edən vacib amillərdəndir. Lütfi Zadə adına Məktəblilərarası II Məntiq Olimpiadasının keçirilməsi bu məqsədə xidmət edir. Artıq 2-ci ildir ki, V sinif şagirdləri arasında təşkil olunan Məntiq Olimpiadası məktəblilər tərəfindən maraqla qarşılanır. Ötənilki olimpiadanın final mərhələsində 1859 şagird iştirak etmişdir. Bunlardan 59 nəfəri finalda 80 faiz həddi keçərək mükafatçılar siyahısına düşmüşdür. 842 şagird isə 50-80 faiz arasında nəticə göstərərək olimpiadanın final turunda fəal iştirakına görə sertifikata layiq görülmüşdür.

Azərbaycan xalqının dahi oğlu, qüdrətli dövlət xadimi və müdrik siyasətçi, müstəqil Azərbaycanın memarı Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü ilə əlaqədar ulu öndərin zəngin siyasi irsinin, şərəfli həyat və fəaliyyətinin gənc nəsil tərəfindən öyrənilməsi işini daha da gücləndirmək məqsədilə təşkil edilmiş “Ən yaxşı təqdimat” müsabiqəsinin respublika mərhələsində iştirak edən 12 paytaxt məktəblisindən 9 nəfəri I, II, III və həvəsləndirici yerlərə layiq görülmüşdür.

Ümumi təhsil müəssisələrinin şagirdləri arasında keçirilən və 30 minə yaxın şagirdin

iştirak etdiyi “Ədəbiyyat biliciləri” müsabiqəsində 5 nəfər birinci, 10 nəfər ikinci, 15 nəfər üçüncü dərəcəli diploma, 21 nəfər tərifnaməyə layiq görülmüşdür.

Bildiyiniz kimi, təhsildə keyfiyyətin yüksəldilməsində, yeni innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun təhsilalanlar tərəfindən səmərəli mənimsənilməsində müəllim amili əvəzsiz faktordur. Bu amili nəzərə alan Təhsil Nazirliyi son illərdə “Azərbaycan Respublikası Təhsil Nazirliyi sisteminə daxil olan ümumi təhsil müəssisələrində müəllimlərə tələbatın müəyyənləşdirilməsi, pedaqoji kadrların işə qəbulu və yerdəyişməsi qaydalari”na uyğun olaraq müəllimlərin işə qəbulunu mərkəzləşdirilmiş qaydada həyata keçirir.

Təhsil Nazirliyi tərəfindən keçirilən müəllimlərin işə qəbulu və yerdəyişməsi müsabiqəsinə Bakı Şəhəri üzrə Təhsil İdarəsi tərəfindən 1349 vakansiya təqdim olunmuşdur.

2017-ci ilin iyun ayında Təhsil Nazirliyi sisteminə daxil olan ümumi təhsil müəssisələrində müddətsiz müqavilə ilə işləyən müəllimlərin iş yerinin dəyişməsi prosesi proqram təminatı tətbiq edilməklə aparılmışdır. Şəffaf və sosial statusun bütün parametrləri nəzərə alınaraq həyata keçirilən Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki ümumi təhsil müəssisələrində daimi əsaslarla işləyən müəllimləri rayon (şəhər) daxili yerdəyişməsi çərçivəsində 183 müəllimin, Təhsil Nazirliyi sisteminə daxil olan digər ümumi təhsil müəssisələrində daimi əsaslarla işləyən müəllimlərin respublika daxili yerdəyişməsi çərçivəsində 92 müəllimin iş yeri Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki ümumi təhsil müəssisələrinə dəyişdirilmişdir.

Müəllimlərin işə qəbulu

Təhsil Nazirliyi tərəfindən keçirilən müəllimlərin işə qəbulu müsabiqəsinin hazırkı dövrə tamamlanmış mərhələləri üzrə 651 nəfər işə qəbul edilmişdir.

Hesabat ilində paytaxtın ümumi təhsil müəssisələrində Gənclərin Çağırışaqədərki Hazırlığı üzrə rəhbər, psixoloq, uşaq birliyi təşkilatı rəhbəri və laborant vəzifələrində çalışmaq istəyən şəxslər üçün müsabiqə keçirilmişdir. İşə qəbulun daha səmərəli və şəffaf həyata keçirilməsinə, ümumi təhsil müəssisələrinin yüksək səviyyəli kadrlarla təmin edilməsinə nail olmaq məqsədilə təşkil edilən müsabiqə 2 mərhələdən ibarət olub. Müsabiqədə uğur qazanmış 25 nəfər Gənclərin Çağırışaqədərki Hazırlığı rəhbəri, 23 nəfər psixoloq, 25 nəfər uşaq birliyi təşkilatı rəhbəri, 100 nəfər laborant vəzifəsi üzrə işə qəbul edilmişdir. Ümumi təhsil müəssisələrində inzibati-idarəetmə və tədris-köməkçi heyətin işə qəbulu prosesi ilə əlaqədar mövcud vakansiyalar sistemləşdirilərək yeni dərs ilinin əvvəlində növbəti müsabiqənin keçirilməsi nəzərdə tutulur.

Hesabat ilində Bakı Şəhəri üzrə Təhsil İdarəsinin həyata keçirdiyi tədbirlər içərisində müəllimlərin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi, dərs yükünün optimallaşdırılması və əməkhaqqı sistemində islahatın aparılması müstəsna yer tutur.

Bildiyiniz kimi, Dövlət Strategiyasına uyğun olaraq təhsil nazirinin 7 oktyabr 2016-cı il və 1 mart 2017-ci il tarixli əmrlərinə əsasən, 2016-cı ilin noyabr-dekabr və 2017-ci ilin aprel-may aylarında Bakı Şəhəri üzrə Təhsil İdarəsi tərəfindən paytaxtın dövlət ümumi təhsil müəssisələrində və xüsusi məktəblərdə işləyən müəllimlərin peşəkarlıq səviyyəsinin dəyərləndirilməsi və əlavə təlim ehtiyaclarının müəyyənləşdirilməsi məqsədilə diaqnostik qiymətləndirilmə keçirilmişdir. Aparılmış diaqnostik qiymətləndirilmədə ümumi təhsil müəssisələrinə işə yeni qəbul edilən, eləcə

də müxtəlif səbəblərdən əvvəlki qiymətləndirməyə qatılmayan müəllimlər də iştirak etmişdir.

Son illər aparılan əməkhaqqı islahatı nəticəsində müəllimlərin orta aylıq əməkhaqqı 471 manat olmuşdur. Müqayisə üçün qeyd edək ki, 2015-2016-cı ildə Bakı şəhəri üzrə müəllimlərin orta əməkhaqqı 465 manat təşkil etmişdir.

Hesabat ilində diaqnostik qiymətləndirməyə qatılan müəllimlərin həftəlik dərs yükü norması 1,5 dəfə artmaqla 18 saat təşkil etmişdir. Aparılan monitorinq əsasında Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki təhsil müəssisələrində çalışan müəllimlərin orta həftəlik dərs yükü hazırda 18.8 saat təşkil edir.

Ötən dərs ilində ölkə Prezidentinin sərəncamlarına əsasən, paytaxtın ümumi təhsil müəssisələrində çalışan bir sıra müəllimlər təhsilin inkişafında xüsusi xidmətlərinə görə təltif olunmuşlar. 10 müəllim “Tərəqqi” medalına, 12 müəllim “Əməkdar müəllim” fəxri adına layiq görülmüşdür.

Həmçinin, təhsilin inkişafındakı xidmətlərinə və gənc nəslin təlim-tərbiyəsi sahəsində yüksək nailiyyətlər əldə etdiklərinə görə Bakı məktəblərində çalışan 15 müəllim “Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi” döş nişanı, 17 müəllim “Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanı” ilə təltif olunmuşdur.

Yeni dərs ilinə hazırlıq

Yeni dərs ilinə hazırlıq çərçivəsində paytaxtdakı təhsil müəssisələri dərsliklərlə tam təmin olunmuşdur. Təhsil nazirinin müvafiq əmrinə əsasən, çap edilmiş yeni dərslik və müəllimlər üçün metodiki vəsaitlərin sentyabrın 8-dək yerlərə çatdırılması təmin edilmişdir. Bunun üçün müvafiq baza məntəqələri yaradılmış və əsas tədris vəsaitlərinin yerlərə çatdırılması operativ şəkildə həyata keçirilmişdir.

2017-2018-ci dərs ilinə hazırlıq çərçivəsində Bakı şəhəri üzrə bir sıra ümumi təhsil müəssisələrinin tikintisi və təmiri aparılmışdır. Paytaxtdakı 20 nömrəli məktəb-liseyin yeni binası inşa olunmuşdur, 306 nömrəli tam orta məktəb üçün isə yeni binanın tikintisi davam etdirilir. 10, 74, 162, 201, 212 nömrəli tam orta məktəblər, 62 nömrəli məktəb-lisey və 268 nömrəli xüsusi təhsil müəssisəsi əsaslı təmir edilmişdir. 171 nömrəli tam orta məktəbin qəzalı vəziyyətdə olan korpuslarında yenidənqurma işləri davam etməkdədir. 257, 67, 75 nömrəli tam orta məktəblər üçün yeni korpus tikintisi başa çatdırılmışdır. Daha 84 məktəbdə cari təmir və mühəndis kommunikasiya işləri görülmüşdür. Hazırda 10 məktəbdə təmir işləri davam etməkdədir.

Paytaxtdakı 10, 20, 62, 74, 162, 201, 212, 239, 257 nömrəli tam orta məktəblərin və 268 nömrəli xüsusi təhsil müəssisəsinin təntənəli açılış mərasimləri keçirilmiş, açılış mərasimlərində ölkə Prezidenti cənab İlham Əliyev iştirak etmişdir. Bu il “Təhsildə keyfiyyət ili” olmaqla hər birimizin qarşısında yeni öhdəliklər qoyur. Yeni il hər kəsi yeni çağırışlara hazır olmağa və bu yolda əzmlə çalışıb zəfər qazanmağa səsləyir. Bu dərs ilinin ötən ildən daha uğurlu olması, bizə göstərilən etimadı doğrultmaq üçün hər birimiz keyfiyyətlə çalışacağıq. Elə isə yeni dərs ilinin başlanması münasibətilə hər birinizi ürəkdən təbrik edir, hamınıza çətin, məsuliyyətli və şərəfli yolda uğurlar diləyirəm.

*Elm xadimlərimiz*



# ZİYALI FƏDAKARLIĞINA NÜMUNƏ

**İsa Həbibbəyli,**
***Azərbaycan Milli Elmlər Akademiyasının vitse-prezidenti, Milli Məclisin Elm və Təhsil Komitəsinin sədri, akademik***

Azərbaycan elmi-ədəbi və ictimai fikrinin inkişafında görkəmli yeri olan filologiya elmləri doktoru, professor Qəzənfər Paşayevin çoxillik və çoxcəhətli fəaliyyətini səciyyələndirən əsas prinsiplər yüksək vətəndaşlıq mövqeyi ilə universal düşüncənin və professionallığın vəhdətindən ibarətdir.

Bu çox zəhmətkeş alim, eyni zamanda fərqli bir vətəndaşlıq mövqeyi nümayiş etdirir. Professor Qəzənfər Paşayevin pafosdan uzaq olan vətəndaşlıq anlayışının sərhədləri, üfüqləri olduqca genişdir. Böyük mənada Azərbaycanı tam əhatə edən bu vətəndaşlıq duyğusu onun Kərkük dolaylarındakı fəaliyyətinin, dünya ədəbiyyatının ölkəmizdə tanıdılması ilə əlaqədar zəhmətlərini, ədəbiyyatşünaslıq, dilçilik, folklorşünaslıq istiqamətlərindəki fəaliyyətlərinin də mayasını, cövhərini təşkil edir.

O, müraciət etdiyi problemlərə, ədəbi-tarixi şəxsiyyətlərə epoxanın gözü ilə baxmağı bacaran, qələmə aldığı məsələləri yüksək vətəndaşlıq səviyyəsində təqdim etmək vəzifəsini məsuliyyətlə, ləyaqətlə həyata keçirməyin öhdəsindən gələ bilən əsl elm adamıdır. Yazdığı sanballı elmi əsərlərin bir çoxu elmdəki mühüm əhəmiyyəti ilə yanaşı, həm də böyük vətəndaşlıq borcunun ifadəsidir. Qəzənfər Paşayevin Azərbaycan aşıq sənətinə, İraq-türkman ədəbiyyatına, Kərkük ləhcəsinə həsr olunmuş əsərləri elmdə böyük mənəvi borcu necə yüksək səviyyədə, hansı ürəklə, təmannasız niyyətlə ciddi şəkildə və məsuliyyətlə yerinə yetirməyin mükəmməl örnəkləridir. Qəzənfər müəllimin Azərbaycanla yanaşı, Kərkük dolaylarından Hələbə, Təbrizə, Ərzuruma, Dərbəndə... qədər uzanan böyük coğrafiyanın ədəbiyyatına, folkloruna və tarixinə, ləhcəsinə dair qiymətli əsərləri onun elmi-ədəbi düşüncəsinin universallığına, genişliyinə və bütövlüyünə də nümunədir. Qəzənfər Paşayevin böyük mənada vətəndaşlığın və universal düşüncəsinin kamil ifadəsi olan əsərləri seçilmiş mövzuya dərin, əsaslandırılmış professional elmi münasibətin də real göstəricilərindəndir. Azərbaycan oxucusuna təqdim edilmiş yeddicildlik “Seçilmiş əsərləri” Qəzənfər Paşayevin 75 illik ömür yolunun, zəngin həyat təcrübəsinin, müdriklik və kamilliyinin, zəhmətkeşlik və fədakarlığının nümunəsi kimi meydana çıxmışdır. Bu, Azərbaycan ədəbiyyatşünaslıq elmində yaranan ilk yeddicildlik kimi də mühüm əhəmiyyətə malikdir. Heç şübhəsiz, universal düşüncəyə, coxcəhətli yaradıcılıq fəaliyyətinə malik olan Qəzənfər Paşayevin yarım əsrlik fəaliyyətində İraq-türkman mühiti, Kərkük dünyası ilə bağlı sanballı tədqiqatlar aparıcılıq təşkil edir. Haqlı olaraq onu “Kərkük sevdalı ədəbiyyatşünas”, “Kərkükün mənəvi səfiri” kimi dəyərləndirirlər.

Tərcümeyi-halının cəmisi 6 ili İraq-türkman elləri ilə bağlı olan Qəzənfər

Paşayev artıq yarım əsrdən çoxdur ki, Kərkük mövzusunda eyni sevda ilə yazıb-yaratmaqda davam etməkdədir. Fikrimcə, Qəzənfər Paşayev Azərbaycan kərkükşünaslıq elminin qüdrətli yaradıcısıdır. Qəzənfər Paşayevin digər mövzularda yazılmış əsərlərinin əhəmiyyətini heç aşağı salmadan bütün yazdıqlarını tərəzinin bir gözünə qoysaq, yenə də Kərkük tədqiqatları ağır gələr. Yarım əsrə yaxındır ki, İraq-türkman ədəbiyyatı, Dəclə-Fərat sahilləri, Kərkük-ədəbi mühiti, folkloru, ləhcəsi deyiləndə, ilk növbədə Qəzənfər müəllim göz önünə gəlir. Böyük bir qismi keçmiş sovet rejiminin sərt ideoloji qadağaları dövründə yaranmış bu sanballı əsərlər bu gün də öz aktuallığını və elmi səviyyəsini saxlayan Azərbaycan ədəbiyyatşünaslığının çox sanballı Kərkük cildlərindən ibarətdir. Qəzənfər Paşayev İraq-türkman ədəbiyyatının Azərbaycandakı səlahiyyətli səfiridir. Hesab edirəm ki, Azərbaycan kərkükşünaslığının görkəmli yaradıcısı olan Qəzənfər Paşayev, ümumiyyətlə, kərkükşünaslıqda söz sahibi olan alimdir. Nəinki Azərbaycanda, yaxud da dünyanın başqa bir yerində, hətta Kərkükdə belə, kərkükşünaslıqda Qəzənfər Paşayevlə müqayisə edilə biləcək tədqiqatçı göstərmək çətindir.

Vaxtilə İraq-türkman ədəbiyyatının və elmi-ictimai fikrinin görkəmli nümayəndəsi Əbdüllətif Bəndəroğlu da etiraf etmişdi ki, “Qəzənfər Paşayevin “İraq-türkman folkloru” kitabına bənzər bir kitab indiyə qədər nə İraq türkmanları tərəfindən, nə də İraq türkmanlarının folkloru ilə məşğul olan xarici alim və tədqiqatçılar tərəfindən yazılmışdır”. Digər sahələri, fərqli coğrafiyaları əhatə edən və ya Azərbaycan ədəbiyyatına həsr olunmuş sanballı elmi əsərlərini yüksək qiymətləndirməklə bərabər, eyni zamanda, etiraf edilməlidir ki, professor Qəzənfər Paşayev Kərkük ağırlıqlı görkəmli Azərbaycan ədəbiyyatşünasıdır. O, Kərkük ağırlıqlı Azərbaycan ədəbiyyatşünaslığının fədakar müəllifidir. “Əsərləri”nin yeddicildliyinə “Azərbaycan kərkükşünaslığının banisi” adlı sanballı bir ön söz yazmış akademik Tofiq Hacıyevin dəqiq ifadə etdiyi kimi, Qəzənfər Paşayevin ardıcıl və



mükəmməl tədqiqatları ilə “kərkükşünaslıq elm sahəsinin yaranması” hadisəsi baş vermiş, kərkükşünaslıq “öz zilinə” çatmışdır.

Fikrimcə, Azərbaycan kərkükşünaslığının yaradılması bütövlükdə elm tariximizin əhəmiyyətli hadisələrindəndir. Ayrı-ayrı vaxtlarda Kərkük mövzusunda yazılmış əsərlərini ilk dəfə olaraq toplu şəkildə bir yerdə əks etdirən yeddicildlikdəki tədqiqatlar ədəbiyyatşünaslıq elmimizin kərküknaməsi kimi dərin mənaya malikdir. Kərkük sözünün etimologiyasından tutmuş Kərkük ellərində yaşayan türkmanların mənşəyinə, tarixinə, soykökünə, dil-ləhcə xüsusiyyətlərinə, milli mənsubiyyətinə, əlaqələrinə, folkloruna, etnoqrafiyasına və yazılı ədəbiyyatlarına, coğrafiyasına qədər hər nə varsa, hamısı haqqında Qəzənfər müəllimin

əsərlərində dəqiq, elmi cəhətdən əsaslandırılmış və zəngin biliklər öz əksini tapmışdır. Bu qiymətli əsərlər möhtəşəm bir kərkükşünaslıq ensiklopediyasının elmi-məlumat bazasını təşkil edə bilər. Qəzənfər Paşayev həmin zəngin ədəbi-tarixi məlumatların, folklor nümunələrinin, etnoqrafik məlumatların bir çoxunu özü toplayıb, ilk dəfə elmi dövriyyəyə gətirmiş, həm də nəzəri cəhətdən dəyərləndirib qiymətləndirmişdir. O, Azərbaycan kərkükşünaslığının Fərhadıdır. Əksər məqamlarda Qəzənfər Paşayev bir neçə toplayıcının, mətnşünasın və tədqiqatçının işini təkbaşına görmüşdür. Yeddicildlik "Seçilmiş əsərlər"də xüsusi yer tutan "İraq-türkman folkloru" monoqrafik tədqiqatı "ölümsüz bir tarixə" sahib olan yarım milyondan çox əhalisi olan Kərkük elatının milli ruhunun ifadəsi kimi yaranmış folklorun toplanılması və tədqiqinə həsr olunmuş "şah əsərdir" (Bəndəroğlu). Müəllif İraq-türkman folklorunu "Azərbaycan folklorunun qüdrətli qolu" kimi görsə də, bu coğrafiyada formalaşmış şifahi xalq ədəbiyyatı nümunələrinin özünəməxsusluqlarını da müəyyən etmiş və təhlil edib dəyərləndirərək ümumiləşdirmişdir. "İraq-türkman folkloru" monoqrafiyası İraq coğrafiyasındakı türkman folklorunun elmi cəhətdən ümumiləşdirilmiş salnaməsidir.

Mövzu etibarilə bu əsəri daha da zənginləşdirən və tamamlayan "Kərkük folklorunun janrları" monoqrafiyası ilə birlikdə hər iki əsər Azərbaycan kərkükşünaslığının elmi abidəsidir. Xalq şairi Rəsul Rzanın 1959-cu ildə Kərkükə səfərindən sonra ədəbi-ictimai fikrə ayaq açan Kərkük folkloru mövzusu Qəzənfər Paşayevin geniş həcmli, sistemli tədqiqatları sayəsində məxsusi bir elmi istiqamətə çevrilmişdir. XX əsrin yetmiş-səksəninci illərindən etibarən İraq-türkman ədəbiyyatı nümunələrini ayrı-ayrı janrlar üzrə toplayaraq kitablar halında ardıcıl olaraq nəşr etdirən Qəzənfər Paşayev Azərbaycan folklorşünasları üçün zəngin bir müqayisə və araşdırma bazası yaratmağa müvəffəq olmuşdur. Bu zəmində meydana çıxan tarixi-filoloji tədqiqatların əsasında Qəzənfər müəllimin zəngin toplama materialları və tədqiqatları dayanır.

Qəzənfər Paşayev kərkükşünaslığının bünövrəsi olan "Kərkük dialektinin fonetikası" monoqrafiyasından başlanan yolu ildən-ilə genişlənərək kərkükşünaslığın təməlinə çevrilən elmi əsərlərlə daha da möhkəmləndirmişdir. Bizə görə, "İraq-türkman folkloru" və "Kərkük folklorunun janrları" monoqrafiyaları ilə birlikdə "Kərkük dialektinin fonetikası" kitabları geniş mənada İraq-türkman dünyasının qiymətli trilogiyasıdır. Əhatəli və sistemli araşdırmalarla yanaşı, həm də böyük bir sevgi ilə yazılmış "Kərkük dialektinin fonetikası" monoqrafiyası özünün dərin qatları etibarilə orijinal bir "Kərkük dialektinin poetikası" təsiri bağışlayır. Tədqiqatçı İraq türkmanları dialektinin fonetik xüsusiyyətlərini öyrənmək əsasında bu zəngin şivədə poetik semantikanın özünəməxsusluqları haqqında da aydın elmi təsəvvürün formalaşmasına zəmin hazırlamışdır. Yeddicildlik "Seçilmiş əsərlər"dəki "Könüldən-könülə yollar görünür", "Kərkük dünyası" bölməsində toplanan tədqiqatlar İraq-türkman ədəbiyyatının müxtəlif dövrlərinə, ayrı-ayrı ədəbi şəxsiyyətlərinə, Kərkük türkmanlarının şifahi və yazılı ədəbiyyatının aktual məsələlərinə həsr olunmuşdur. Xüsusən, tədqiqatlarındakı "İraq-türkman ədəbiyyatının altun çağı", yaxud "Füzuli çağı" haqqındakı elmi araşdırmalar ümumtürk ədəbiyyatının həmin mərhələsinə dair təsəvvürlərin daha da dərinləşdirilməsinə xidmət edir. "Füzulinin məzarı haqqında şayiə və həqiqət" məqaləsindən dahi şairin tərcümeyi-halının bir çox səhifələrini öyrənmək mümkün olur.

Görkəmli alim Nəsrəddin Tusinin tərcümeyi-halının İraq səhifələrinə də Qəzənfər Paşayevin araşdırmaları işıq salır.

Bundan başqa, İraq-Azərbaycan ədəbi əlaqələrinin tarixi və inkişaf yolu məsələsi də elmimizə bu bölmədəki məqalələr vasitəsilə Qəzənfər Paşayev tərəfindən gətirilmişdir. Nəticə etibarilə Qəzənfər Paşayev tarixi, adət-ənənələri, folkloru, görkəmli elmi-ədəbi şəxsiyyətləri ilə bütövlükdə İraqın Azərbaycana iraq olmadığını, yaxın, doğma, dost ölkə olduğunu elmi cəhətdən əsaslandırır. Qəzənfər Paşayev özü də yarım əsrdən çoxdur ki, Azərbaycan-İraq əlaqələrinin möhkəmlənib inkişaf etməsinə şərəflə və məsuliyyətlə xidmət edir. Onun Bakıda yaratdığı “İraq-türkman kitabxanası” bu qədim Şərq ölkəsinin Azərbaycanda öyrənilməsinə, təbliğinə, əlaqələrin inkişaf etdirilməsinə geniş imkan yaradır. Ələlxüsus, Qəzənfər Paşayev-Əbdüllətif Bəndəroğlu dostluğu Azərbaycan-İraq əlaqələri tarixində böyük körpü olmuşdur. Qəzənfər müəllimin sözləri ilə desək, “xalqının, ədəbiyyatının, mədəniyyətinin layiqincə öyrənilməsi, araşdırılması və yayılması yolunda alışmaq istedadına” malik olan rəhmətlik Əbdüllətif Bəndəroğludan bəhs edən “Qan və qələm qardaşımız” və “Heyf sənə, Bəndəroğlu” məqalələri xeyli vaxt bundan əvvəl yazılmasına baxmayaraq, indi də İraq-türkman ictimai-ədəbi fikrinin görkəmli nümayəndəsi olan bu fədakar şəxsiyyətdən söz açan mənalı və təsirli epitafiya təsiri doğurur. İraq-türkmən folklorunun görkəmli tədqiqatçısı Əta Tərzibaşını yarım əsr bundan qabaq ilk dəfə Azərbaycan ictimaiyyətinə təqdim edən professor Qəzənfər Paşayev 2017-ci ildə bu böyük folklorşünasa həsr etdiyi monoqrafiya ilə bütün zamanlarda Kərkük sevdasına sədaqətli olduğunu bir daha nümayiş etdirir.

Qəzənfər Paşayev-Abbas Zamanov-Ayaz Vəfalı-Əbdüllətif Bəndəroğlu dostluğu və əməkdaşlığı Azərbaycan-İraq ədəbi əlaqələrinin tarixində xüsusi mərhələ təşkil edir. Çətin şəraitdə “İraqda yaşayan vətəndaşlarımızla sıx əlaqə saxlayan” böyük vətəndaş alim, professor Abbas Zamanovun da, görkəmli şərqşünas Vasim Məmmədəliyevin də bu istiqamətdəki xidmətlərini nəzərə alsaq, həmin mərhələnin mühüm bir tarixi dövr səviyyəsinə çatdığını düşünməyə əsas verər. Qəzənfər Paşayevin çoxcildliyinin şah damarını təşkil edən Kərkük-türkman ədəbiyyatına və İraq-Azərbaycan əlaqələrinə həsr olunmuş cild-cild kitablar ölkələrarası əlaqələrin, xalqlararası daxili-mənəvi bağlılığın və münasibətlərin həmin tarixi dövrdəki tam mənzərəsini elmi surətdə canlandırır. “Altı il Dəclə-Fərat sahillərində” əsəri professor Qəzənfər Paşayevin tərcümeyi-halının və çoxcəhətli fəaliyyətinin əfsanəsidir. Bu, Bağdad cəmiyyətinin, İraqdakı türkman elatının Qəzənfər Paşayev tərəfindən yaradılmış dastanıdır. XX əsrin səksəninci illərinin əvvəllərində yazılmış “Altı il Dəclə-Fərat sahillərində” kitabı İraq haqqında mükəmməl bir publisist-bələdçi kitabdır. Bütövlükdə Azərbaycan cəmiyyəti Bağdad-İraq elləri ilə bu əsər vasitəsilə yaxından tanış olmaq imkanı qazanmışdır. Ölkəmizdə böyük əks-səda doğurmuş həmin əsər vaxtilə əldən-ələ gəzmiş, öz müəllifinin cəmiyyətə sanballı təqdimatına çevrilmişdir. Məhz bu əsərlə Qəzənfər Paşayevin Azərbaycan miqyasında ədəbi-ictimai mühitdə özünəməxsus imkanlara malik yazıçı-tədqiqatçı və fərqli bir publisist olması birdəfəlik isbat olunmuşdur.

“Altı il Dəclə-Fərat sahillərində” əsəri, əslində, Qəzənfər Paşayevin dərin mənalı və cəlbedici İraq-türkman dastanının proloqu kimi meydana çıxmışdır. Lakin illər keçdikcə bu möhtəşəm əsər yeddicildlikdə Qəzənfər Paşayevin Kərkük sevdasının epopeyası kimi görünür. Sanki müəllifin

İraq-türkman mövzusuna həsr olunmuş digər sanballı əsərləri "Altı il Dəclə-Fərat sahillərində" kitabından doğulmuşdur. İraq ellərini geniş miqyasda əhatə etmək, cəmiyyət həyatının bütün əsas sahələrinə işıq salmaq baxımından bu kitab geniş ümumiləşdirmə imkanlarına malik olan ədəbi-ensiklopedik əsər təəssüratı yaradır. Tam halda "Altı il Dəclə-Fərat sahillərində" əsəri professor Qəzənfər Paşayevin İraq-türkman serialının ümumiləşdirilmiş adı kimi də görünür. Məhz bu əsər Qəzənfər Paşayevin İraq-türkman mövzusunda yazılmış əsərlərini öz mahiyyətində cəmləşdirərək epopeyaya çevirir. Bütövlükdə Kərkük dünyası Qəzənfər Paşayevin elmi araşdırmalarının baş mövzusudur. Fikrimizcə, Qəzənfər müəllimin Azərbaycan folkloruna, aşıq sənətinə yaxınlıq və doğmalığının da əsasında doğulub boya-başa çatdığı Qazax-Tovuz mühiti ilə eyni səviyyədə, həm də Kərkük sevdası dayanır. Alimin "Sazlı-sözlü dünyamızdan" başlığı altında təqdim olunmuş folklorşünaslıq nümunələri sanki Kərkük dolaylarına həsr olunmuş tədqiqatların davamıdır. Azərbaycan folkloruna həsr olunmuş əsərlərində, daha çox aşıq şeirindən, xüsusən sağlığında klassikləşən ustad aşıq-şair Mikayıl Azaflıdan, "aşıq sənətinin memarlarından biri" kimi dəyər verdiyi Dədə Şəmşirdən, Aydın Çobanoğludan bəhs edən tədqiqatlarında, o, geniş dünyagörüşlü müdrik bir folklorşünas olaraq ustad alim sözü deyə bilir. Aşıq şerinin poetikasını şərh edən əsərlərində Qəzənfər Paşayev folklorda sənətkarlıq məsələlərini nəzəri cəhətdən açıqlayan professional, təcrübəli bir folklorşünas sözünü elmi mühitə təqdim edir. Bu gün Qəzənfər Paşayev Azərbaycan folklorşünaslarının ön cərgəsində "A" qrupunda təmsil olunur. Qəzənfər Paşayevin Azərbaycan klassik ədəbiyyatına dair tədqiqatlarında da Kərkük motivi görünməkdədir. Ədəbiyyatşünaslıq elmimizdə ilk dəfə olaraq "Nəsimi divanının İraq nüsxəsi"ni o aşkara çıxarıb nəşr etdirmiş və tədqiq edib öyrənmişdir. İmadəddin Nəsimiyə həsr olunmuş araşdırmalarında Nəsimi-İraq notları üstünlük təşkil edir. Klassik Azərbaycan və Kərkük ədəbiyyatına dair əsərlərində Qəzənfər müəllim mövzunu dərindən öyrənməsi, materiala yaxından bələdliyi, səviyyəli şəkildə təqdim etməsi ilə yadda qalır.

Müasir Azərbaycan ədəbiyyatının tədqiqi məsələlərinə həsr olunmuş əsərlər də professor Qəzənfər Paşayevin tədqiqatlarında geniş yer tutur. Xalq yazıçısı Elçin haqqındakı araşdırmaları sistemli monoqrafik elmi əsərdir. O, görkəmli yazıçı və ədəbiyyatşünas Elçin haqqında müasir ədəbiyyatşünaslığın yüksək tələbləri səviyyəsində sanballı elmi söz demişdir. Elçindən bəhs edən məqamlarda da müəllif Kərkük motivinin mövzuya dair məqamlarına diqqət yetirir. Baş nazirin müavini Elçin Əfəndiyevin rəhbərliyi ilə İraqda Füzuli günlərinin keçirilməsi hadisəsinə, xalq yazıçısının əsərlərinin İraq nəşrlərinə də diqqət yetirən Qəzənfər Paşayev bütövlükdə müasir Azərbaycan ədəbiyyatının əsas yaradıcılarından biri olan bu sənətkarın yaradıcılıq özünəməxsusluğunu müəyyən edən ana xətləri seçib ayırmışdır. Xalq şairləri Səməd Vurğuna, Rəsul Rzaya, Bəxtiyar Vahabzadəyə, Hüseyn Arifə, Nigar Rəfibəyliyə, Fikrət Qocaya, Hüseyn Kürdoğluya, Zəlimxan Yaquba, nəsr ustadları Fərman Kərimzadəyə, İsi Məlikzadəyə, yazıçı Qərib Mehdiyə və başqalarına aid məqalələr çağdaş ədəbiyyatımızın inkişaf yollarına, təkamül proseslərinə gur işıq salır.

Akademik Bəkir Nəbiyevdən söz açan "Ədəbiyyatşünaslıq elminin patriarxı" monoqrafiyası müasir ədəbiyyatşünaslıqda yaşanan proseslərlə yaradıcı şəxsiyyətin

münasibətinin əlaqəsi, tarazlığı, elmi nəticələri kimi məsələlərin fonunda açılır. Böyük vətəndaş-alim, professor Abbas Zamanova, "ədəbiyyatşünaslıq elmimizin iftixarı" Yaşar Qarayevə, professor Yavuz Axundluya, İmamverdi Əbilova və başqalarının fəaliyyətinə qiymət verərkən Qəzənfər Paşayev elmə xidmətin miqyasını doğru-düzgün müəyyən edir, obyektivlik meyarını qoruyur və ən başlıcası, mənəvi borc duyğusunu məsuliyyətlə yerinə yetirir.

Türkologiyanın ağsaqqalı kimi qiymət verdiyi akademik Məmmədağa Şirəliyev, "dilçilik elminin iftixarı" hesab etdiyi akademik Ağamusa Axundov haqqındakı məqalələrində də Qəzənfər Paşayev dilçilik elminin daxili məntiqindən çıxış edərək qüdrətli dilçi alimlərin bu elm sahəsinin inkişafı sahəsindəki xidmətlərinin əsl mahiyyətini açıb obyektiv meyarlarla dəyərləndirir. Bir sözlə, ədəbiyyatşünaslıq və dilçilik məsələlərindən söz açarkən də Qəzənfər Paşayev elm haqqında elm yaratmaq bacarığını meydana qoyur. Müasir ədəbiyyata dair digər tədqiqatlarında olduğu kimi, ədəbiyyatşünaslara ünvanlanmış əsərlərində də Qəzənfər Paşayev memuar cizgilərini təhlilləri və tədqiqatları ilə vəhdətdə təqdim edir. Bu yolla yazıçıların və ədəbiyyatşünasların ədəbi-elmi xidmətləri deyil, tərcümeyi-hallarının maraqlı məqamları, şəxsiyyətləri, mənəvi dünyası da təqdim olunur. Bütün bunlar isə yazıçını və ya alimi mühiti və müasirləri, mənəvi aləmi, münasibətləri ilə birlikdə tam halda oxuculara çatdırmağa şərait yaradır. Bu tip tədqiqatlarında Qəzənfər Paşayev sənətkar və zaman münasibətlərinə də aydınlıq gətirir.

Ümumiyyətlə, İraq-türkman ədəbiyyatı, Kərkük mövzusu professor Qəzənfər Paşayevin çoxcəhətli fəaliyyətinin ekvatorudur. Görkəmli alimin yaradıcılığında bu ekvatorun Şərq və Qərb qütbləri mövcuddur. Müşahidələr göstərir ki, professor Qəzənfər Paşayev uzun illər ərzində ardıcıl fəaliyyəti ilə Azərbaycan ədəbiyyatşünaslığının Şərq-Qərb divanını yaratmağa nail olmuşdur. İraq-türkman ədəbiyyatına həsr olunmuş elmi əsərləri Qəzənfər Paşayevin yaradıcılığının Şərq divanıdır. Bizə görə, Avropa ədəbi-elmi fikrinə, rus ədəbiyyatına həsr olunmuş elmi əsərləri, tərcümələri alimin Qərb divanından ibarətdir. Azərbaycan oxucusuna təqdim olunmuş fransız yazıçısı Aleksandr Dümanın "Qafqaz səfəri", amerikalı alim Sula Benetin "Necə yaşayasan-yüzü haqlayasan", ingilis ədibi Aqata Kristinin "Mavi qatarın sirri" romanının orijinaldan tərcümələri Qərb divanının ayrı-ayrı fəsillərindən ibarətdir. Böyük münəccim Nostradamusun irsindən alınmış "Dərk olunmuş aləm" əsəri də Qərbi daha geniş şəkildə, bütün yönləri ilə təqdim etməyə imkan verir.

Müqayisədə Qəzənfər Paşayevin Şərq divanı ağır gəlsə də, onun Qərb ədəbi-elmi və ictimai fikrinin tədqiqi və təqdimi sahəsindəki xidmətləri də sanballıdır. Qəzənfər Paşayevin "Şərq divanı" elmi salnamə, "Qərb divanı" isə daha çox təzkirə xarakteri daşıyır. Ümumilikdə, "Şərq-Qərb divanı" həm də ədəbi-mədəni əlaqələrin tarixinin öyrənilməsi baxımından da qiymətlidir. Qəzənfər Paşayev külliyyatını "Seçilmiş əsərlər" adı ilə təqdim etsə də, bu yeddicildlikdə müəllifin əsərlərinin, tərcümələrinin, demək olar ki, hamısı toplanılmışdır. Bundan başqa, müəllif müasirlərinə göndərdiyi məktubları, teleqramları, dissertasiyalara, avtoreferatlara yazdığı rəyləri, resenziyaları, müxtəlif münasibətlə etdiyi çıxışları, hətta mühüm telefon zənglərini də yığıb-yığışdırıb çoxcildliyinə daxil etmişdir. Bütün bunlar bir çox cəhətdən əhəmiyyətlidir. Əvvəla, yeddicildlik professor Qəzənfər Paşayevin özü və irsi haqqında tam təsəvvür yaradır.

Oxucu alimin yalnız elmi fəaliyyəti ilə tanış olmaqla qalmır, onun cəmiyyət həyatındakı, ədəbi-elmi mühitdəki iştirakı barəsində də tam təəssürat əldə edə bilir. Bundan başqa, elmi-ədəbi irsini, əlyazmalarını, hətta çıxışlarının mətnlərini bu qədər səliqə-sahmanla yığıb saxlamaq, sistemləşdirib nəşr etdirmək xüsusi bir qabiliyyətdir. Ədəbiyyatımızın və elmimizin tarixində irsini bu cür məxsusi dəqiqliklə tam halda qoruyub mühafizə edən, gələcək nəsillərə çatdırmaq üçün hazırlayan yalnız bir neçə ədibimizin adını çəkmək olar. Yusif Vəzir Çəmənzəminli, Əziz Şərif, Abbas Zamanov, Qulam Məmmədli və nəhayət, Qəzənfər Paşayev. Bu mənada Qəzənfər Paşayevin çoxcildliyi "Seçilmiş əsərləri" yox, əhatə dairəsinə görə "Əsərləri" formatında görünür. Və irsini bu qədər həssaslıqla, dəqiqliklə, səliqə ilə, əhatə dairəsinin bütün genişliyi ilə ictimaiyyətə çatdırmaq özü də ziyalı kimi mühüm və böyük bir xidmətdir. Qəzənfər Paşayev çoxcəhətli yaradıcılığının elmi nəticələri olan sanballı əsərləri ilə bir sırada irsini epistolyar nümunələrinə və çıxışlarına qədər tam şəkildə ictimaiyyətə təqdim etməklə müasir ziyalılıq üçün nümunə göstərir.

Professor Qəzənfər Paşayevin söz-sənət dünyasını və müasirləri ilə əlaqələrinin böyük miqyasını əks etdirən "Ədəbi məktublar" kitabı ilə uzun bir dövr ərzində yazdığı məktublarında külliyyatını oxuculara çatdırmaqla daha bir ziyalılıq nümunəsi təqdim edir. Respublikamızın elmi-ictimai mühitində professor Qəzənfər Paşayev yaxından iştirak edir. Ölkəmizin elmi ictimaiyyəti Qəzənfər müəllimin cəmiyyət və ədəbiyyat haqqındakı baxışlarını əsl ağsaqqal sözü kimi qəbul edir. O, Respublika Ağsaqqallar Şurasının İdarə Heyətinin, Qafqaz Müsəlmanları İdarəsinin Elmi-Dini Şurasının üzvü, Azərbaycan Yazıçılar Birliyi Təftiş Komissiyasının sədri kimi geniş və səmərəli fəaliyyət nümunəsi göstərir. İllərdən bəri çalışdığı Azərbaycan Milli Elmlər Akademiyası Nizami adına Ədəbiyyat İnstitutunda da professor Qəzənfər Paşayev elmi mühitin inkişafına ürəklə xidmət edir. Ədəbiyyat İnstitutunun Elmi Şurasında və Dissertasiya Şurasında Qəzənfər Paşayevin rəyi, qiyməti, münasibəti mötəbər söz kimi qəbul olunur. Azərbaycan ədəbiyyatşünaslıq elmi professor Qəzənfər Paşayevə özünün görkəmli yaradıcısı və böyük ağsaqqalı kimi dərin hörmət və ehtiram bəsləyir.

Professor Qəzənfər Paşayevin elmi əsərləri böyük ömrün, yaşanan taleyin, ciddi və ardıcıl axtarışların, fasiləsiz, davamlı həyat və yaradıcılıq eşqinin sanballı ifadəsidir. Səksən illik yubileyi ərəfəsində oxuculara təqdim olunan "Ədəbi estafetlərdə keçən ömür" kitabı professor Yavuz Axundlunun elmi xidmətlərinə dair dərin səmimiyyətlə yazdığı aşağıdakı mülahizələrini ürəkdən gələn eyni böyük səmimiyyətlə və ciddiyyətlə görkəmli ağsaqqal həmkarının özünə aid etməklə fikrimi tamamlamaq istəyirəm: "Bu yorulmaz alimin elmi fəaliyyəti heyrətamizdir. Təkcə XXI əsrin əvvəlindən bu günə kimi yazılmış və çap olunmuş əsərlərinə nəzər salmaq kifayətdir ki, sözlərimdəki səmimiyyət anlaşılsın... Bu əsərlərdə ədəbiyyatımızı, ədəbiyyatşünaslıq elmimizi yaradanlara, qələm sahiblərinə dərin məhəbbət qırmızı xətt kimi keçir. Bu yaşda belə tədqiqat aparmaq, uğur qazanmaq əsl fədakarlıqdır - desəm, yanılmaram. Görkəmli ədəbiyyatşünasımız bu gərəkli fəaliyyəti ilə nəinki gənclərə, eləcə də yaşlı ədəbiyyatşünaslar nəslinə də bir nümunədir".

Fikrimcə, daha heç bir əlavəyə ehtiyac yoxdur.

Görkəmli Azərbaycan ziyalısı, ədəbiyyatşünaslıq elminin ağsaqqalı, professor Qəzənfər Paşayevə elmimizin və ictimai fikrimizin inkişafı yollarında yeni-yeni uğurlar arzulayıram.



# AZƏRBAYCANDA TƏHSİL VƏ PEDAQOGİKA ELMİNİN CƏFAKEŞ ALİMİ

**Hümeyir Əhmədov,**
*pedaqoji elmlər doktoru, professor,*
*Rusiya Təhsil Akademiyasının akademiki*

Azərbaycanda məktəb quruculuğu ənənələrinin, təhsil, təlim, tərbiyə haqqında anlayışların, ideyaların tarixi qədim olsa da bu anlayışların kateqorial sisteminin, pedaqoji nəzəriyyələrin və praktik fəaliyyət sahəsinin elm olaraq formalaşmasının yaşı çox deyil. Lakin pedaqoji təcrübə və ideyaların yaranmasının tarixi quldarlıq dövründən başlayır. Digər bir cəhət də bu ideyaların fəlsəfənin tərkibində olması ilə bağlıdır.

Hələ orta əsrlərdə Əl-Kindi, Əl-Fərabi, İbn-Sina, İbn-Rüşdü, Bəhmanyar Əl-Azərbaycani, Şihabəddin Sührəvərdi, Siracəddin Urməvi və digər mütəfəkkirlərin fəlsəfi əsərlərində təhsil, təlim, tərbiyə haqqında qiymətli fikirlər olmuşdur. Onlar tədris fəaliyyəti də göstərmişlər. Ensiklopedik biliklər sahibi Nəsirəddin Tusinin elmi irsində sırf pedaqoji xarakterli əsərlərin olması diqqəti çəkir. Onun “Adabul – mütəəllim” əsəri bilavasitə tələbənin biliklərə yiyələnmə fəaliyyətindən bəhs edir. “Əxlaqi Nasiri” kitabında isə uşağın dünyaya gəlməsindən başlayaraq tərbiyə olunmasından, davranışlarından bəhs olunur. Nəsirəddin Tusi tərbiyəşünaslıq fənninin bilik sahəsi olaraq tədrisə daxil olmasını təklif etmişdir. Uzun əsrlər boyu Şərqdə, o cümlədən Azərbaycanda tərbiyə anlayışı geniş məna kəsb etmiş, təlim, tədris, inkişaf prosesinin məzmununu da tərbiyə anlayışında ehtiva etmişdir. O zamanlar yaranan didaktik bədii və fəlsəfi əsərlər də insanın tərbiyələnməsinə, yəni təcrübi biliklərə yiyələnərək formalaşmasına xidmət göstərmişdir.

Şərqdə, o cümlədən Azərbaycanda orta əsrlərin kamil insan konsepsiyası (N.Gəncəvi, İ.Nəsimi və d.) bəşər övladının, ilk növbədə Yaradan, həyat, təbiət, cəmiyyət, sosial-mənəvi və intellektual inkişaf düşüncələrini önə çəkmiş, genetik-təbii imkanlar, mühit və tərbiyə (təhsil) vasitəsi ilə formalaşma yolunu göstərmişdir. XVI – XVII əsrlərdən Qərbdə Yan Amos Komenski “Böyük didaktika” və digər əsərləri ilə sırf təlim və təhsil nəzəriyyəsi – didaktika yaratmışdır. Və tədricən bu sahə gələcək pedaqogika elminin ilk elmi sahəsi olaraq meydana çıxmışdır. Şərqdə, o cümlədən Azərbaycanda ilk pedaqoji elm sahəsi olan tərbiyəşünaslıq Qərbə, didaktika isə Şərqə ötürülərək dünyada pedaqogika elminin nəzəri əsaslarını meydana qoymuşdur. Praktik fəlsəfə kimi özünü göstərən pedaqoji prosesin yalnız məktəb təhsili sahəsində deyil, cəmiyyət həyatında, idarəetmədə,

kadr hazırlığında və digər mənəvi-sosial sahələrdə əhəmiyyətli rol oynaması, elmin, texnikanın inkişafı, iqtisadi münasibətlərin yeni inkişaf mərhələlərini tələb etməsi insan və cəmiyyət amillərini daha da aktuallaşdırmış, bu prosesdə praktik pedaqoji fəaliyyətin dairəsi genişlənmiş, məzmun yenilikləri meydana çıxmış, sırf təlim, tədris, tərbiyə məsələləri bütün inkişaf etmiş ölkələrdə müzakirə mövzusuna çevrilmiş, praktik fəaliyyət istiqaməti kimi vacib şərt sayılmışdır. Beləliklə, XIX əsrin ortalarından Avropada, XX əsrin əvvəllərindən isə Azərbaycanda Pedaqogika elm sahəsi kimi yaranmışdır. Yenə də tərbiyə anlayışı aparıcı olmuş, XXI əsrdən isə təhsil anlayışı önə keçmişdir.

Orta əsrlərdən başlayaraq Şərq fəlsəfəsini, ərəb dilli elmi ədəbiyyatı, "Quranı" öyrənən Avropa alimləri artıq XIX əsrdə mükəmməl pedaqoji model meydana qoyaraq, bu gün də tətbiq olunan sinif – dərs sistemini yaratmışlar, öyrətmənin və öyrənmənin psixoloji – didaktik, mənəvi – sosial yollarını göstərmişlər. Y.A.Komenskidən sonra İ.H.Pestalossi, A.Disterveq, K.D.Uşinski, Herbart və Frebel kimi alimlər pedaqoq adını daşıyaraq pedaqogika elmi anlayışını meydana gətirmişlər. XX əsrin əvvəllərindən təhsilin vacib şərtə çevrilməsi ilə əlaqədar inkişaf etmiş Şərq ölkələrində yeni dünyəvi təhsil ənənələri yaranmışdır. O cümlədən Azərbaycanda da XIX əsrdə A.A.Bakıxanov, N.B.Zərdabi, S.Ə.Şirvani, M.F.Axundov tərəfindən irəli sürülən yeni pedaqoji ideyalar qabaqcıl Qərb pedaqoji ideyaları ilə cilalanaraq XX əsrin əvvəllərindən Azərbaycanda tətbiq olunaraq pedaqogika elminin formalaşmasına təsir göstərmişdir. Azərbaycanın görkəmli maarifçiləri (F.Köçərli, S.M.Qənizadə, R. Əfəndiyev, F.Ağazadə və onlarla digərləri) XIX əsrdən başlayaraq yeni məktəblərin açılması, dərsliklərin yazılması, yeni təlim metodlarının tətbiqi və digər praktik pedaqoji xarakterli işlər görmüşlər, mətbuat yaradıb, təhsillənməni, maarifi, tərbiyənin əhəmiyyətini təbliğ etmişlər, lakin fundamental pedaqoji tədqiqatlar yalnız XX əsrin 30-cu illərindən sonra meydana gəlmişdir. Bu işin pioneri Zaqafqaziya Müəllimlər Seminariyasının son məzunlarından olan Əhməd Seyidov olmuşdur. Onun böyük müasirləri Mehdi Mehdizadə, Mərdan Muradxanov "Pedaqogika" dərsliklərini yaratmışlar. Azərbaycanda pedaqogika elminin "Sacayağına" çevrilərək, onlarla alim-pedaqoqun yetişməsində əvəzsiz rol oynamışlar. Onların rəhbərliyi ilə pedaqoji elm aləminə qədəm basmış Hüseyn Əhmədov, Nurəddin Kazımov, Əliheydər Həşimov, Tələt Əfəndiyev, Yusif Talıbov pedaqogika tarixi və nəzəriyyəsinə dair əsərləri ilə XX əsrin 50-ci illərindən Azərbaycanda pedaqogika elminin bir sıra aktual probleminin həllini verərək, istedadlı pedaqoqlar kimi tanınmış, pedaqogika elmini yaradaraq onun zənginləşdirilməsinə xidmət göstərmişlər...

Bütün bu şərh xarakterli qeydlər professor Əjdər Ağayevin tətqiqatlarından alınan nəticələrdir. Professor Əhməd Seyidovun "sonbeşik" yetirmələrindən olan Əjdər Ağayev XX əsrin 1970-ci illərindən pedaqoji elmi-tədqiqat işlərinə qoşulmuşdur. Bu zaman artıq Azərbaycanda tanınmış alim pedaqoqlar dəstəsi yetişmişdi. Belə bir şəraitdə elmə gəlmək, diqqət çəkən nailiyyətlərə imza atmaq o qədər də asan deyildi. Lakin Əjdər Ağayev illər keçdikcə elmdə mövqeyə yiyələndi, görkəmli alim kimi tanınmaq missiyasını qazandı. O, buna gərgin zəhməti, istedadı, elm hərisliyi, tarix,

dil və ədəbiyyat müəllimi ixtisası qazanması, ərəb əlifbasına bələdliyi, özünəqədərki pedaqoji irsi mükəmməl öyrənməsi və praktik pedaqoji təcrübəsinin köməyi ilə əldə edə bildi. Bir də yenilikçilik səyi, yazılmışların izi ilə deyil, tədqiqata cəlb edilməmiş mövzulara, problematik məsələlərə müraciət etmə həvəsi, humanitar istiqamətli bilgilərdə universallığı, ümumiləşdirmədə məntiqi-elmi nəticələrin inandırıcılığı onun tezliklə tanınmasını təmin etdi.

O, pedaqoji elmlər doktoru elmi dərəcəsini, professor elmi adını da başqalarına bənzəmədən almışdır. Çünki o, bu zirvəyə faktiki sənədlə çatana qədər, əsərləri, tədqiqat işləri, elmi-pedaqoji kadr hazırlığı sahəsindəki xidmətləri, pedaqoji və geniş ictimai fəaliyyəti, elmi – pedaqoji ictimaiyyət arasındakı nüfuzu ilə çatmışdı.

Əjdər Ağayev Azərbaycanda pedaqoq alimlər arasında ilk dəfə sosial-pedaqoji problemli mövzuya müraciət edərək, “Azərbaycan ictimai – pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi” adlı fundamental tədqiqatını mütəxəssilərin müzakirəsinə təqdim etdi. Fəlsəfi, sosioloji, psixoloji, filoloji spektri özündə birləşdirən bu dissertasiya işi geniş müzakirələrdə yüksək dəyərləndirildi. Müdafiəyə təqdim edilmiş bu iş Ali Attestasiya Komissiyasında mükəmməl pedaqoji əsər kimi qiymətləndirildi, üstəlik müəllifin çoxsaylı kitabları, məqalələri, tədris vəsaitləri, metodik işləmələri, 18 nəfər gəncin onun elmi rəhbərliyi ilə elmi dərəcə alması da nəzərə alınaraq Əjdər Ağayevə AAK Rəyasət Heyətinin iclasında bütün üzvlərin müsbət rəyi ilə birbaşa elmlər doktoru dərəcəsi və professor elmi adı verildi. Televiziyada akademik Azad Mirzəcanzadə ilə müsahibədə AAK-ın sədri olaraq “Daha kimlərə belə bir şərəf qismət olar?” sualını verəndə, o hər hansı pedaqoji əsər Əjdər Ağayev plankasını keçsin demirəm, ona uyğun olarsa, mən o əsərin belə qiymətləndirilməsini təklif edə bilərəm; - dedi: Beləliklə, pedaqoji elmdə “Əjdər Ağayev plankası” analayışı meydana gəldi.

Əjdər Ağayevin Azərbaycanda pedaqoji elmin inkişaf etdirilməsində rolunu daha konkret ifadə etmək üçün onun araşdırma istiqamətləri üzrə bəzi məqamlara toxunmaq istərdim.

Alimin əsas fəaliyyət sahəsini elmi-tədqiqatçılıq təşkil edir. Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda (hazırda AR Təhsil İnstitutu) çalışdığı illərdə o, ilk növbədə Azərbaycanda təhsilin və pedaqoji fikrin inkişafı tarixini, görkəmli şəxsiyyətlərin pedaqoji görüşlərini, ideyalarını araşdırmış, pedaqogika tarixinin məzmununun zənginləşməsinə xidmət göstərmişdir.

XX əsrin ilk üç on illiyində jurnalist, publisist, türkoloq, ictimai xadim, pedaqoq kimi önəmli fəaliyyət göstərmiş Fərhad Ağazadə Şərqlinin irsinin öyrənilməməsi təkcə pedaqogika tarixində deyil, mədəniyyət tariximizdə boşluq kimi görünürdü. Əjdər Ağayev bu görkəmli şəxsiyyətin pedaqoji fəaliyyəti və görüşlərini tədqiq edərək, bitgin bir əsər hazırladı. Fərhad Ağazadənin pedaqoji fəaliyyəti və ideyalarını geniş təhlil etməklə bahəm, onun ana dilinin saflığı uğrunda mübarizəsini, yeni əlifba hərəkatında əsas liderlərdən olmasını, uşaq bağçalarında yeni təlim metodlarından istifadənin yollarını göstərməsini, yalnız məktəb həyatını deyil, xalqın sosial vəziyyətini, iqtisadi inkişafın milli yönümünün vacibliyini, ziyalıların maarifçiliklə kifayətlənməyərək xalqın azadlıq mübarizəsində öncüllük məsələlərini, çar

Rusiyasının ruslaşdırma və ağalıq siyasətini kəskin jurnalist qələmi ilə "İrşad", "Tərəqqi", "Azərbaycan" kimi qəzetlərdə, "Dəbistan", "Məktəb" kimi jurnallarda şərh edərək milli intibaha təkan verdiyini üzə çıxararaq, ictimai xadim mövqeyini də aşkarladı. Sanballı tədqiqatı ilə Fərhad Ağazadənin pedaqogika tarixinə daxil etməsini akademik Hüseyn Əhmədov müəllifin əhəmiyyətli xidməti kimi qiymətləndirmişdir.

Əjdər Ağayevin pedaqogika tarixinə dair əsərləri sırasında onun iranlı həmkarı Qulamhüseyn Ədaləti ilə birlikdə yazdığı "Məhəmmədhüseyn Şəhriyarın pedaqoji görüşləri" əsəri diqqət çəkən tədqiqatlardandır. Mütəfəkkir şairin əsərlərinin orijinalına müraciət edən müəlliflər onun fars və Azərbaycan dilində yazdığı əsərlərdə müasir pedaqoji ideyaların olduğunu, sülhün, əminamanlıq arzularının, xalq həyatı və təbiətin təbii gözəlliklərininin, ailə nüfuzu və müəllim şəxsiyyətinin tərənnümü ilə milli özünüdərk keyfiyyətlərini ortaya qoyduğunu faktlarla göstərmişlər. Əjdər Ağayevin orta əsr mütəfəkkirlərindən üzü bəri XX əsrin görkəmli simalarına qədər ayrı-ayrı şəxsiyyətlərin pedaqoji ideyalarını aşkarlayan, sistemləşdirən, onların müasirlik əhəmiyyətini üzə çıxaran onlarla məqaləsi bu gün pedaqogika elminin sərvətinə çevrilmişdir. Nəsirəddin Tusinin, Marağalı Əvhədinin, Məhəmməd Füzulinin, Abbasqulu Ağa Bakıxanovun, Mirzə Fətəli Axundovun, Rəşid bəy Əfəndiyevin, Şəfiqə Xanım Əfəndizadənin, Məhəmməd Əmin Rəsulzadənin, Üzeyir Hacıbəylinin, Mehdi Mehdizadənin, Səməd Vurğunun, Mirzə İbrahimovun və digər böyük şəxsiyyətlərin pedaqoji ideyalarının təhlilini verən müəllif bəzilərinin ideyalarını ilk dəfə üzə çıxarmış, bəzilərinin bəlli ideyalarının yeni aspektlərini meydana qoymuşdur.

Əjdər Ağayevin əsərləri sırasında müasirliyi və ideoloji məfkurə istiqaməti ilə diqqəti daha çox cəlb edən əsəri onun "Nəsillərə örnək İnsan" kitabıdır. Kitabda ulu öndər Heydər Əliyev irsində təhsil, elm, milli kadr hazırlığı, milli tərbiyə konsepsiyası, məktəblilərin mənəvi tərbiyəsi, vətəndaş kamilliyi məsələləri lakonik, lakin çox məzmunlu təhlil olunur. Kitaba ön söz yazan görkəmli alim professor Qəzənfər Paşayev toplunu yüksək dəyərləndirərək, o qədər də qalın olmayan bu kitab həmişə qalan olacaq, ifadələrini işlətmişdir.

Əjdər Ağayevin diqqətçəkən xidmətlərindən biri də onun əsas tərtibçisi və müəlliflərindən olduğu fundamental "Azərbaycan SSR-də pedaqoji fikir antologiyası"nın Moskvada rus dilində elmi nəşrinə 1989-cu ildə nail olmasıdır.

Onun Akademik M.M.Mehdizadə və professor Z.İ.Qaralovla birlikdə hazırladığı "Azərbaycanda maarif və pedaqoji fikir" adlı geniş giriş məqaləsində ölkəmizin qədimliyi, tarixi inkişafı fonunda zəngin təlim-tərbiyə ənənələrinə malik olduğu öz əksini tapır.

Zərdüştdən ("Avesta"dan) Əbül Həsən Bəhmənyar, Xaqani Şirvani, Nizami Gəncəvi, Nəsirəddin Tusi, Marağalı Əvhədi, İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Abbasqulu Ağa Bakıxanov, Mirzə Şəfi Vazeh və digər görkəmli simaların kommentarili təqdimatı ilə "Antologiya" o zamankı İttifaq respublikalarına və Avropa ölkələrinə yayılaraq Azərbaycanda təhsil və pedaqoji fikrin tarixən zənginliyini elmi dairələrə çatdırdı.

"Üzeyir Hacıbəyov" ensiklopediyasının hazırlanmasında da alim müəlliflərdən biri

kimi iştirak etmişdir. O, həmçinin klassik dünya pedaqoqlarının mütərəqqi ideyalarının Azərbaycanda yayılması və Azərbaycan pedaqoji fikrinin dünya elmi dairəsinə çatdırılması sahəsində də müəyyən xidmətlər göstərmişdir. Bu baxımdan onun "Lev Tolstoyun pedaqoji fəaliyyətinə dair", "A.O.Çernyayevski və onun "Vətən dili" dərsliyi, "A.S.Makarenko: dünən və bu gün", Y.A.Komenski və şərq-islam mədəniyyəti", "Nizami Gəncəvinin pedaqoji sistemində milli və ümumbəşərinin qarşılıqlı əlaqəsi", "Y. A. Komenskinin "Böyük didaktika" əsərində islam dəyərləri elementlərinə dair", "Xalqların pedaqoji əlaqələrinin öyrənilməsi tarixi-pedaqoji tədqiqatların aktual problemlərindən biri kimi", "Azərbaycan pedaqoji fikrinin aksioloji problemlərinin fəlsəfi-etik əsasları" məqalələri geniş elmi dairədə rəğbətlə qarşılanmışdır. O zamankı SSRİ Pedaqoji Elmlər Akademiyasının pedaqogika tarixi üzrə elmi-problem Şurasının üzvü kimi fəallıq göstərən Əjdər Ağayev mübahisəli elmi müzakirələrdə cəsarətli və sübutlu – dəlilli çıxışları ilə Azərbaycanlı elm adamının obrazını yaratmağa nail olmuşdur.

Əjdər Ağayevin elmi nailiyyətləri sırasında XX əsrin əvvəllərində Azərbaycanda pedaqoji problemlərin və pedaqoji cərəyanların müəyyənləşdirməsini qeyd etmək olar.

Alimin elmi yaradıcılığında şəxsiyyət probleminə dair tarixi-nəzəri aspektdə yazdığı əsərləri xüsusi yer tutur. 1974-cü ildən bu problemin tədqiqinə başlayan Ə.Ağayev "Azərbaycan maarifpərvərləri şəxsiyyət və onun formalaşması haqqında", "Azərbaycan maarifpərvərləri şəxsiyyəti haqqında" kitabları və məqalələri ilə problemin şərhini verməyə başlamışdır. Bu araşdırmaların nəticələri alimin 1996-cı ildə ərsəyə gətirdiyi "Azərbaycan ictimai pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi" fundamental əsərində ümumiləşdirilmişdir. O, bu əsərində insanın şəxsiyyət kimi formalaşmasının amillərini (irsiyyət, mühit, tərbiyə, özünü təkmilləşdirmə) meydana çıxardı, kamil insan konsepsiyasının bu baxımdan mahiyyətini aşkarladı. Eyni zamanda Azərbaycanda tərbiyə işinin elmi-pedaqoji əsaslarını müəyyənləşdirdi.

Alimin maraq doğuran tədqiqatlarından biri "Güneyqafqaz xalqlarının pedaqoji əlaqələri tarixindən" adlanır. Yetirməsi, pedaqogika üzrə fəlsəfə doktoru Vahid Rzayevlə birlikdə hazırladığı bu əsər zəngin arxiv materialları əsasında yazılmışdır. Əsərdə Azərbaycan və gürcü xalqlarının pedaqoji sahədə tarixi əməkdaşlığı faktlarla şərh olunur, daşnak erməni nümayəndələrinin qeyri-elmi iddialarının bu əlaqələrdə şəxsi marağa söykəndiyi faktlarla göstərilir.

Prof. Ə.Ağayevin tədqiqatlarının bir qismi təhsil tarixinin öyrənilməsinə həsr olunmuşdur. Bu baxımdan onun "150 yaşlı Şuşa məktəbi", "Ötən əsrdə doğulmuşlardan biri" kitabları, Bakı qəza məktəbi və Salyan normal məktəbi haqqında yazdığı məqalələri səciyyəvidir. Şuşa və Qutqaşın ibtidai məktəblərinin yaranması, inkişafı və təhsilin yayılmasında rolundan bəhs edən müəllif bu təhsil ocaqlarının insanların həyatında oynağı mütərəqqi rolu geniş şəkildə oxuculara çatdırır.

Ə.Ağayevin tədqiqatlarının digər bir qismi təhsil və təlim məsələlərinin nəzəri və praktik yönümdə təhlilinə həsr olunmuşdur. Onun "Dərs və onun planlaşdırılması", "Müasir məktəbdə təlimin səmərəliliyini təmin edən şərtlər", "Təlim prosesi: reallıqlar, perspektivlər", "Müasir təlim prosesi:

nəzəriyyə və təcrübə məsələləri", "Ali məktəbdə tədris: ənənə və müasirlik", "Təhsilin informasiyalaşdırılmasında müəllimlərin İKT hazırlığının artırılması yolları", "Qloballaşma və təhsil" məqalələri və "Təlim prosesi: ənənə və müasirlik" kitabı ənənəvi təlim-tədris təcrübəsi ilə yanaşı Azərbaycanda təhsilin modernləşdirilməsi sahəsində ideyaları və alınmış nəticələri təqdim edir.

Ə.Ağayev təhsil problemlərindən bəhs edərkən onun ideoloji mahiyyətinə də toxunur. Alimin fikrincə, təhsil milli ideologiya formalaşdıran əsas vasitələrdəndir. O bildirir ki, milli ideologiya xalqın-ideya mənəvi baxışlarını, psixoloji xüsusiyyətlərini, mübarizə və yaşamaq amalını, can atdığı idealı təcəssüm etdirən sərvətidir. Milli ideologiya xalqın adət-ənənəsindən, mübarizə tarixindən, ictimai fikir və mədəniyyət dəyərlərindən nəşət tapır, öncül ideoloqlar tərəfindən formalaşdırılır, dövlət ideologiyası səviyyəsində tətbiq edildikdə ümumxalq amalının həyata keçirilməsi vasitəsinə çevrilir.

Prof. Ə.Ağayev milli ideologiyamızın məzmununu Azərbaycançılığın, Vətənin inkişafı və qorunması üçün fədakarlığa hazır olmağın, islam dini və mənəvi dəyərlərinə tapınmağın, dünya elmi-texniki və kültür mədəniyyətindən bəhrələnərək, yeniləşmək, özünüdərk və milli mənlik şüuruna yiyələnməyin təşkil etdiyini bildirir. Bunun həyata keçirilməsinin təhsilin əsas vəzifəsi olduğunu qeyd edir.

Alim böyüyən nəsildə vətəndaş mövqeyinin, milli ideologiyanın formalaşdırılması üçün vətəndaş təhsilinə geniş yer verilməsini irəli sürür. Onun "Günün vacib məsələsi: milli ideologiya", "Müstəqil dövlət: vətəndaş tərbiyəsi", "Vətəndaş təhsili günümüzün zəruri tələbidir" və digər məqalələrində təhsil və ideologiya məsələləri geniş yer tutur.

Ə. Ağayevin pedaqoji ideyaları sırasında şagirdlərə hüquqi biliklərin davamlı olaraq verilməsi sahəsində tədqiqatları da diqqəti cəlb edir. Onun "Məktəblilərin vətəndaşlıq borcu tərbiyəsi", "Vətəndaş olmağa borclusan" kitablarında, "Uşaq qanunpozmaları və mikromühit", "Məktəblilərin hüquq təcrübəsi tərbiyəsindən" və digər məqalələrində bu aspekt öz geniş əksini tapır.

Əjdər Ağayevin tədqiqatlarının xeyli qismi tərbiyə məsələlərinə, xüsusilə şagirdlərin əxlaqi-mənəvi tərbiyəsi işinə həsr olunmuşdur. Bu qəbildən "Məktəblilərin vətənə sədaqət tərbiyəsi", "Həyatın astanasında" kitabları, "Məktəblilərin iqtisadi tərbiyəsinə dair", "İbtidai sinif şagirdlərinin hərbi vətənpərvərlik tərbiyəsi", "Ümumtəhsil məktəblərində fiziki tərbiyə və idmanın inkişafı", "Məktəblilərin əmək tərbiyəsi", "Məktəbli gənclərin mənəvi tərbiyəsi", "Tərbiyəyə kompleks yanaşma tərbiyə işi təşkilinin metodoloji prinsipi kimi", "Şagirdlərin sahiblik hissi tərbiyəsi" və digər onlarla məqaləsini qeyd etmək olar.

Ə.Ağayevin təlim-tərbiyə işinin təkmilləşdirilməsi, təhsilin məzmunun müasirləşdirilməsi ilə əlaqədar çalışmaları, proqram və dərsliklərin meydana gəlməsi ilə nəticələnmişdir. O, həmkarları ilə birlikdə "Pedaqogika" (1993, 2003, 2006, 2007) dərsliklərinin hazırlanması və nəşrində fəallıq göstərmişdir. Vətəndaş təhsili üzrə beynəlxalq təcrübəyə malik olması onun redaksiyası altında və müəlliflərdən biri kimi VIII-XI siniflər üçün "İnsan və cəmiyyət" dərsliyinin yeni məzmunda hazırlanmasına şərait yaratmışdır. Dərslik 2005-

2007-ci illərdə Azərbaycan və rus dillərində nəşr olunaraq tədrisə daxil edilmişdir.

Elmi fəaliyyətinin böyük bir hissəsinin sovetlər birliyi dövrünə aid olan Ə. Ağayevin pedaqogika elminin mühüm problemlərinə həsr olunmuş elmi, elmi-metodik və publisistik məqalələrinin bir çoxu Moskva şəhərində nəşr olunan “Семья и школа”, “Народное образавание” və digər jurnallarda dərc olunmuşdur. Eləcə də onun məqalələri Ukrayna, belarus, başqırd, ingilis və türk dillərində işıq üzü görmüşdür.

O zamankı SSRİ Pedaqoji Elmlər Akademiyasının pedaqogika tarixi üzrə Elmi-problem Şurasının üzvü olaraq sessiyalardakı çıxışları böyük maraq doğurmuş və toplularda nəşr olunmuşdur. Hazırda Rusiya Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü olan alim Akademiyanın tədbirlərində fəal iştirak edir. Yeri gəkmişkən PSEA-nın vitse prezidenti, Rusiya Təhsil Akademiyasının akademiki Svetlana Bondıryevanın Əjdər Ağayevə təbrik məktubundan bir fikirə diqqət yetirək. Akademik yazır: “Sizin pedaqogika sahəsində çoxsaylı elmi, elmi-publisistik əsərləriniz yalnız Azərbaycanda deyil, onun hüdudlarından uzaqlarda da tanınır, təqdir olunur”.

Ə.Ağayev görkəmli pedaqoq və yazıçı kimi mədəniyyət tarixinə daxil olmuş S.S.Axundovun, A.Şaiqin ənənələrini davam etdirərək bədii yaradıcılığı ilə böyüyən nəsli təlim-tərbiyəsi işinə xidmət etməyə çalışmışdır. Onun “Bala dadı, bal dadı”, “Fərhadın rəsmləri” şeirlər, “Sülh gəmisinin kapitanı”, “Ceyran nənəm” hekayələr, “Pişik balasının səhvi” (bir pərdəli pyes) kitabaları balaca oxucular tərəfindən maraqla qarşılanmışdır. Böyüklər üçün nəzərdə tutulmuş “Gəlirəm, gözlə məni”, “Allahın haqq bəndəsiyəm”, “Sevgi dünyası” şeir kitablarında da pedaqoq vətənpərvərlik, dostluq, qəhrəmanlıq, sevgi-məhəbbət hisslərini tərənnüm edir. Ə.Ağayevin uşaqlar üçün yazdığı şeirlərin bir çoxuna bəstəkarlar tərəfindən musiqi yazılmışdır. Bu mahnılar “Musiqi” dərsliklərində şagirdlərə öyrədilir.

Ə.Ağayev davamlı jurnalistlik fəaliyyəti ilə də təhsilin və pedaqogika elminin inkişafına təsir göstərmişdir. O, “Azərbaycan məktəbi” jurnalının səkkiz metodik əlavəsi ilə birlikdə baş redaktoru olarkən (1974-1981) pedaqogikanın elmi-nəzəri və metodiki problemlərinin üzə çıxarılması və həllinə kömək edən onlarla məqalənin nəşri vasitəsi ilə təhsilin nəzəri və təcrübi məsələlərinin yayılmasını təmin etmişdir. O, bu müddətdə Rusiyada yaşayan görkəmli alimlərlə əlaqə saxlayaraq, M.Skatkin, İ.Lerner, M.Maxmutov, Y.Babanski və digər mütəxəssis pedaqoqların seçmə məqalələrini Azərbaycan dilinə çevirərək jurnalda yaymışdır. Hazırda “Təhsil və zaman” qəzetinin baş redaktoru olaraq qabaqcıl pedaqoji təcrübənin, ayrı-ayrı müəllimlərin innovasiyalardan istifadə etməklə əldə etdiyi nəticələrin geniş təbliğini həyata keçirir. Yeri gəlmişkən qeyd etmək istərdim ki, Ə. Ağayev pedaqoji televiziya jurnalistikasının əsasını qoyanlardandır. O, 1971-ci ildən başlayaraq dövlət televiziyasında ardıcıl olaraq 30 ildən artıq müddətdə təlim-tərbiyə məsələlərinə, təbliğat metodikasına aid verilişlərin müəllifi və aparıcısı olmuşdur. Onun hazırladığı “Vətəndaşlıq borcu”, “Həyat bizi səsləyir”, “Ədəb-ərkan dünyamız”, “Təbliğatçının televiziya məktəbi”, “Təhsil: düşüncələr, mülahizələr” kimi verlişlər gənclərin həyat hazırlığında, şəxsiyyət kimi formalaşmasında əhəmiyyətli rol oynamışdır.

Görkəmli alim elmi –pedaqoji kadr hazırlığında da diqqət çəkən zəhmət sahibidir. Onun elmi rəhbərliyi ilə 50 nəfərdən artıq tədqiqatçı fəlsəfə doktoru və elmlər doktoru elmi dərəcəsi almağa nail olmuşdur. Ə.Ağayev elm məktəbinin yetirmələri respublikamızdakı təhsil ocaqlarında və xaricdə uğurla fəaliyyət göstərir, müxtəlif vəzifələr daşıyırlar. Bu sətirlərin müəllifi də onun yetirmələrindəndir. Elmi rəhbər olaraq onun tələbkarlığı, səmimiyyəti, qayğıkeşliyi, insanlara, hadisərə şəffaf və ədalətli münasibəti tələbələrini ruhlandırır, alınacaq nəticəyə inamını artırır.

Düşünürəm ki, alimin elmi uğurlarının, tədqiqatlarının geniş yayılmasının əsas səbəblərindən biri onun praktik müəllimlik fəaliyyəti ilə bağlıdır. O, bir müddət orta ümumtəhsil məktəblərində işləmiş, uzun illərdir ki, ali məktəblərdə çalışmaqdadır.

Alimin ictimai fəaliyyəti də faydalılığı ilə seçilir. O, 1974-1990-cı illərdə gənclərin siyasi təhsili üzrə Respublika Metodiki Şurasının sədri, Təhsil haqqında Qanun layihəsini və Təhsil İslahatı üzrə Dövlət Proqramını hazırlayan işçi qrupunun, dərslikləri qiymətləndirmə komissiyasının və digər komissiyaların üzvü olmuş, Təhsil Nazirliyi elmi-metodiki şurasının pedaqogika və psixologiya bölməsinə, dissertasiya şurasına sədrlik etmişdir. O, 1998-ci ildə Azərbaycan müəllimlərinin XI qurultayında yaradılmış Təhsil Şurasının sədridir. Təhsil Şurasının xətti ilə ölkədə və xaricdə Azərbaycan həqiqətlərini təbliğ edən, Azərbaycanda təhsilin tendensiyalarını səciyyələndirən, Ermənistan dövlətinin mənfur düşmənçilik siyasətini və Qarabağ probleminin əsl mahiyyətini bəyan edən beynəlxalq konfranslar keçirmiş, Azərbaycan dövlətinin multikultural siyasətinin yayılmasına çalışmışdır.

Prof. Əjdər Ağayev Respublika Ağsaqqallar Şurasının İdarə heyətinin, Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin, ali məktəbdə ictimai nəzarət və məsləhət şurasının, bir sıra qəzet, jurnal redaksiya heyətinin üzvü olaraq da geniş fəaliyyət göstərir. O, təhsildəki xidmətlərinə görə ulu öndər Heydər Əliyevin sərancamı ilə Azərbaycan Respublikasının əməkdar müəllimi fəxri adına (2000-ci il), dövlətimizin başçısı İlham Əliyevin sərancamı ilə Prezidentin fərdi təqaüdünə layiq bilinmişdir (2006).

Qocaman alim yaradıcılıq işlərini davam etdirir. O, “Seçilmiş pedaqoji əsərləri”nin hər biri iki cilddən ibarət Azərbaycan və rus dillərində nəşrinə nail olmuş, “Seçilmiş əsərləri”nin yeddi cildinin nəşrini tamamlamışdır. Azərbaycanın elm xadimləri seriyasından Əjdər Ağayevin Biblioqrafiyası nəşr olunmuşdur. Azərbaycanımızın dünyada təqdir olunan sürətli inkişafından ruhlanan alim yeni-yeni əsərlər üzərində çalışır, tələbələrlə, pedaqoji ictimaiyyətlə görüşür, məsləhətlər verir, mühazirələr oxuyur.

Böyük səmimiyyət və məhəbbətlə görkəmli alim, elm müəllimim Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü, əməkdar müəllim, pedaqogika üzrə elmlər doktoru, professor Əjdər Ağayevi ömrünün səkkizinci on illiyi münasibəti ilə təbrik edir, ona möhkəm can sağlığı, gümrahlıq, fəaliyyətində yeni-yeni nailiyyətlər arzulayıram.



# HUMANİST PEDAQOGİKA, YOXSA PEDAQOGİKADA HUMANİZM?

**Fərrux Rüstəmov,**
***ADPU-nun ibtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor, əməkdar elm xadimi***

***Açar sözlər:*** *pedaqoji nəzəriyyə, humanist pedaqogika, maarifçilik hərəkatı, Y.A.Komenski.*

***Ключевые слова:*** *педагогическая теория, гуманистическая педагогика, просветительское движение, Я. А. Коменский.*

***Key words:*** *pedagogical theory, humanistic pedagogy, enlightenment movement, J.A. Comenius.*

Pedaqoji nəzəriyyələrin tarixi qədim olsa da, elmi pedaqogikanın təşəkkülü Avropa maarifçiliyinin formalaşdığı XVII əsrə təsadüf edir. Bu dövr öz spesifik xüsusiyyətləri ilə fərqlənir. Maarifçilik hərəkatı İntibah dövrünün əhatə etdiyi ərazilərdən kənara çıxaraq Şərqi Avropaya, Rusiyaya və Şimali Amerikaya yayıldı. Bu dövr dahilərə ehtiyacı olan, dahilər yetirən bir dövr idi. Bu, bəşəriyyətin o vaxta qədər gördüyü bütün çevrilişlər içərisində ən böyük mütərəqqi bir çevriliş idi. Təhsilin və elmin rolunun artması ilə yanaşı kilsənin nüfuzu getdikcə aşağı düşürdü. Mədəniyyətdə dünyəvi elementlər dini elementləri sıxışdırırdı. Dövlət öz siyasi hakimiyyətini möhkəmləndirmək məqsədilə uzun müddət kilsənin əlində olan funksiyaları da ələ keçirərək idarəçilik orqanı kimi təhsilə və elmə nəzarəti gücləndirdi. Bununla da Avropada kilsənin ruhani diktaturası sarsıldı. Bu dövrün aparıcı tendensiyası F.Bekonun "bilik gücdür, güc isə bilikdir" fikri idi. Əgər İntibah dövrünün ideologiyası, fəlsəfəsi, pedaqogikası və mədəniyyəti üçün əsas aparıcı tendensiya teosentrik baxışdan antroposentrik baxışa keçid idisə, maarifçilik dövründə yeni insan modeli yarandı. İnsan şəxsiyyətinə daha yüksək meyarlarla yanaşılmağa başlandı. Həyat uğurları silki vəziyyətlə deyil, şəxsi işgüzar keyfiyyətlərlə (bacarıqla), hər şeydən əvvəl, savadlılıqla (sənayeyə, dənizçiliyə, ticarətə aid) müəyyən olunurdu. Belə insan əqli, fiziki və ruhi cəhətdən inkişaf etmiş olmalı idi.

Elmin və təhsilin sosial əhəmiyyətinin yüksəldilməsi yeni dövrün tələblərinə uyğun öz qanunauyğunluqları, tədqiqat metodları, təcrübi və nəzəri bazası olan, humanist prinsiplərə əsaslanan yeni bir elm sahəsinin- pedaqogikanın formalaşmasına kömək etdi. Təbiətşünaslığın nailiyyətləri təkcə sosial sahədə deyil, elm və təhsil sahəsində də uğur üçün əsas oldu. Zəka sahiblərinin təbiəti ilahiləşdirmələri, təbiəti onu Yaradını ilə eyniləşdirmələri təbiəti baş müəllim və tərbiyəçi qismində qəbul etməyə gətirib çıxartdı. Elmi pedaqogikanın banisi Y.A.Komenski tərəfindən təhsil-tərbiyənin təbiətəmüvafiqliyi əsaslandırıldı. O din

xadimi olmaqla yanaşı, digər mütəfəkkirlər kimi, hər şeydən əvvəl, panteist idi. Onun pedaqogikası təbiətəmüvafiq pedaqogika idi. Onu təhsil-tərbiyə ilə bağlı ideyalarına Allaha etiqad, inam, sevgi və məhəbbət elə hopmuşdu ki, İlahi həqiqətə əsaslanan fikirlərini kənara qoysaq, onun pedaqoji sistemi ətirsiz çiçək kimi öz təravətini itirər. O, insanı ali, kamil varlıq, hər şeydən üstün məxluq hesab edirdi. Onun fikrincə, insanın son məqsədi bu həyatdan kənardadır. İnsanın yaşamı üçün üç yer müəyyənləşib: ana bətni, yer və göy. Üçüncü yer əbədi həyatdır. Ölüm özü ölümsüzlüyə, əbədiliyə pillədir. Bu dünya bizim məktəbimizdir, bu məktəbin hazırlıq mərhələsindən keçib akademiyaya yüksəlməliyik. Xoşbəxt o kəsdir ki, buradan oraya pak qəlb aparsın, çirkin qəlbə müdriklik daxil ola bilməz. Onun fikrincə, əbədiyyata yüksəlməyin üç mərhələsi var: özünüdərk, özünüidarə və Allaha doğru cəhd. O yazırdı ki, Allah insanı bu dünyaya pak və təmiz göndərib, məktəbin də vəzifəsi onu pak və təmiz o dünyaya yola salmaqdır. Valideynlər uşaqlarına gözəllik, var-dövlət, rütbə arzulayır və uşaqları xarici rifaha istiqamətləndirir, onların qəlbinin fəzilətlərlə bəzədilməsi, gözəlləşdirməsi qayğısına qalmırlar. Onlar çəkməni daha hörmətə mindirirlər, nəinki ayağı. Dünyada qəlbi gözəlləşdirmək üçün kimisi var-dövlət, kimisi şan-şöhrət, kimisi gözəl dost-tanış, gəzinti, kimisi özü üçün bilik axtarır. Bunlar ruhun üzülməsidir. Həqiqi ruhi sakitliyi tapmaq üçün insan Allahı axtarmalı, mütləqə, kamilliyə can atmalı, onun qanunlarına riayət etməlidir. İnsanların düşüncəsində, işində, danışığında riyakarlıq, ədalətsizlik və hiyləgərlik var. Ona görə də Y.A.Komenski həssas, xeyirxah, mərhəmətli şəxsiyyət yetişdirmək məqsədilə qəlbin və ruhun tərbiyəsini (humanist pedaqogikanın məqsədi elə bu deyilmi?) vacib hesab edirdi. Onun fikrincə, İlahi kəlam uşaqlar üçün süddür, ona görə verilib ki, uşaqlar onunla böyüsünlər. Məktəbi "insanlıq emalatxanası", "humanizm emalatxanası" adalandıran Y.A.Komenskinin kamil insan ideyası Bibliyadan qaynaqlanır.

Yeni dövrdə (İngiltərə burjua inqilabından (1640) Birinci Dünya Müharibəsinin sonuna qədər olan dövr), həm də antik təhsil-tərbiyə mədəniyyətinin (həm Şərq, həm də Qərb) dirçəlişi təmin edildi. Yeni dövrün humanist pedaqoji ideyaları ilə antik tərbiyə nəzəriyyələri arasında daxili bir bağlılıq, varislik və həmahənglik var idi. Humanistlik, insanın istək və arzularına ehtiram, axirət dünyasına hazırlıq böyüyən nəslin tərbiyəsində, onların mənəviyyatının formalaşmasında mühüm amil idi. Məsələn, qədim misirlilər belə hesab edirdilər ki, insan öləndən sonra Allah tərəzinin bir gözünə onun ruhunu, digər gözünə isə "davranış kodeksi"ni qoyur. Əgər tərəzinin hər iki tərəfi bərabər olarsa, onda ölən adam axirət dünyasında yeni həyata başlayır. "Davranış kodeksi"nə daxil edilən əxlaqi dəyərlərdən bəzilərinə diqqət yetirək: adamlara pislik etmə, mal-qaraya zərər vurma, günah etmə, zəifə əl qaldırma, adam öldürmə, xəstəliyə və göz yaşına səbəb olma, öldürmək əmri vermə, söyüş söymə, çəki daşının üstündən basıb onun çəkisini artırma, heç kəsi aldatma, ikiüzlülük etmə, heç kəsi hədələmə, qanunu pozma, başqasını təhqir etmə, Tanrıya böhtan demə, ləkəsiz, təmiz və ədalətli ol. Bu kimi əxlaqi keyfiyyətlər min illərdir ki, insanlığın yaşam kriteriyasıdır.

Xeyirxah fikir, xeyirxah söz, xeyirxah

əməl, fiziki və mənəvi kamillik "Avesta"da təqdir edilir, təkəbbürlə baxan gözlər, yalan danışan dil, nahaq qan tökən əl, məqsədi şər olan ürək, şərə çatmaq üçün qaçan ayaq, yalandan üzə duran şahid, qardaşlar arasında nifaq salan şəxs "Tövrat"da lənətlənir, "Zəbur"da Allah sözü həyat yolunun işığı sayılır. Qarşılıqlı yardım, dünya malına həris olmamaq, dilinə, gözünə, əlinə sahib olmaq, ata-anaya hörmət etmək, iman, ümid, mərhəmət sahibi olmaq, səmavi ata kimi kamil və səbrli olmaq, yalan danışmamaq kimi əxlaqi-mənəvi dəyərlər "İncil"in ana xəttini təşkill edir. "Quran"da elmi biliklərə yiyələnmək Allah yanında oruc tutmaqdan da, namaz qılmaqdandan da, Həccə getməkdən də, Ulu Tanrı yolunda cihada qoşulmaqdan da üstün hesab edilir.

Deməli, həm xristian, həm də islam pedaqogikası məhz insanın əqlinin, ruhunun və cisminin bərabər səviyyədə inkişafı üçün müxtəlif yollar, vasitələr müəyyənəşdirib, zaman-zaman onu təkmilləşdirib.

XVIII əsrdə Qərbi Avropa maarifçiləri humanist pedaqoji ideyaların inkişafına dəyərli töhfələr verdilər. Maarifçilər pedaqoji fikirlə bağlı İntibah dövrünün estafetini qəbul edərək onu daha yüksək səviyyəyə qaldırdılar. Mövhumatın, sxolastikanın, məktəbdə silkiliyin tənqidi, demokratik təhsil sisteminin yaradılması, elmin, azadlığın, bərabərliyin, qardaşlığın və humanist ideyaların təbliği, bununla da cəmiyyətin mənəvi inkişafı onların ali məqsədləri idi.

XIX əsr mütəfəkkirləri isə maarifçiliyin məzmun və qayəsinə, ideya-estetik prinsiplərinə sadiq qalmaqla yanaşı, insan şəxsiyyətinin təkrarolunmazlığını, unikallığını, tükənməz imkan və fərdiliklərini önə çəkdilər, məktəblərdə milli şüur və təfəkkürün formalaşdırılmasını vacib hesab etdilər. Şəxsiyyətin daxili "Mən"inə daha çox maraq göstərdilər. Həm də bu dövrdə klassik pedaqogikanın formalaşması başa çatdı. Pedaqogika elminin metodologiyası, təhsil-tərbiyənin məqsədi, məzmunu, metodları, psixoloji cəhətdən əsaslandırılması ilə bağlı ciddi tədqiqatlar aparıldı. Şəxsiyyətin inkişafı ilə bağlı müxtəlif humanist nəzəriyyələr yarandı.

XX əsrin əvvəllərində zamanın mədəniyyət ölçüləri dəyişdi, yeni pedaqoji təfəkkür formalaşdı. Cəmiyyətin inkişafı ilə əlaqədar olaraq dövlətlərin təhsil siyasətində əsaslı dəyişiklik baş verdi.Yaranan yeni pedaqoji təfəkkürün başlıca paradiqmaları Ən yeni dövr mədəniyyətinin xüsusiyyətləri ilə bağlı idi. Yeni dövr mədəniyyəti diferensiasiyaya əsaslanan monoloji mədəniyyət olduğu halda, Ən yeni dövr mədəniyyəti inteqrasiyaya əsaslanan dioloji mədəniyyət idi. Pedaqogika elminin yeniləşməsi dövrün zəruri tələbatına çevrildi. Spenserin və Herbartın on illərlə hakim olan təhsil-tərbiyə nəzəriyyələri təkmilləşməyə məruz qaldı. Mədəni təfəkkürün formalaşmasına xidmət edən bu nəzəriyyələr pedaqoji prosesin çox ciddi idarə olunmasını, təlim prosesində müəllimin daha yüksək mövqeyə malik olmasını nəzərdə tuturdu. Belə vəziyyət şagirdin müstəqilliyini azaldır, nəticədə intellektualizmə gətirib çıxarırdı. Bu səbəbdən də ənənəvi (klassik) pedaqogika ilə yanaşı islahatçı pedaqogika formalaşmağa başladı. Eksperimetal pedaqogika, praqmatik pedaqogika yarandı. E.Dürkheym, P.Natorp, G.Kerşenşteyner, C.Dyui, V.Torndayk və A.Layın humanist ideyaları yeni məzmunlu və mündəricəli pedaqogikanın yaranmasını şərtləndirdi. İslahatçı pedaqogikanın nümayəndələrindən biri olan O.Dekroli deyirdi ki, pedaqoji fəaliyyət

uşağa öz şəxsi "Mən"ini dərk etməyə, öz idealını, məqsəd və arzularını həyata keçirə biləcəyi yaşayış mühitini yaratmağa şərait yaratmalıdır. İsveçrə pedaqoqu A.Fererinin fikirləri isə müasirliyi, konseptuallığı və humanist istiqaməti ilə seçilirdi. O yazırdı: "Biz quru intellektlər deyil, istənilən ictimai mühitdə müvəffəqiyyətlə hərəkət edən canlı insanlar tərbiyə etmək istəyirik".

Elmi pedaqogikanın yaranması Azərbaycan hadisəsi olmasa da, Azərbaycanda da genişlənməyə başladı. Belə ki, Azərbaycan maarifçiləri də (H.Zərdabi, F.Köçərli, R.Əfəndiyev, Ü.Hacıbəyli, N.Nərimanov, S.M.Qənizadə, Ə.Hüseynzadə, M.Ə.Rəsulzadə və b.) böyüyən nəslin təhsil, təlim və tərbiyəsi ilə bağlı sistemli humanist pedaqoji ideyaların formalaşmasına öz dəyərli töhfələrini verdilər.

XX əsrin 20-ci illərinin əvvəllərində Azərbaycanda təhsil sahəsində humanist ənənələr yaşayırdı. Milli dərsliklərdən istifadə olunurdu. Ali Pedaqoji Kişi İnstitutunda, Ali Pedaqoji Qadın İnstitutunda, Bakı Dövlət Darülfünunda xarici ölkələrin pedaqoq və psixoloqlarının humanist pedaqoji-psixoloji ideyaları öyrədilirdi. Proqramlar zəngin məzmuna, humanist və demokratik istiqamətə malik idi. Həmin proqramlar əsasında "Pedaqogika" və "Pedaqogika tarixi" dərsliklərinin ilk nəsli yarandı. Xəlil Fikrətin "Tədris və tərbiyə" tarixi, Abdulla bəy Əfəndizadənin "Pedaqoji", B.B.Komarovskinin "Pedaqoji", "Məktəbşünaslıq", "Pedaqoji seminarlar", A.O. Makovelskinin "Pedaloji" dərslikləri nəşr edildi.

Bolşeviklərin hakimiyyətinin ilk illərində ictimai-siyasi, elmi- mədəni həyatda köklü dəyişikliyin əsası qoyuldu. İnqilab ilk vaxtlar mədəniyyət xadimləri üçün romantik xarakter daşısa da, az sonra təhsilin fəlsəfi əsaslarını yaxşı bilən rus filosof və pedaqoqlarının bəziləri (S.İ.Qessen, İ.M.Qrevs, V.V.Zenkoviski, İ.A.İlin, N.O.Loski) bu zorakı rəhbərliyi qəbul etmədilər və dərhal bəyanatla çıxış edərək bildirdilər ki, sovet hakimiyyətinin pedaqoji sahəyə göstərişləri ən yaxşı halda utopiya, yaxud da şüurlu yalandır. Buna baxmayaraq XX əsrin 20-ci illərinin ikinci yarısında SSRİ-də sinfilik prinsipinin düzgün olmayan dərki siniflər üzərindəki üstünlük kimi arzu olunmaz şərhə gətirib çıxardı, tərbiyədə humanist insani ideyaların inkarına səbəb oldu. Elmi araşdırmalarda "təhsilin məqsədi kəndlilərə, ziyalılara deyil, məhz proletariata xidmət etməlidir" – konsepsiyası irəli sürüldü. Və təbii ki, bu tələbin də nəticəsi kimi "kütlələri dünya proletar inqilabı mübarizəsinə cəlb etmək, onların sosializm quruculuğunda iştirakını təmin etmək" ideyası meydana gəldi. Kommunizmi qura biləcək nəsil tərbiyə etmək məqsədi qarşıya qoyuldu. Tədricən şagird, onun arzu və idealları, iç dünyası, şəxsi "mən"i tədqiqatlardan təcrid edildi. Oktyabryat, pioner və komsomol kimi onun məktəb və dövlət qarşısında vəzifələri müəyyənləşdirildi. Millilik, demokratiklik, humanizm, xəlqilik kimi dəyərlər unuduldu, siyasətin rəhbər rolu praktik həyatın əsas istiqamətini müəyyənləşdirdi. Siyasət yalnız pedaqogika elminin deyil, ailə tərbiyəsinin əsası hesab olundu. Hər cür mənəvi dəyərlər və sərvətlər sinfiliyin "uzun arşını" ilə ölçülməyə başlandı. Siyasətləşdirilmiş uşaq yeni və qabaqcıl ideologiyanın (kommunizm ideologiyasının) daşıyıcısı kimi valideynlərə qarşı qoyuldu. Deməli, SSRİ-də, o cümlədən Azərbaycanda pedaqogika elmində tədricən deformasiya prosesi baş verdi. Pedaqogika özünün təbii inkişaf

yolundan imtina etmək məcburiyyətində qaldı. Humanist meyillər siyasiləşmənin qurbanına çevrildi. Həmin illərdə pedaqogika və siyasətin qarşılıqlı münasibətində iki meyil nəzərə çarpırdı: biri məktəbin siyasətdən tam azad olunması, digəri isə məktəbin yeni sosial quruculuğun və proletariat diktaturasının xidmətinə verilməsi. “Kommunist Partiyasının Manifesti”ndə tərbiyəni burjuaziyanın siyasi təsir dairəsindən ayırmağı qarşıya məqsəd qoyan marksistlərdən fərqli olaraq, V.İ.Lenin yazırdı: “...siyasi fəaliyyətdə həmişə müəyyən pedaqoji ünsür olmuşdur”. Marks-Lenin Pedaqoji İnstitutunun rəhbəri V.N.Şulqin yazırdı ki, kommunizm quruculuğunun universal aləti siyasət deyil, pedaqogikadır. RSFSR Elmi Tədqiqat Pedaqogika İnstitutunun direktor müavini A.G.Kalaşnikov “hər sinif (fəhlə, kəndli –F.R.) üçün pedaqogika yaradılmasını” vacib hesab edirdi. Deməli, dövlət pedaqogika elmini hətta siyasi elmlərin fövqünə qaldırmışdı. Həm “siyasi pedaqogika”, həm də “qeyri-siyasi pedaqogika” tərəfdarları siyasi fəaliyyətdə pedaqoji ünsürün olmasını qəbul edirdilər. “Qeyri-siyasi pedaqogika” tərəfdarları pedaqogikanı siyasətdən ayırsalar da, etiraf edirdilər ki, insan təbiətinin ictimailiyi onu siyasətlə bağlayır, siyasət – ictimailiyin ifadəçilərindən biridir. Məhz bu aspekt siyasət və pedaqogikanı istər-istəməz yaxınlaşdırır və birləşdirici amil kimi çıxış edir.

20-ci illərin sonu, 30-cu illərin əvvəllərində məktəbin taleyi (“məktəbin ölməsi”) ilə bağlı aparılan diskussiyalar pedaqogikada avtoritarizm meyillərinin yaranmasını sürətləndirdi. Azərbaycanda Marksist Pedaqoqlar Cəmiyyətinin təşkili bu işi daha da qüvvətləndirdi. Bu nəzəriyyənin tərəfdarları əsaslandırmağa çalışırdılar ki, əgər məktəb dövlətin bir parçasıdırsa və kommunizm cəmiyyətində dövlət olmayacaqsa, yəni öləcəksə, deməli, onun orqanı olan məktəbin də “ölümü” labüddür. Yetişən nəslin tərbiyə yeri praktik həyat və birinci növbədə istehsalat olacaqdır. Onlar bir az da irəli gedərək “məktəbin ölməsi”ni kommunizm cəmiyyəti qurulana qədər belə gözləmək istəmir və hətta gözləmənin yersiz olduğunu sübut etməyə çalışır, onun ləğvini (“ölümünü”) irəli sürürdülər.

ÜİK(b)P MK-nın 1929-cu il aprel plenumunda siyasi ton gücləndirildi. 30-cu illərdə məktəblə bağlı qəbul olunmuş qərarlar, sinfi mübarizənin gücləndirilməsi haqqında Stalin ideyası keçmiş SSRİ-də pedaqogika elminin və məktəb həyatının inkişafında demokratik ənənələrin inkişafını ləngitməklə yanaşı, həm də yeni arzuolunmaz istiqamətin formalaşmasına səbəb oldu. Məktəb və pedaqogika humanist və demokratik pedaqoji ənənələrdən uzaqlaşdı. Pedaqogika partiya və dövlətin siyasətinin təbliğatçısına çevrildi. Bununla da pedaqogikanın taleyini həll edilmiş oldu, İnsan kommunizm quruculuğunun məqsədinə yox, vasitəsinə çevrildi. Pedaqogika tarixindən görkəmli pedaqoqların bir çoxunun adı silindi, mərkəzi partiya aparatı tərəfindən (həm Moskvada, həm də Bakıda) tədqiqatçı alimlərin yaradıcılığı istiqamətləndirilməyə başlanıldı. Əsl yaradıcı intellekt daha az ehtiyac duyulan bir obyektə çevrildi. Reallığın inkarı həyat kredosu oldu.

Ölkədə başlanan repressiya dalğası, ifşa iclasları, “izhari-nifrət” mitinqləri Türkiyədən dəvət olunmuş pedaqoqları (Xəlil Fikrət, Əhməd Cövdət, Nazim Hikmət, M.Tofiq, İsmayıl Hikmət, Mühiddin Birgen və b.) pantürkist və panislamist, kamalizmin təbliğatçıları kimi damğaladısa, milli peda-

qoqların bəzilərini (Mikayıl Rəhimli, Mustafa Quliyev və b.) cismən məhv etdi.

Məktəb və pedaqogika haqqında 30-cu illərdə SSRİ-də qəbul edilən qərarlar təkcə siyasi sənəd deyil, həm də pedaqoji prosesə partiyalı rəhbərliyi təmin edən metodoloji proqram idi. Pedaqogikada humanist prinsiplərin deformasiyası nəticəsində Xalq Maarif Komissarlığının pedaqoji yaradıcılığı demokratikləşdirən bir sıra normativ aktları ləğv olundu. Paradoks ondan ibarətdir ki, mənəvi inkişafın monopoliyası kütləvi kommunist tərbiyəsi formasında aparılırdı, baxmayaraq ki, onun sərbəst yaradıcı və özünü təşkiledici pedaqoji stimulları kəskin şəkildə məhdudlaşdırılmışdı. Qeyri humanist yanaşmalar pedaqoji tədqiqatları öz inhisarına aldı, məktəbin unikallığı, onun aliliyi, ülviliyi, məbədgah olması, uşağın fərdi "mən"i az əhəmiyyət kəsb etdi. Məktəb həyatı yalnız ictimai münasibətlərin predmeti kimi tədqiqata cəlb edildi, partiyanın müəyyən etdiyi siyasi meyarlarla öyrənildi. Həmin dövrdə pedaqogika və məktəb avtoritar-bürokratik təsirləri hər an hiss edirdi. Qeyri-elmi, qərəzli pedaqoji diskussiyalar pedaqogikanın dövlətin ideoloji silahına çevrilməsinə, bununla da bir elm kimi tənəzzülünə (pedaqogikada humanizm prinsipinin ləğvinə) gətirib çıxardı.

Azərbaycanda gedən pedaqoji diskussiyalarda şəxsiyyətlərin toqquşması arxasında ideyaların mübarizəsi deyil, pedaqoji elmdə mövqe qazanmaq istəyi, totalitar rejimin təzyiqindən yaxa qurtarmaq meyli dayanırdı. Ona görə də pedaqoq alimlərin pedaqoji diskussiya və ideya mübarizələrindəki rolunu düzgün təyin etmək çətinlik törədirdi. Onların bəzilərinin istək və arzuları, yaradıcılıq imkanları və həyata baxışları ilə 30-cu illərdə yazdıqları üst-üstə düşmürdü. B.B.Komarovski, A.O.Makovelski, Ə.Zəkuzadə, Ə.Seyidov totalitar siyasi rejimin təzyiqindən qurtarmaq məqsədilə "etiraf məktubları" yazır (yazmamaq ölümə, ən yaxşı halda sürgünə göndərilmək demək idi), 20-ci illərdə təbliğ etdikləri humanist pedaqoji ideyalarda "ciddi" metodoloji səhvə yol verdiklərini "boyunlarına alırdılar".

Elmi həqiqətlərin inkarı olan bu "etiraflar" totalitar repressiya maşınının təzyiqindən qurtulmağa hesablanmışdı. 30-cu illərdə demokratik naqislik, yadfikirliyə dözməzlik, ümumbəşəri əxlaq normalarının deformasiyası cəmiyyətin təbii vəziyyətinin səciyyəvi xüsusiyyətləri idi. Başqa cür düşünmək - casusluğa, ziyankarlığa, vətənə xəyanətə bərabər tutulurdu. Bir tərəfdən pedaqoqlardan marksist pedaqogikanın yaradılması tələb olunur, digər tərəfdən bu işdə dünya pedaqoji təcrübəsindən, min illərin sınağından çıxmış humanist pedaqoji dəyərlərdən istifadəyə qadağa qoyulurdu. Nə qədər qəribə olsa da, pedaqoji elm partiyanın rəhbərləri, qurultayları, MK-nın plenumları tərəfindən inkişaf etdirilərək "zənginləşdirilirdi". Tədqiqatçı-alimlərin vəzifəsi yalnız məktəb və pedaqogika ilə bağlı rəsmi qurumlar tərəfindən irəli sürülən siyasi fikirləri izah və təbliğ etməkdən ibarət idi. Bunlar böyük bir siyasətin - imperiya siyasətinin tərkib hissəsi idi. Tədricən bütün xalqlar öz tarixi keçmişindən, milli dəyərlərindən ayrı salınmalı, sovet xalqı yaradılmalı, formaca və məzmunca ruslaşdırma, xristianlaşdırma siyasəti davam etdirilməli idi. Həmin illərdə mübahisə və diskussiyalar marksizm-leninizm fəlsəfi fikrinin saflığı uğrunda antimarksist cərəyanlara qarşı mübarizə adı altında aparılırdı. Əslində isə məqsəd ideoloji əleyhdarları, istedadlı alimləri elmdən uzaqlaşdırmaq idi.

Bu reallıqları görən, gələcək sosial bəlanı uzaqgörənliklə hiss edən C.Dyui SSRİ-yə səfərindən (1928-ci il) sonra yazırdı: “SSRİ-də insan əxlaqının transformasiyası üçün böyük psixoloji eksperimentlər aparılır. Mən SSRİ-dəki hadisələrə bütün bəşəriyyət üçün maraqlı olan, lakin nəticəsi bilinməyən eksperiment kimi baxıram”. Daha sonra o, fikrinə davam edərək deyirdi: “Mən SSRİ-dən belə bir hisslə ayrıldım ki, onunla sonrakı ünsiyyət bəşəriyyətə qarşı cinayətə yaxındır”. Hələ vaxtı ilə G.V.Plexanov da uzaqgörənliklə yazırdı: “Baş vermiş inqilab siyasi eybəcərliyə, yəni kommunist zəminində təzələnmiş çar despotizminə gətirib çıxara bilər”.

Pioner və komsomol təşkilatı məktəblilərdə, bir tərəfdən, “xalq düşmənləri”nə qarşı qorxmazlıq, nifrət hissi formalaşdırmağa çalışır, digər tərəfdən onları ən xırda nöqsanlara görə məktəbdən qovmaqla hədələyirdilər. Uşaqları məktəbdən çıxarmaq üçün müxtəlif bəhanələr tapılırdı: dərsə gecikmək, dərsi bilməmək, yoldaşının çantasına təbaşir sürtmək, məktəbin şüşəsini sındırmaq və s. Belə uşaqlar ziyankar adlandırılırdı. Bəzi məktəblərdə iş o yerə çatmışdı ki, məktəbdə müəllim və şagirddən ibarət inqilabi tribunal təşkil olunmuşdu, oraya “keşikçi dəstələrlə” günahkarlar gətirilirdi, onlar ciddi tənbeh olunur, bəzi hallarda məktəbdən azad edilirdilər.

Həmin illərin ədəbi qəhrəmanlarından biri də Pavlik Morozov oldu. Daha doğrusu, sovet hakimiyyəti öz ideoloji təbliğatında Pavlik Morozov mifindən məharətlə istifadə etdi: sistemin yetim uşaqları pioner karyerası naminə doğma atasını belə sata bilərlər. Əslində, atasını güdaza vermiş Pavlik Morozovun mənəvi cəhətdən şübhəli hərəkətləri tariflənirdi. Həmin dövrün acı həqiqətlərinin, sərt reallıqlarının bədii təhlilini vermiş görkəmli yazıçı Elçinin “Ölüm hökmü” əsərindəki Xosrov müəllimin taleyinə işıq salmış olsaq, fikrimizcə, 30-cu illər məktəbinin nə ilə nəfəs aldığı məlum olar. Taleyin ən ağır və gözlənilməz məhrumiyyətlərinə məruz qalan, başı çoxlu bəlalar çəkən, dörd nəfərlik ailəsini itirən Xosrov müəllimin faciəsini işlədiyi məktəbin partkomu Əflatun başqa cür yozur: “Nə üçün Xosrov müəllim öz şəxsi kədərini ictimai işlərdən üstün tutur? Biz bu cür xoşbəxt həyat qurmuşuq, sosializmin təntənəsi içindəyik, yoldaş Stalinlə bir dövrdə yaşayırıq, ancaq bu, dərd çəkir. Bəlkə də, bu, sosializmin təntənəsinin onda oyatdığı dərddir? Gözlərindən görürəm: ya trotskiçidir, ya da zinovyevçi”. Yaradıcı ziyalıların əleyhinə çevrilən bu terror aktından Xosrov müəllim də yaxa qurtara bilmir. On yaşlı bir uşağın ad günündə ilk badəni Mir Cəfər Bağırovun yox, balaca səbəbkarın sağlığına qaldırmağı təklif etdiyinə görə sürgün edilir. Göründüyü kimi, heç bir dində görünməmiş mənəviyyat və rəftar kodeksi əvvəlcə Pavlik Morozovla atası arasında başlandı və sonra daha da genişləndi.

30-cu illərin stalinçi müddəalarını əzbərləyən, əzbərlədiklərinə fanatikcəsinə inanan, siyasi despotluğa başlayan Arzu kimilər Pavlik Morozovun nümunəsi əsasında doğma atalarına qarşı ittiham irəli sürür, onları məktəbin divar qəzetində ifşa edirdilər. Pavliklər, Arzular atalarından, Koqanoviç, Molotov, Kalinin, Yejov arvadlarından, deməli, cəmiyyət bəşəri-dini və əxlaqi-mənəvi sərvətlərdən imtina etdi. Mənəvi ideoloji və həm də pedaqoji fəaliyyətin bütün sahələrində milli düşüncə kütləvi kollektivləşmənin təsirinə məruz qaldı. Böyüyən nəslin şüurunun kollektiv-

ləşdirilməsi fərdi fikrə, şəxsi təşəbbüsə qarşı duran rəsmi ideologiya stereotiplərinin əmələ gəlməsində təzahür etdi. Hələ məktəb partası arxasında müəllim şagirdə təlqin edirdi: hamı kimi ol! Kimdənsə nümunə götür, kiməsə oxşa! Deyilmirdi ki, özün ol, necə varsan elə ol, özünü dərk et!

30-cu illərin ikinci yarısında ÜİK(b)P MK-nın 4 iyun 1936-cı il tarixli qərarı ilə "Pedologiya" "burjua elmi" adlandırılaraq ləğv olundu, daha doğrusu, repressiyaya uğradıldı. Pedaqogikanın antropoloji əsaslandırılması ideyası tənqid olundu, pedaqoji elm üçün fundamental problemlər sayılan şəxsiyyət və mühit, kortəbii və mütəşəkkil tərbiyəvi təsirlərin nisbəti, uşağın inkişafı, məktəb və cəmiyyət mövzularının tədqiqinə son qoyuldu. Test metodu tənqid olundu. Pedoloqlar uşağın inkişafının psixoloji diaqnostikasını aparır, pedaqoji-psixoloji məsləhətlər verir, valideynlərlə əlbir işləyirdilər.

30-cu illərdə pedaqogika və siyasətin qarşılıqlı münasibətində formalaşan stereotiplər 40-cı illərdə də dəyişməz qaldı. ÜİKP(b)MK-nın "Zvezda" və "Leninqrad" jurnalları haqqında (1946) qərarından sonra mədəniyyət və elm sahəsində, o cümlədən pedaqogika və məktəb həyatında siyasi kampaniyanın genişlənməsinə şərait yarandı. Pedaqoji tədqiqatlarda millilik, demokratiklik, humanizm, xəlqilik kimi keyfiyyətlər deformasiyaya uğradı. Stalin obrazı, onun həyatı, tərcümeyi-halı böyüyən nəslin tərbiyəsinin başlıca vasitəsi hesab olundu. Özü isə bəşəriyyəti faşizm fəlakətindən qurtaran ali hərbiçi, Sosialist Əməyi Qəhrəmanı, böyük əməkçi kimi milyonların tərbiyə məktəbinə çevrildi. Kollektivləşmədən kənarda qalanlar, tacirlər, mülkədarlar, din xadimləri, qolçomaqlar, bəzən isə görkəmli partiya və ictimai xadimlər düşmən obrazında təqdim olunurdu.

50-ci illərin 2-ci yarısı və 60-cı illər sovet imperiyasının həyatında "mülayimləşmə" dövrü kimi səciyyəvidir. Həmin illərdə həm ABŞ-da, həm də SSRİ-də təhsilinin məzmununun humanistləşdirilməsi istiqamətində yeni meyillər yarandı. Birinci və ikinci dünya müharibəsi amerikalıların da həyatında möhkəm iz qoymuşdu. Məktəblərdəki sərt nizam-intizam, əməkdaşlığın istənilən səviyyədə olmaması Amerikada məktəb həyatının inkişafına, pedaqoji prosesin humanistləşdirilməsinə və demokratikləşdirilməsinə ciddi mane olurdu. Karl Rocersin irəli sürdüyü humanist ideyalar, şəxsiyyətyönümlü təhsil konsepsiyası nəinki Amerikada, eyni zamanda dünyada təlim-tərbiyə nəzəriyyəsi və təcrübəsinə böyük təsir göstərirdi, formalaşan yeni humanist pedaqoji-psixoloji ideyaların metodoloji əsası rolunda çıxış etdi.

SSRİ-də "siyasi mülayimləşmə" şəxsiyyət tərbiyəsi məsələsinə yenidən baxmağı ön plana çıxarmaqla, mənəvi tərbiyənin formalaşdırılması məsələlərinə diqqəti artırdı. Kommunizm qurucusunun əxlaq kodeksi qəbul edildi. Məktəblilərdə yüksək əxlaqi keyfiyyətlər (insanpərvərlik, dostluq, yoldaşlıq, haqsızlığa, müftəxorluğa, əliəyriliyə, mənsəbpərəstliyə, qənimətçiliyə qarşı barışmazlıq; düzlük və doğruçuluq, mənəvi saflıq, ictimai və şəxsi həyatda sadəlik və təvazökarlıq; qarşılıqlı hörmət, vicdanla işləmək və s.) tərbiyə edilməsini tələb olundu. Kommunizm qurucusunun əxlaq kodeksinin özü bir sənəd kimi peşəkarlıqla hazırlanmışdı. Kommunist Partiyasının irəli sürdüyü bu tələblər yüksək mənəvi dəyərlərə və intellektual səviyyəyə malik şəxsiyyət

yetişdirilməsində mühüm rol oynamalı idi. Lakin az sonra (elə əvvəllər də) partiya funksionerləri özləri bu tələbləri pozdular, cəmiyyətin mənəvi iflasının səbəbkarları oldular. Onlar işıqlı məqsədlər, müqəddəs amallar uğrunda qeyri-əxlaqi üsullarla mübarizə aparmağa başladılar. “Mülayimləşmədən” sonra pedaqoji prosesdə əməkdaşlığın qurulması ilə bağlı irəli sürülən müxtəlif ideya və yanaşmalar keçmiş ənənələri saxlamağa yönəldilən konservativ meyillərlə toqquşdu. Yenilikçi müəllimlər yeni təcrübənin müəllifləri kimi çıxış etdilər. Görkəmli gürcü psixoloqu Ş.Amonaşvilinin rəhbərliyi ilə 60-70-ci illərdə Gürcüstan məktəblərində yeni məzmunlu eksperimentlər aparılmağa başlandı. O, öz təcrübəsini ümumiləşdirərək ”Salam, uşaqlar”, “Necə yaşayırsınız, uşaqlar?”, “Məqsəd birdir” kitablarını yazdı. Onun təcrübəsində müəllim uşaqların ən yaxın dostu, həmfikri və yol göstərəni idi. O, uşaqları sevir, istək və arzularını nəzərə alır, ruhlandırır, həvəsləndirir, onları “2” ala biləcəkləri ilə qorxutmur, qiymətdən vasitə kimi istifadə etmir, öyrənənlərin şəxsiyyətinə hörmətlə yanaşır, avtoritarlıqdan və imperativlikdən uzaq bir təcrübənin yaradılmasına nail olur. Həmin dövrdə unutdurulmuş humanist pedaqoji ənənələr dirçəldilməyə, əməkdaşlıq pedaqogikasının rüşeymləri yaranmağa başlayır. Məktəbli şəxsiyyətinin formalaşmasında pedaqoji-psixoloji tələblər ön plana çəkilir. Şagirdləri inzibati yolla təhsilə cəlb etmək əvəzinə, onların təşəbbüskarlığının, yaradıcı fəallı-ğının artırılmasına, intizamlı olmalarına şərait yaradılması vacib hesab edilir. Kollektiv tərbiyənin funksiyasının dəyişməsi ilə bağlı yeni fikirlər yaranır. Uşaq kollektivinin kütləvi tərbiyə formasında onların özünüifadəsi, özünütəsdiqi, fərdi “məni” üçün şəraitin yaradılması önə çəkilır. Prof. Ş.Amonaşvilinin rəhbərliyi ilə bir qrup novator müəllim 1986-cı ildə “Əməkdaşlıq pedaqogikası” manifestini elan edirlər. Görkəmli pedaqoq alim V.A.Suxomlinskinin nəzəri fikirləri, Rostov, Lipetsk müəllimlərinin təcrübəsi Azərbaycanda özünə yer alır.

Pedaqoji fəaliyyətdə olan yeniliklər çətinliklə də olsa, özünə yol açırdı. Xüsusilə Ulu öndər Heydər Əliyevin Azərbaycana rəhbərliyinin 70-80-ci illərində pedaqoji nəzəriyyələrin humanist istiqaməti və millətin özünüdərk prosesi güclənırdi. Elə bunun nəticəsi idi ki, dünyagörüşü və təfəkkürü 60-70-ci illərin sovet məktəbində formalaşanlar sonralar milli azadlıq hərəkatının önündə getdilər.

XX əsrin 90-cı illərində məlum oldu ki, şagirdlərin təfəkkürünün inkişaf tempi mövcud təhsil standartlarına, qəbul olunmuş proqramlara, öyrətmə metodikalarına adekvat deyil. Şagirdlərin həddən artıq “ölü” faktlar ilə yüklənməsi onların psixikasında gərginlik yaradır. Bunun da nəticəsində şəxsiyyətin inkişafında ləngimələr baş verir, şagird öz maraq və qabiliyyətini düzgün istiqamətləndirə bilmir, nəticədə passivləşir, məsuliyyət hissi azalır. Ona görə də pedaqogikada humanist meyillərin inkişafı zərurəti yarandı.

Etiraf olundu ki, ənənəvi pedaqogika praktikaya o qədər də dəyişdirici təsir göstərə bilmir. Bütün bunlara əsasən beələ nəticəyə gəlmək olar ki, inzibati-amirlik dövründə formalaşan ideoloji ehkamlar pedaqogikanı öz təbii inkişaf axarından çıxarmışdır. “Uşaqların anadan bərabər imkanlarla doğulması, təhsil-tərbiyədə bərabər imkanlara malik olması”- kimi heç

bir elmi əsasa söykənməyən fikirlər bu gün özünü doğrultmur. Elm və təcrübə sübut edir ki, təhsil-tərbiyənin köməyi ilə çox şeyi dəyişmək olar, amma insanın təbiətini dəyişmək olmaz. Deməli, sovet hakimiyyəti illərində siyasi konyukturanın təsiri nəticəsində unudulan (unutdurulan!!!), bəşəriyyətin min illər boyu yaratdığı humanist pedaqoji dəyərlər bərpa olunmalıdır.

"Humanist Pedaqogika Manifesti"ndə deildiyi kimi, humanist pedaqoji düşüncə məktəb həyatının daim yeniləşməsi üçün imkan yaradır. Onun əsas postulatları – uşağın imkanina inam, onun orijinal təbiətini üzə çıxarmaq, ona bir şəxsiyyət kimi hörmət etmək, yaxşı əməllərə xidmət etmək, ədalətli olmaq və müasir pedaqoji düşüncə, öz metodları və formaları ilə tarixi, sosial, milli və iqtisadi şəraitdən asılı olaraq yeni pedaqoji sistemlərin meydana gelməsinə şərait yaratmaqdan ibarətdir. Bunu müəllim kollektivlərinin yaradıcılıq işindəki çoxistiqamətli işlə əldə etmək mümkündür. Humanist – şəxsiyyətyönümlü sistem mövcud olan şəraitə uyğunlaşma prosesi deyildir. Bu sistem üzrə müəllim təhsil prosesində tədrisin keyfiyyətini təkmilləşdirir, uşağı həyat şəraitinin yaxşılaşdırılmasına, dəyişikliklər, yeniliklər və axtarışlar etməsinə ruhlandırır. Belə bir istəyin mənbəyi yüksək mənəviyyatdır. Şagirdləri fikirləşməyə öyrətməyi vacib hesab edən Amerika alimi V.Bruer deyirdi: "Əgər biz Amerikada təhsilin səviyyəsini yüksəltmək istəyiriksə, şagirdlərə insanı ağıllı, öyrənən, düşünən varlıq edən keyfiyyətlər aşılamalıyıq". Təhsilin vəzifəsi isə böyüyən bu insana həyat şəraitini keçmiş nəsillərdən bir hədiyyə olaraq qəbul etməməyi, onu yaradıcı dəyişməyi, öz həyatını daha yaxşı qurmağı öyrətməkdən ibarət olmalıdır. Təhsil insanın ruhunu qidalandırmalı, onda özünə, öz daxili potensialına və onu yaradan Tanrıya inam hissi yaratmalı, onu özünüdərkə hazırlamalıdır. Təhsil insanlara istənilən həyat şəraitində düzgün hərəkət etmək qabiliyyəti aşılamalıdır. Mahiyyət etibarı ilə bu problem humanist yanaşma, yeni pedaqoji təfəkkür tələb edir. Pedaqoji prosesin əsasında duran paradiqmaları dəyişmək, onu yeni məzmunda qurmaq həyat reallığına çevrilir. Belə olan halda müəllim və şagirdlərin müəyyən qaydada və rejimdə həyata keçirilən birgə fəaliyyətlərinin zahiri ifadəsi olan təlimin təşkili formalarının da məzmunu və xarakteri dəyişir. Sosial səbəblər və didaktik sistemlərin inkişafı ilə əlaqədar olaraq meydana gələn, ciddi reqlamentə, sərt qaydalara əsaslanan standart dərslər tədricən öz yerini qeyri-standart dərslərə verir.

Humanist pedaqoji yanaşmanın məqsədi də məhz belə innovasiyaların meydana gəlməsi ilə bağlı olur. Uşağın təbii imkanına inam, onun orijinal təbiətini üzə çıxarmaq, ona bir şəxsiyyət kimi hörmət etmək, yaxşı əməllərə xidmət etmək, ədalətli olmaq və müasir pedaqoji düşüncə, öz metodları və formaları ilə yeni pedaqoji sistemlərin meydana gəlməsinə şərait yaratmağı tələb edir.

Azərbaycanda demokratik, hüquqi və dünyəvi dövlət qurulub. Bu dövlətin təhsil siyasətinin əsas prinsiplərindən birini humanistlik (milli və ümumbəşəri dəyərlərin, şəxsiyyətin azad inkişafının, insan hüquqları və azadlıqlarının, sağlamlığın və təhlükə-

sizliyin, ətraf mühitə və insanlara qayğı və hörmətin, tolerantlıq və dözümlülüyün prioritet kimi qəbul olunması) təşkil edir. Pedaqogikada humanizm ideyası bütövlükdə pedaqoji prosesin humanistləşdirilməsini nəzərdə tutur. Bu, bir tərəfdən pedaqoji prosesin iştirakçıları (məktəb direktoru-müəllim, müəllim-müəllim, müəllim-şagird, müəllim-valideyn) arasında münasibətlərin humanistləşdirilməsini, digər tərəfdən təhsil-tərbiyənin məzmun, forma və metodlarının elə qurulmasını nəzərdə tutur ki, bu zaman hər bir şagirdin fərdiyyəti, idrakı və şəxsiyyətəməxsus keyfiyyətlərinin inkişafı təmin olunur, uşağın yaxşı oxuya bilməsi və yaxşı oxumaq istəməsi üçün əlverişli şərait yaradılır. Təhsilin humanistləşdirilməsi, ilk növbədə, şagirdin təlim prosesində bilavasitə inkişaf etdirilməsini, özünü bir şəxsiyyət kimi təsdiq etməsini, özünüaktuallaşdırması üçün əlverişli şəraitin yaradılmasını nəzərdə tutur. Elə bir şərait, elə bir təhsil mühiti ki, şagird özü oxumaq istəsin. Zor gücünə verilən bilik ağlı boğur.

Məktəblərdə verilən təlimin məqsədi xeyirxahlıqdan ibarət olmalıdır (Herbart). Aristotel deyirdi ki, bilikdə irəli gedib tərbiyədə geri qalanlar irəli deyil, geri gediblər. Orta əsr Şərq fəlsəfi təsəvvürlərinə görə, tərbiyəsiz bilik - odunsuz ocaq, biliksiz tərbiyə - bədənsiz ruh kimidir. Almaniyada bir məktəb direktoru hər tədris ilinin başlanğıcında müəllimlərinə belə bir məktub göndərirmiş: “Mən, ölüm düşərgəsindən sağ qurtulanlardan biriyəm. Gözlərim heç bir insanın görməməli olduğu şeyləri görüb. Yaxşı təhsil verilmiş və yetişdirilmiş mühəndislərin inşa etdiyi qaz otaqları, yaxşı yetişdirilmiş, savadlı həkimlərin zəhərlədiyi uşaqlar, işini yaxşı bilən tibb bacılarının vurduğu iynələrlə ölən körpələr, məktəb və universitet məzunlarının öldürüb yandırdığı insanlar. Bu səbəbdən təhsilə şübhə duyuram. Sizlərdən istəyim budur: Hər şeydən əvvəl şagirdlərinizin insan olması üçün çalışın. Zəhmətinizin nəticəsi bilikli canavarlar və bacarıqlı psixlər olmasın. Oxuma, yazma, riyaziyyat uşaqlarınızın daha çox insan olmasına kömək edərsə, onda həqiqətən yararlı olar”. Bəşəriyyətin intellektual səviyyəsi günbəgün, ilbəil artsa dadağıdıcı müharibələr, müxtəlif xəstəliklər, on milyonlarla insanların yurd-yuvalarından qaçqın düşməsi, ekoloji tarazlığın pozulması, narkomaniya, insan alveri, ərzaq və su qıtlığı insanların mənəviyyatına güclü təsir göstərir, onlardakı insani hissləri öldürür. Bəşəriyyətdə özünə möhkəm yer alan yeni ideyalar- düşmənçilik, nifrət, rəqabət, dominantlıq humanist ideyaları kökündən silib aparır. Şərqdə baş verən hadisələr, “bölünmüş dünyanın yenidən bölünməsi” uğrunda gedən seperat danışıqlar, silahlı münaqişələr, irqçilik, terrorçuluq heç də yaxşı gələcəkdən xəbər vermir. Dünyada uşaq qaçaqçılığı biznesi və fahişəliyi, milli və dini dözümsüzlük halları, uşaqlara qarşı aqressiya, kimsəsiz, valideyn himayəsindən məhrum olan, alkoqol, siqaret, narkomaniya aludəçiləri olan, cinayət törədən uşaqların sayı hər il artır. Dini sektalara cəlb edilən uşaqlar ciddi psixoloji təsir altında olduqlarından onların reabilitasiyası çox hallarda mümkün olmur.

Azərbaycanda dini dözümlülük və tolerantlıq, əhalinin təhsillilik səviyyəsi yüksək olsa da dünyada gedən proseslərə biganə qala bilmərik.

Bu baxımdan Beynəlxalq Humanist

Pedaqogika Mərkəzinin 7 iyul 2011-ci ildə elan etdikləri "Humanist Pedaqogika Manifesti" maraq doğurur. Bu hərakatın nümayəndələrinin əsas ideyası klassik pedaqoji dəyərlərin (mənəviyyat və insanlıq, sevgi və xeyirxahlıq, sülh və mərhəmət) bərpasıdır. Onların fikrincə, yalnız pedaqoji şüurun dəyişdirilməsi yolu ilə mənəviyyatsızlığın, əxlaqsızlığın qarşısını almaq, avtoritarizmi aradan qaldırmaq mümkündür. İrəli sürülən bu ideyalar digər regionlarda olduğu kimi, ölkəmizdə də intişar tapmaqdadır. 2014-cü ildə Bakıda Humanist pedaqogika üzrə "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda I beynəlxalq konfrans-seminar keçirildi, Təhsil Problemləri İnstitutunun nəzdində "Humanist Pedaqogika Mərkəzi" təşkil olundu. 21-25 dekabr 2016-cı il tarixində ADPU-nun rektoru, professor Cəfər Cəfərovun, Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru Qulu Novruzovun ciddi səyi nəticəsində Humanist pedaqogika üzrə "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda II beynəlxalq konfrans-seminar keçirildi, "Respublika Humanist Pedaqogika Mərkəzi" yaradıldı. Humanist pedaqoji ideyaların Azərbaycanda yayılması ilə bağlı həyata keçirilən bu təşəbbüslər uğurla həyata keçirilən təhsil islahatına dəyərli töhfədir. Digər dövlətlərdə olduğu kimi, bizdə də bu, böyük bir hərəkata çevrilməli, bu sahədə sistemli iş aparılmalıdır.

Bunun üçün nə etməliyik? Yeni bir elm sahəsi - humanist pedaqogika yaratmalıyıq, yoxsa, pedaqogikada humanizm prinsiplərini bərpa etməliyik? Və ya da humanizm pedaqogikasını yeni pedaqoji cərayan kimi dəyərləndirməliyik? Yeni pedaqoji elm yaratmaq mümkünsüz görünür. Belə ki, dünya ideya bazarında ən az tapılan məhz pedaqoji ideyadır. Böyük yunan filosofu Aristotel əbəs yerə demirdi ki, dediklərimiz bizə qədər sonsuz sayda deyilmişdir. "Bibliya"da deyilir ki, səma altında heç nə yeni deyildir. Yenilik adı ilə elmi dövriyyəyə daxil edilənlərin çoxu unudulmuş köhnənin bərpasından başqa bir şey deyildir. Humanist pedaqogika hərəkatının görkəmli nümayəndəsi Ş.A.Amonaşvili də humanist pedaqogikanın mənası və əhəmiyyəti haqqında yazanda "humanist pedaqogika" deyil, "humanist pedaqoji fikir" anlayışından istifadə edir. Bu anlayışlar fərqli məzmuna və tutuma malikdir. O yazır: "Humanist pedaqoji fikir, hələ qədim zamanlardan insanların müşahidə etdiyi, ürəyin və ruhun dəyişməzliyini xatırladır, onların vasitəsilə insanın istedadını, zəkasını, orijinallığını, şəxsiyyətini açıqlayır. Hələ qədim zamanlardan onu öz həqiqi anının axtarışına həvəsləndirir, planetar və kosmik təkamülə xidmət edir. Bəşəriyyətin ən böyük mütəfəkkirləri keçmişdə və bugünkü bir çox müəllimlərin dünyagörüşünün və yaradıcılığının əsasını humanist pedaqoji düşüncələr təşkil edir. Buna görə də Ürəkli və Mənəviyyatlı, Qarşılıqlı və Sevgi dolu humanist pedaqoji düşüncə əsasında qurulan bu yüksək dövr, bütün təlim və tədris prosesinin hərtərəfli dəyişilməsini tələb edir". Digər tərəfdən peyğəmbərlərdən miras qalan elm (Həzrət Əli) qeyri-humanist ola bilməz. Təbiət və cəmiyyətin inkişafındakı qanunauyğunluqları və obyektiv aləmə təsiri üsullarını meydana çıxaran biliklər sistemi necə qeyri-humanist ola bilər? Elmin praktik, intellektual və əxlaqi dəyərə malik olması onun humanist mahiyyətinin göstəricisidir.

Məhəmməd Peyğəmbər deyirdi ki, biliyi onun qədrini bilməyənlərə tapşırmaq elmə zülm etməkdir. Çünki onlar bu elmdən öz məqsədləri üçün istifadə edəcəklər. Pedaqogika təhsil-tərbiyə müəssisələrində həyata keçirilən pedaqoji prosesin (mütəşəkkil təhsil-tərbiyə prosesinin) məqsəd, məzmun, forma, prinsip və metodlarını müəyyənləşdirir, təhsili sistem, proses, nəticə və dəyər kimi öyrənir, gələcək müəllimləri pedaqoji fəaliyyətlə bağlı zəruri kompetensiyalarla silahlandırır. Bu proses mahiyyəti etibarı ilə başdan-ayağa humanizm deyilmi? "Pedaqogika" sözünün mənşəyi ("payda" və "qoqos") də humanizmdən qaynaqlanır: "uşaq ötürən", "uşaq himayə edən". Digər fəaliyyət sahəsində belə yanaşma mümkün deyildir. İşlədiyin müəssisədə xırda bir səhvə görə işini itirə bilərsən, həkim kimi uğursuz bir əməliyyatın karyerana son qoya bilər, ehtiyatsızlıqdan kiminsə xəsarət almasına səbəb olsan həbs edilə bilərsən, ailə münasibətlərində əhəmiyyətsiz hesab etdiyin nələrsə ailənin dağılmasına səbəb ola bilər.Amma məktəbdə 11 il hamı sənin qayğını çəkir. Sevgi ilə, məhəbbətlə, xoş ünsiyyətlə əhatə olunursan. Sənin əlindən tutub "ana", "Vətən" sözlərini yazmaq öyrədirlər. Müəllimlərin dəstəyi ilə elmin sirlərinə yiyələnirsən, əxlaqi-mənəvi cəhətdən pillə-pillə ucalırsan. Nailiyyətlərinlə yanaşı, uğursuzluqların da olur. Uğursuzluqlarının mahiyyətini səbrlə, təmkinlə başa salırlar ki, bir daha təkrar etməyəsən. H.Əli (ə) deyirdi ki, mənə bir hərf öyrədənin quluyam. Deməli, ən çətin dövrlərdə belə məktəb və pedaqogika elmi milli xəyanət mövqeyində dayanmamış, pedaqogika yüksək ideallar və məqsədlər uğrunda mübarizəyə hazır nəslin tərbiyəçisi olmuş, təlim-tərbiyənin strategiyasını və taktikasını hazırlamış və məktəbdə isə həyata keçirmişdir. Pedaqoji və elmi-pedaqoji kadr hazırlığında on illərdir ki, istifadə edilən "Pedaqogika" dərsliklərinə qeyri-humanist pedaqogika desək, akademik Mehdi Mehdizadənin, professorlar Əhməd Seyidovun, Mərdan Muradxanovun ruhu bizdən inciməzmi? Bizləri və sizləri bu "qeyri-humanist" pedaqogika yetişdirməyibmi? Dəhşətli Stalin terroru vaxtı da, II Dünya müharibəsi illərində də, 60-70-ci illərdə də pedaqogikada işıqlı cəhətlər, humanist yanaşmalar, milli ideyalar olmuşdur. Bəlkə ənənəvi pedaqogikanın ehkamlarını və postulatlarını dəyişək, III minilliyin çağırışlarına uyğunlaşdıraq? Elə "Pedaqogika" dərslikləri hazırlayaq ki, Azərbaycanda insan kapitalının formalaşmasına böyük töhfələr verə bilsin. Çünki dövlətimizin iqtisadi, siyasi və mənəvi gücü məktəblərimizdə formalaşdırılan gələcək nəsildən birbaşa asılıdır.

XX əsrin əvvəllərində praqmatik pedaqogika (C.Dyui, U.Kilpatrik), dini pedaqogika (F.V.Ferster, M.Adler), marksist pedaqogika (P.Lafarq, K.Setkin), islahatçı pedaqogika (E.Dekroli, E.Key), funksional pedaqogika (A.Feryer, S.Frene), sonralar isə faşist pedaqogikası (E.Krik, C.Centel) adı ilə yeni pedaqoji cərəyanlar yarandı. İllər keçsə də bunlar pedaqoji elmdə cərəyan, təmayül, istiqamət səviyyəsində qaldı, yeni bir elm sahəsi kimi formalaşmadı. Bəlkə, humanizm pedaqogikasını yeni pedaqoji cərayan kimi dəyərləndirmək daha doğru olardı?

Qloballaşan dünyamızın çağırışı isə yeni humanist yanaşmaları ehtiva edən pedaqoji təfəkkürün formalaşmasını tələb edir. Bu məqsədin reallaşması üçün elmi və pedaqoji mətbuat səhifələrində qızğın müzakirələr gedir:bir qrup tədqiqatçı bütövlükdə pedaqo-

ji prosesin humanistləşdirilməsini, təhsil-tərbiyədə unudulmuş humanist ənənələrin və dəyərlərin bərpasını zəruri hesab edir, digər qrup isə "Humanist pedaqogika" adlı yeni elm sahəsinin yaradılmasını təklif edir. Hansı alimlərin fikirlərinin üstünlük qazanacağını isə zaman göstərər.

***Rəyçi: prof. R.Əliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. Rüstəmov F. Pedaqogika tarixi. Bakı, Elm və təhsil, 2012.

2. Rüstəmov F. Humanist pedaqogika: problemlər, perspektivlər. //Azərbaycan müəllimi, 20 yanvar 2017-ci il.

3. Rüstəmov F. Pedaqogika tarixi. Bakı, Elm və təhsil, 2010.

4. Komenski Y.A. Böyük didaktika (elmi redaktoru, ön sözün müəllifi prof. F.A.Rüstəmov). Bakı: Elm və təhsil, 2012.

4. Амонашвили Ш.А. Как любить детей (опыт самоанализа). – Донецк: Изд-во «Ноулидж», 2010.

5. "Humanist pedaqogika manifesti". http://humanepedagogy.edu.az/az/about/manifest/

6. Гуманная педагогика: реком. список для педагогов, студентов и родителей / сост. Е. А. Спицына, Я. Б. Коломенская. – Киров, 2006. 13 с.

**Ф.Рустамов**

**Гуманистическая педагогика или гуманизм в педагогике**

**Резюме**

Глобализация, происходящая в мире, требует формирование нового педагогического мышления, ориентирующее на гуманный подход. Для реализации этой цели на страницах научной и педагогической печати идут острые дискуссии: одна группа исследователей считает необходимым возрождения гуманизацию педагогического процесса, а другая – предлагает создания новой научной области под названием «Гуманистическая педагогика». В статье эти подходы сравнительно анализируются и исследуются.

**F.Rustamov**

**Humanistic pedagogy or humanism in pedagogy**

**Summary**

Globalization, taking place in the world, requires the formation of a new pedagogical thinking, which focuses on a humane approach. To realize this goal, there are sharp discussions on the pages of the scientific and pedagogical press: one group of researchers considers it necessary to revive the humanization of the pedagogical process, and another proposes the creation of a new scientific field called "Humanistic Pedagogy." In the article these approaches are comparatively analyzed and investigated.



# HUMANİZM TƏRBİYƏSİNİN SOSİAL-PSİXOLOJİ PROBLEMLƏRİ

**Ramiz Əliyev,**
**ADPU-nun kafedra müdiri,**
**psixologiya üzrə elmlər doktoru, professor**

***Açar sözlər:*** *şəxsiyyətin formalaşması, davranış, deviant davranış, münasibərlər sistemi, çəmiyyət, mənlik şüuru.*

***Ключевые слово:*** *формирование личности, поведение,девиантное поведение, система отношентй, общество, самосоздание.*

***Key words:*** *formation of personality, behavior, deviant bahavior, relation system, community, selfconscionsness.*

Eramızdan əvvəldən başlayaraq bu günümüzə qədər istər dövlət xadimlərinin, istər filosof və pedaqoqların, şair və mütəfəkkirlərin, istərsə də sadə insanların diqqətini cəmiyyət, şəxsiyyət, tərbiyə və övlad tərbiyəsi məsələləri cəlb etmişdir. Vaxtilə Sokrat insanlığın qarşısında belə bir vəzifə qoyurdu: “Özünü dərk et!”.

Konfutsinin ideyası belədir: “İnsanları sevmək lazımdır. Həm də hər yerdə, həmişə sevmək lazımdır”. Onun fikrincə, hər kimdə göstərilən bu beş keyfiyyətlər olsa, demək o, insansevərdir. Bunlar hörmət, nəzakət, düzlük, xeyirxahlıq və dərrakəlilikdir. İnsan əgər nəzakətlidirsə, ona dayaq olurlar, əgər hörmətcildirsə, ona rəğbət bəsləyirlər, düzgündürsə, ona etibar edirlər. Əgər o ağıllıdırsa, uğur, xeyirxahdırsa, hörmət qazana bilər.

Konfutsiyə görə, “Nəcib kişilər” həm də təhsilli, məlumatlı olmalı, elmə maraq göstərməli, özlərindən aşağıların müraciət və məsləhətlərinə utanmadan qulaq asmalıdırlar. Bununla yanaşı, prinsipiallıq, öz fikirlərini başqalarına zorla qəbul etdirməmək, xeyirxah insani münasibətlər qurmağı bacarmaq da “Nəcib kişilər” üçün zəruridir.

Konfutsi deyirdi: “Özünə rəva bilmədiklərini, başqalarına da rəva görmə”.

Xeyir və şər, humanizm və antihumanizm insan cəmiyyəti yarandığı vaxtdan meydana gəlmiş, filosof və şairlərin, pedaqoq və psixoloqların daha çox diqqət yetirdiyi məsələ olmuşdur. İnsanlar tarixən şəri, bədxahlığı pisləmiş, ədalətli cəmiyyət arzulamışlar. Lakin problem hələ də olduğu kimi qalır. Dahi Nizami yazırdı:

Bizdə bərabərdir hamının varı,
Bərabər bölərlər bütün malları.
Bizdə artıq deyil heç kəsdən heç kəs,
Bizdə ağlayana bir kimsə gülməz...

Belə bir fikir vardır ki, xeyir və şər, humanizm və qəddarlıq həmişə olmuş, bundan sonra da olacaqdır. Onlardan biri olmasa, digəri də ola bilməz. Onlar gecə və gündüz kimidir. Tarixin müxtəlif dövrlərində gah xeyir, gah da şər qalib gəlib. Hətta belə bir fikir söylənilir ki, xeyirxahlıq və bədxahlıq, yaxşılıq və pislik hər bir insanda var, lakin söhbət onun nisbətindən gedir. Kimidə xeyirxahlıq, kimidə isə bədxahlıq çoxdur.

Alimlər də bunun səbəbini, mənbəyini

axtarır, araşdırır, lakin fərqli fikir, fərqli mövqe bildirir, onu əsaslandırırlar. Kimi hər şeyin səbəbini, insanın mahiyyətini biolojiləşdirir, insanın kökündə, zatında, kimi mühitdə, onun təsirində, kimi də ictimai quruluşda, tərbiyədə axtarır.

Nizami Gəncəvinin əsərlərində bir çox hallarda "yaxşıdan yaxşı, pisdən pis törəyər" nəzəriyyəsi müdafiə edilir. O yazır:

Qurd olsa bir adam zatında əgər,
Bu qurd o ceyranın qanını tökər.

Və yaxud:

Zatı pis olanı heç yüksəltmə sən,
Qurdu bəsləməkdən ziyan çəkərsən.

Əsrar Təbrizi də şəxsiyyətin formalaşmasında irsiyyətin rolunu əsas götürmüşdür. Onun fikrincə əxlaqi keyfiyyətlər nəsildən – nəslə keçir, pis atadan pis oğul törəyir.

Vaxtının ən məşhur əsərlərindən olan, Yaxın və Orta Şərq xalqlarının ən çox sevdiyi kitablardan olan Sədinin "Gülüstan" əsəri insanları xeyirxahlığa, məhəbbətə, kamilliyə, gözəlliyə çağıran bir sənət əsəridir. Sədinin əsərlərində ümumiyyətlə, xeyirlə şər, yaxşılıqla pislik qarşı – qarşıya qoyulur, yaxşı adamlara məhəbbət, pislərə nifrət aşılanır. Sədi insanın zahiri görünüşünü deyil, mənəviyyatını başlıca şərt hesab edir. Onun fikrincə, var – dövlət, vəzifə insanlıq şərəfi deyil. İnsanlıq şərəfi xalqa xeyirli olmaqdır.

Sədi təmiz mənəviyyatın kökünü və əsasını zəhmətdə görür. Onun fikrincə, zəhmətdən qaçan insan bədxah olur. Belə adamın mənəviyyatı təmiz ola bilməz:

Eşşək ki, deyirlər çox natəmizdir,
Yük çəkir, bununçün xalqa əzizdir.
Zəhmətkeş öküzlə, yük çəkən eşşək,
Bədxah insanlardan yaxşıdır bişək.

Sədi mənəviyyatı pozan amillərin qarşısının alınması yollarını sadalayır. Onun fikrincə, insan qənaət etməyi bacarmalıdır. Varlılar da kasıblara əl tutmağa borcludur. Çünki "Yoxsulluq aparıb axırda dinsizliyə çıxarır", "Dolanmaq hayında olan, əxlaq qayğısına qala bilməz".

Sədi insanın davranışı, daxili dünyası, hansı keyfiyyətlərə malik olması, nələrdən qaçması, özünü necə aparması məsələsinə ciddi fikir verilməsini söyləyir və özü də onun yollarını göstərir: "Hədsiz sərtlik dəhşət yaradır, yersiz mülayimlik hörmət azaldır. Nə elə sərt ol ki, səndən qaçmasınlar, nə elə yumşaq ol ki, üzünə qabarmasınlar!".

Adam həm sərt olar, həm də mülayim,
Aqil peşə etməz sərtliyi daim.
Olsan çox mülayim qudurar düşmən,
Sərt olsan düşərsən qədrü - qiymətdən.

Şərq fəlsəfi fikrində, o cümlədən Sədi yaradıcılığında xeyirxahlıq, insanın əl tutması, vətəni sevmək, ləyaqətini qorumaq kimi anlayışlar güclüdür:

Alçalmaq yoluyla kim tapsa çörək,
Özünü alçaltmış o adam demək.

* * *

Xalqına zülm edən zalım dünyada,
Həmişə lənətlə salınar yada.

Sədi hesab edirdi ki, hər kəs özünə güvənməlidir. "Ey oğul, qiyamət günü soruşacaqlar, əməlin nədir, soruşmayacaqlar atan kimdir?".

Tarixin bütün dövrlərində cəmiyyət həyatında kəskin dəyişikliklər baş verdikdə insan amilinə maraq artır. Dəyişiklik, yeniləşmə istər pozitiv olsun, istər neqativ, fərq etməz.

Hər bir ictimai – siyasi quruluşdan, keçilən tarixi yoldan, xalqın milli mənəvi dəyərlərindən, iqtisadi vəziyyətindən asılı olaraq insani münasibətlərinə, şəxsiyyətin formalaşmasına fərqli tələblər verilir. Lakin onların hamısı humanizm, ədalət adı altında təqdim edilir.

Görkəmli mütəfəkkirlərin demək olar ki, hamısı mənəvi tərbiyəni, uşaqlara qayğı və məhəbbəti önə çəkmişlər.

L.N.Tolstoyun pedaqoji sisteminin əsasında uşaq şəxsiyyətinə hörmət, onların müstəqillik və yaradıcı qabiliyyətlərini inki-

şaf etdirmək dururdu.

1959-cu ildə məşhur ingilis yazıçısı Çarlz Snou Nobel mükafatının təqdimatı mərasimində söylədiyi nitqində göstərirdi ki, cəmiyyətin inkişafı ilə bağlı iki fərqli şüur forması və ziyalı təbəqəsi yaranmışdır. Bunlardan biri humanitar, digəri isə texniki təfəkkürlü, dünyagörüşlü insanlardır. Humanitarlar ənənənin pozulduğunu, getdikcə mənəviyyatın korlandığını, texnokratlar isə elmi-texniki inkişafa istinad edərək cəmiyyətin daha da tərəqqi edəcəyini göstərirlər. Uyğun olaraq humanitarlar milliliyin, texnokratlar isə qloballaşmanın təəssübkeşi kimi çıxış edirlər.

Ötən illərin təcrübəsi göstərdi ki, həm texnokratlar, həm də humanitarlar haqlı imişlər. Elm, texnika sürətlə inkişaf etdi və eyni zamanda milli, mənəvi, əxlaqi dəyərlər də sürətlə aşınmaya məruz qaldı.

Problem yalnız XXI əsr üçün xarakterik deyil, tarixin bütün məhələlərində fərqli məzmun və formada olmuşdur. Vaxtilə fransız mütəfəkkiri  Dyüklo yazırdı: "Uşaq yaxşı yazıb oxumağı bacarmalıdır. Öz doğma dilinə etinasızlıq göstərib, yalnız xarici dilləri öyrənməyə cəhd etməkdən də cəfəng bir şey yoxdur. Mən uşağın bir ingilis, romalı, yunan, spartalı kimi böyüməsini arzulamıram. O, fransızdır. Məhz fransıza lazım olan hər şeyi öyrənməsini istəyirəm".

Abbas Səhhətin fikrincə, insanda başlıca cəhət onun ruhu, dəyanəti və milliyyətidir. O, zəhərləndikdən sonra yerdə bir qəlb, cansız bir cəsəd qalır. Biz bununla mədəniləş-mirik, ruslara bir rus, avropalılara bir avropalı qazandırırıq. Biz isə yox oluruq.

Tarixi proseslərin dinamikası müxtəlif sosial şərait yaradır, başqa sözlə, ictimai, iqtisadi və istehsal münasibətləri daim dəyişir ki, bu da öz növbəsində şəxsiyyətin formalaşmasına təsir edir. Bütün bunlar ayrı-ayrı fərdlərə, eyni zamanda bütövlükdə cəmiyyət həyatına, onun inkişaf istiqamətlərinə əhəmiyyətli dərəcədə təsir göstərir.

Hələ ötən əsrin II yarısında İtaliya publisisti Viktorio Rossi yazırdı ki, elm və texnikanın sürətli inkişafı insanlığı tənəzzülə uğradır. Onun fikrincə hələ XX əsrin əvvəllərindən başlayaraq "Birinci növ" adamlar azalmağa başlayıb. Onların yerinə indi "İkinci növ" adamlar gəlib. "İkinci növ" adamlar zəhmət çəkmirlər, onlar düymələri basırlar. Onların yedikləri çörək deyil, içdiyi su. Onların yediyi də, içdiyi də kimyadır. Qaranlıq otaqlarda siçovul kimi yaşayır, televizora, kinoya baxır, gördüklərini müzakirə edirlər.

Bu, Rossinin vaxtında belə idi. İndi internet, kompüter, sosial şəbəkələr insanları elə aludə edib ki, onlardan ayrıla bilmirlər. Bunlar sadəcə sözlər deyil, həm də həyat, fəaliyyət və düşüncə tərzinin dəyişməsi deməkdir.

İqtisadi, siyasi dəyişiklik cəmiyyət həyatında sosiomədəni dəyişiklikliyə səbəb olur. Bu isə müəyyən qədər çaşqınlıqla nəticələnir. Həyat insanın özünə və başqalarına münasibət baxımından şəffaflığını itirir, sanki həyat onlar üçün anlaşılmaz və tanınmaz olur. Tədricən insanlar yeni model, dəyərlər sistemi yaratmağa, ona uyğunlaşmağa, özünüreallaşdırma və özünütəsdiqə başlayırlar.

İnsanın həyata identifikasıyasının itməsi onun xarici mühitin təsirinə adekvat cavab verə bilməməsinə səbəb olur. Belə də insan az qala öz mənini itirir, özünü necə aparmaqda çətinlik çəkir. Hesab edir ki, həyat onun istək və tələblərinə cavab vermir, o, başqaları tərəfindən düzgün qiymətləndirilmir. İnsanlara elə gəlir ki, ətrafdakılar, hətta yaxın adamlar onu düzgün başa düşmürlər. Nəticədə o, özü üçün də yadlaşır. Belə psixoloji halət zamanı insanda inamsızlıq, ümidsizlik, həyacanlanma, depressiya və psixoz güclənir.

Ümumən dünyada, o cümlədən Azər-

baycanda cəmiyyət həyatında köklü dəyişikliklərin getdiyi və getdikcə dərinləşən proseslərin baş verdiyi artıq heç kəsdə şübhə yeri qoymur. Son dərəcə sürətli dəyişikliklər, informasiyanın sürətli axını, sosial şəbəkələr, texnikanın inkişafı, beynəlxalq əlaqələrin genişlənməsi, həyati qaydaların dəyişməsi insan psixikasına, qarşılıqlı münasibətlər sisteminə ciddi təsir göstərir. Azərbaycan üçün bu köklü dəyişikliklər – bir tərəfdən qloballaşma, dünyanın sürətli inkişafından geridə qalmamaq cəhdi və bu sahədə böyük uğurların qazanılması, sosial, iqtisadi sahədə əldə olunan nailiyyətlər və eyni zamanda kəskin qütbləşmə, assosial davranışın güclənməsi, nəsillər arasında anlaşılmazlıqlar, gender problemi və s. günün reallığıdır. Bu vəziyyət şəxsiyyət probleminə, insan amilinə yenidən nəzər salmağa, yeni dövrün tələblərinə cavab verə bilən şəxsiyyətlər formalaşdırmağa sövq edir. Bütün bunlar isə təhsili cəmiyyət həyatının mərkəzinə qoyur.

İndi insanlar tez-tez qeyri-standart situasiyalarla üz-üzə qalır və onu həll etmək üçün düşünməli olurlar. Deməli yüksək intellektə, yaradıcılıq qabiliyyətinə və biliyə malik olan şəxsiyyətlərə ehtiyac artır.

Bununla bərabər mənəvi, əxlaqi dəyərlərə sahib olan şəxsiyyətlərə ondan da çox ehtiyac yaranır. İndi yalnız insanın yaşadığı mühit deyil, insanın özü də dəyişib. İndi onun maraq dairəsi, tələbatları, mənəvi-əxlaqi dəyərlərə münasibəti də dəyişib. İndi çox vacib olan və cəmiyyətin mənəvi, intellektual dəyəri sayılan mədəni səviyyə aşağı düşür.

Psixoloq və sosioloqların fikrincə, alimlər ətraf mühiti o qədər dəyişdirmişdir ki, bu mühitdə yaşaya bilmək üçün insanlar özləri dəyişməyə məcbur olmuşlar. İndi insanlar yeni zaman və məkan mühitində yaşayırlar. Onlar bir dəqiqənin içərisində dünyanın istənilən nöqtəsi ilə əlaqə qura, orada baş verənlər barədə informasiya əldə edə bilirlər.

Bütün bunlar insanın təfəkküründə, emosional sferasında psixi və fiziki gərginliyə səbəb olur. Bunun nəticəsində mənəvi dəyərlər itir, eqoizm, aqressiya güclənir. BMT-nin hesablamalrına görə indi dünyada 450 milyon insan fiziki və psixi pozuntudan əziyyət çəkir.

Məhşur Amerika sosioloqu S.F.Xantinqton “sivilizasiyaların toqquşmasından” bəhs edərkən göstərir ki, bu çox ciddi fəsadlara səbəb ola bilər. Çünki indi Avropa özü mənəvi dəyərlər baxımından böhran keçirir.

Müasir dövrdə ciddi problemlərdən biri də nəsillər arasındakı anlaşılmazlıqdır. Fransız psixoloqlardan biri bu fərqi yumoristik şəkildə belə təsvir edir. Yazır ki, indiki gənclər sanki əvvəlkilərdən heç nə ilə fərqlənmirlər. Onlar da böyüyür, məktəbə gedir, siqaret çəkir, evdən gedir, evlənir, uşaqları olur. Fərq ondadır ki, onlar hər şeyi əks ardıcıllıqla edirlər. Əvvəl uşaqları olur, sonra evlənirlər, sonra evdən gedirlər.

İndi dəyərlər dəyişib. Maks Veber deyirdi: “Vaxt puldur”. Təəssüf ki, indi pulun dəyərləndirilməsi, həyatın ən vacib amilinə çevrilməsi insanların mənəvi zənginliyini, ədalətlilik hissini sıxışdırır.

Böyüyən nəslin psixi inkişafına, psixi və fiziki sağlamlığına təsir edən amillərdən biri də kompüterdir. Amerika psixoloqu S.C. Xarrisin maraqlı bir deyimi var: “Qorxulu orası deyil ki, vaxt gələcək kompüter insan kimi fikirləşəcək. Qorxulu olan odur ki, vaxt gələcək insanlar kompüter kimi düşünəcək”.

İndi ailənin, məktəbin qarşısında daha mühüm vəzifələr durur. Bunların sırasında kompüterin təsirinin öyrənilməsi ilk sıralarda durur. Hələlik məlum olan odur ki, onun həm pozitiv, həm də neqativ tərəfləri vardır.

İnternet asılılığı uşaq və yeniyetmələri, bəzən böyüklərin özlərini də yalnız real

aləmdən uzaqlaşdırmır, həm də onlarda sosial normlara biganəlik, aqressivlik, deviant davranış yaradır. Eyni zamanda çoxsaylı saytlardan istifadəyə maraq yaradır. O da məlumdur ki, bu saytların heç də hamısı xeyirxah məqsədlə yaradılmayıb. Burada uşaq pornaqrafiyasından tutmuş, insan alverinədək insanları sövq edənləri də vardır. Onun təsirilə şəxsiyyətin formalaşmasında yeni istiqamətlər meydana çıxır. Nəticədə yeniyetmə və gənclərdə özünümüdafiə kompleksi yaranır. Bu da yaşlılarla münasibətdə gərginlik formasında meydana çıxır. İnsanın yaratdığı və böyük nailiyyəti hesab olunan bu kəşflər tədricən böyük bir problemə çevrilir. İnsan öz yaratdığını idarə etməkdə çətinlik çəkir

Bu bir həqiqətdir ki, indi yalnız real aləm dəyişməyib, cəmiyyət yeni bir tarixi mərhələyə daxil olur və burada insanın özü də dəyişir. Təbii ki, buna uyğun olaraq, təhsil sistemində əsaslı dəyişikliklər aparılmalı, şagirdlər reallığın tələblərinə uyğun olaraq hazırlanmalıdırlar. Yəni məktəbdən sonrakı həyata hazırlanmalıdırlar.

Müasir dövdə şagirdlərin daha çox intellektual inkişafına, daha çox bilik əldə etmələrinə, bir sözlə, onların beyninin biliklərlə doldurulmasına çalışılır. Bunu valideynlər də istəyir. Təbii bilik qazanılması, onun bacarığa çevrilməsi vacibdir. Lakin bu biliklərdən reallıqda istifadə olunurmu?

İndi təhsillə mədəni səviyyə arasında bağlılıq az qala itir. Əgər XIX-XX əsrlərdə təhsilli adam həm də geniş dünyagörüşü, mədəni səviyyəsi olan şəxs idisə, indi bunu söyləmək çətindir. Onlar cəmiyyətin digər üzvləri üçün nümunə olmaq funksiyasını itirməkdədirlər.

Cəmiyyət həyatı bütöv bir orqanizmdir. Əgər insanın bədən üzvlərindən biri sıradan çıxırsa, bədən məhv olur. İnsan acdırsa, onun yalnız mədəsi yox, həm də başı ağrıyır, bədən süstləşir. Yəni problemlər kompleks həll olunmalıdır. Burada isə təhsilin üzərinə böyük yük düşür.

Vaxtilə Bismark deyirdi: “Müharibədə qələbəni generallar yox, məktəb müəllimləri təmin edir”. İndi təhsildə, ümumən cəmiyyətdə milli-mənəvi, əxlaqi dəyərlər başlıca məsələ olmalıdır. Təhsil mədəni-tarixi əsaslara söykənməlidir. Bu, heç də yaşlı nəslin sosiomədəni təcrübəsinin, dünyagörüşünün mexaniki şəkildə gənc nəslə ötürülməsi mənasında başa düşülməməlidir. Bunlarla yanaşı, dövrün tələblərinə uyğun, fəal, çevik, yaradıcı təfəkkürə malik şəxsiyyətlər formalaşdırılmalıdır. Gənclərin sosiallaşması başlıca məsələ olmalıdır. Bunu isə yalnız sinif otaqlarında, auditoriyalarda formalaşdırmaq mümkün deyil. Başlıca hədəf insanın formalaşdırılmasıdır. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda “təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi” mühüm vəzifə kimi qarşıya qoyulur.

Həmişə haqlı olaraq fəxr etdiyimiz nəsillər arasında anlaşıqlıq tədricən itməkdədir. Böyüməkdə olan gənc nəsillə yaşlı nəsil arasında nəinki anlaşılmazlıq, hətta köklü ziddiyyət özünü göstərir. Tərbiyəçi və tərbiyə olunan, müəllim və şagird, valideyn və övlad cəmiyyət həyatını, borc, vəzifə və hüquqlarını fərqli şəkildə qavrayır, dərk edirlər.

Nəzərə almaq lazımdır ki, müasir dövrdə qlobal böhran yalnız ekologiyanı, iqtisadiyyatı əhatə etməklə məhdudlaşmır, bəhran mənəvi-əxlaqi dəyərlərə də ciddi təsir göstərir. Mahiyyətcə müasir sosium demək olar ki, bütün parametrlər üzrə dəyişmişdir. İndi bizim elmimizin, təhsilimizin qarşısında duran vacib məslələrdən biri də müasir insanın, onun düşüncə və həyat tərzinin dərk olunması ilə bağlıdır. Müasir insanlar yeni tip təfəkkürün, şüurun, özünüdərkin daşıyıcılarıdır. İnsanlar öz hüquqlarını daha çox tələb etdikləri halda,

vəzifə və borclarını sanki unudurlar. İndi insanların motivasiya-tələbat sferasında maddi təminat, əyləncə, sərbəstlik, ətraf mühitə, insnalara biganəlik artır. Gənclərin çoxu hesab edir ki, onların hər şeyə haqqı çatır, heç kimin və heç nəyin qarşısında cavabdeh deyillər, əksinə, hər kəs onlara borcludur. Bu isə şəxsiyyəti deformasiyaya uğradır, iradəni, intellekti kütləşdirir.

Diqqəti cəlb edən məsələlərdən bir də uşağın sosiallaşması və psixi sağlamlığı problemidir. Burada valideynlərin, böyüklərin münasibəti, uşağa qarşı sevgisi mühüm rol oynayır.

Müasir dövrdə böyüklərin, valideynlərin uşağa qarşı diqqəti, xüsusən sevgisi azalıb. İndi atasız doğulan, küçəyə atılan, valideynlərini uzun müddət görə bilməyən uşaqların sayı artıb.

Tərbiyə işi kifayət qədər mürəkkəbdir. Çünki onun nəticəsi özünü gec, onilliklərdən sonra göstərir.

Neçə illər əvvəl "Semya i şkola" jurnalında gənc bir qadının məktubu dərc olunmuşdu. Qadın kömək diləyirdi. O yazırdı: "Mənim otuz yaşım var. Anamla birgə yaşayırıq. Anam qocalıb, məndən asılıdır. Vaxtaşırı mən qayışı götürüb onu amansızcasına döyür, sonra ağlayıram. Bilirəm ki, düzgün etmirəm. Lakin özümü bu işdən çəkindirə bilmirəm. Axı, mən uşaq olanda anam məni bu qayışla, məhz bu qayışla, həm də haqsız yerə döyərdi. İstəyirəm bunları unudum. Lakin unuda bilmirəm, özümlə bacarmıram".

Bizdə atalar sözü var: "Nə tökərsən aşına, o da çıxar qaşığına". Valideyn kimi, necə tərbiyə edirsə, bir müddətdən sonra "əkdiyinin məhsulunu dərir". Həm də tək özü yox, bütövlükdə cəmiyyət.

14 yaşlı yeniyetmə bir qız yazır: "Atamla anam yola getmir. Tez-tez dalaşır, küsülü qalırlar. Valideynlərim heç də imkansız deyillər. Lakin biz demək olar ki, bir süfrə ətrafında əyləşmirik. Belə bir hal olanda sonu qanqaraçılığı ilə qurtarır.

Onların hər biri özləri üçün paltar alırlar. Məni isə sanki unudublar. Bəzən qışın soyuğunda köhnə, cırıq ayaqqabı geyinirəm. Sizcə, mən nə etməliyəm?"

Haqlı sualdır. "Mən nə etməliyəm?" Bu qız nə etməlidir? Bəlkə valideynlər faciə baş verməsini gözləyirlər? Hələ geyimdən başqa, bu qıza valideyn qayğısı və sevgisi də lazımdır.

Uşaq vaxtı buraxılan imkanı sonralar islah etmək xeyli çətin olur. Bu mənada F.M.Dosteyevskinin sözləri yerinə düşür: "Xoşbəxt uşaqlığı olmayan kəs, mənəviyyatlı ola bilməz". Nikola Makiavelli isə belə deyib: "Mən kasıb ailədə doğulduğumdan həyatı əyləncə kimi deyil, məhrumiyyətlər kimi dərk etdim".

Mütəfəkkirlər göstərirlər ki, uşaqların tərbiyəsi insan fəaliyyətinin ən mürəkkəb sahəsidir. Kant yazır ki, uşaqların tərbiyəsi inasnın təbiətinin təkmilləşdirilməsi üçün ən yaxşı vasitədir. Lakin nədənsə insanlar ona az diqqət yetirilər.

Qədim dövlərdə uşaqların tərbiyəsini qullara tapşırırdılar. Orta əsrlərdə özünə iş tapa bilməyənlər məktəbdə müəllim işləyirdilər. İndiki dövrdə insanlar tərbiyə işini çox sadə və asan iş hesab edirlər. Ona görə də uşağa baxmağı, onun tərbiyəsi ilə məşğuıl olmağı xidmətçilərə tapşırırlar. Müəllimlər isə hesab edirlər ki, tərbiyə sahəsində yüksək biliyə və hazırlığa malikdirlər. Və onlar öz təcrübələrini uşaqlara tətbiq etməyə çalışırlar.

Vaxtilə K.D.Uşinski yazırdı: "Hər kəs hesab edir ki, tərbiyə işi asan və aydındır. İş burasındadır ki, bu sahədə nəzəri və praktiki hazırlığı olmayanlar burada heç bir çətinlik görmürlər".

Məlumdur ki, üzərində işləyəcəyi materialın xassəsini bilmədən, öyrənmədən ondan nəsə hazırlamaq mümkün deyil. Bağban bitkinin, torpağın xassəsini öyrənmədən heç bir iş görə bilməz.

Spenser yazır: "Ayaqqabı tikmək, bina qurmaq, gəmi və lokomotivi idarə etmək üçün hökmən uzun müddət oxumaq,

öyrənmək lazımdır. Yəni insan bədəni və ruhu elə sadə oldu ki, onu idarə etmək üçün heç bir hazırlıq tələb olunmasın”.

Deməli, tərbiyə obyekti olan uşağın, onun inkişaf qanunauyğunluqlarını öyrənmədən müsbət nəticə almaq olmaz. Uşağın inkişaf qanunlarını öyrənmək üçünsə ilk növbədə həyatın qanunlarını öyrənmək lazımdır.

Stenli Xolla görə uşağı, onun qəlbini başa düşməməkdən də acı bir şey ola bilərmi? Zəif, zərif, köməksiz uçaq valideyn qayğısı və tərbiyəsinə möhtacdır. Bu qayğını görməyən uşaq yaşaya bilməz. Bununla yanaşı tərbiyə alamadan da uşaq heç nə öyrənə bilməz. Deməli, valideynin də borcu uşağı düzgün tərbiyə etməkdir.

Məhəmməd (Ə.S.) deyir ki, uşaq vaxtı öyrədilənlər daş üzərinə, böyüdükdən sonra öyrədilənlər qum üzərinə yazılan yazı kimidir. Uşaq vaxtı öyrədilənlər insanı ömrü boyu izləyir. Fikrimizi məşhur şəxsiyyətlərin nümunəsində verək.

Yekatrina Yeqorova-Qantmanın “Əsgər oyunu” adlı kitabında Amerika prezidentlərinin uşaqlıq həyatı, idarəetmə üsulubu və hakimiyyətə can atmaq tələbatlarından bəhs olunur.

Bill Klinton ana bətnində olarkən atası avtomobil qəzasında ölür. Klinton onun atalığının soyadıdır. Atalığı tez-tez içir və onu döyürmüş, anası isə şən, həyatsevər qadın olub. Ona görə də Klintonda ikili identifikasiya: yaxşı oğlan olmaq və şən, həyatsevər gənc olmaq tələbatı yaranır. Seçim etmək zamanı tərəddüd etmək xüsusiyyəti də onda uşaqlıqdan yaranıb. O, bir tərəfdən ciddi, qətiyyətli prezident, digər tərəfdən Monika Levinskaya ilə eşq məcarası yaşayan qeyri-ciddi insan təsiri bağışlamışdır.

Y.Qantmanın fikrincə, oğul Buş üçün xeyli çətin olmuşdur. O, atasının oxuduğu məktəbdə oxumuş, onun “kruqunda” olmuş, lakin bütün məsələlərdə atasından geridə qalmışdır. Ona görə də oğul Buşda bir çox kompleks özünü göstərmişdir.

Qəribədir, əgər obrazlı şəkildə desək, sanki uşaq dünyası ilə böyüklər aləmi arasında bağlı qapı vardır. Böyüklər qapının qıfılını açmaq əvəzinə onu lomla, balta ilə açmağa çalışırlar. Niyə də belə olmasın? Axı, böyüklərə elə gəlir ki, uşaq aləmində baş verənlər onlara yaxşı məlumdur və bu dünyanı onlar uşağın özündən yaxşı bilirlər. Bir az kobud desək, böyüklər uşağın iç dünyasına zorakılıqla daxil olur, onu idarə etməyə çalışırlar. Bu alınmadıqda isə qəzəblənir, gileylənir, şikayət edirlər ki, uşaq pozulub.

Uşaq qəlbinə yol tapmaq. Dörd yaşlı balaca oğlan gecə yarısı ağlayıb konfet istəyir. Onu sakitləşdirmək olmur. Nəhayət ata deyir: “Bax, bir dəqiqə ağlama, sonra ağlayarsan. Uşaq qulaq asır. Ata deyir: “Sən indi ata oldun, mən də sənin oğlun. Mən konfet istəyirəm, konfet istəyirəm”. Ata ağlayır. Uşaq atasına baxır, sonra deyir: “Ağlama, gəl yataq, sabah alarıq”.

Bəs, dəyişən nə oldu? Ata uşaqda həminki anda böyüklük hissi yaratdı.

Məhşur psixoloq A.V.Zaporejes qeyd edirdi ki, uşaqlıq yaşının sərhədlərinin genişləndirilməsi sivilizasiyanın mühüm nailiyyətlərindəndir. Lakin bir çox hallarda valideynlər, elə müəllimlər özləri də uşaqlığın müddətini qısaltmağa çalışırlar.

Elmi ədəbiyyatda “İnstruksiyalı təlim” anlayışı var. İnstruksiyalı təlim hər şeyin yalnız təlimatlara əsasən icra olunması mənasını daşıyır. Bu təlimin mənfi tərəfi ondadır ki, insan psixikası yalnız təlimatlara əsasən fəaliyyət göstərməyə uyğunlaşır, həqiqətin axtarılmasına meyil etmir, özünütəsdiqə çalışmır. Bu insanlar necə olur olsun başqalarına xoş gəlməyə, təriflənməyə can atırlar. Əslində isə uşaqlara böyüklərin istədikləri kimi davranmaq, düşünmək, fəaliyyət göstərmək yox, düşünməyi,

müstəqilliyi öyrətmək lazımdır.

Psixologiyada "Açıq sahə" deyilən bir anlayış var. Fikrimizi 3-6 yaşlı uşaqlarla aparılan eksperimentin əsasında təqdim edək. Böyük bir otağı iplə iki yerə bölürlər. Otağın bir tərəfində uşaqların oynaması üçün hər şey var: pianino, top, müxtəlif oyuncaqlar və s. Digər sahə isə tamamilə boşdur. Uşaqlara tapşırılır ki, boş sahəyə keçməsinlər. Uşaqlar səbəbini soruşduqda bildirilir ki, olmaz, vəssalam. Eksperimentator otağı tərk edir və xüsusi yerdən uşaqları müşahidə edir. Nəticə qəribə olur. Uşaqların hamısı qadağanı pozur, lakin hər kəs bildiyi formada. Uşaqlar qadağa qoyulmuş sahəyə keçir, sonra geriyə qaçırlar.

Maraqlıdır ki, heyvanlar üzərində aparılan eksperimentdə də oxşar davranış özünü göstərir. Heyvanları onlar üçün tamamilə rahat olan sahədə yerləşdirirlər. Lakin qapını açıq qoyurlar ki, onlar istəsələr "açıq sahə"yə çıxa bilsinlər. Burada isə onları cəza – elektroşok gözləyir. Bütün bunlara baxmayaraq onlar "açıq sahəyə" can atırlar. Yəni açıq sahəyə çıxır, sonra geri qaçırlar. Bu o vaxta qədər davam edir ki, onlar "açıq sahə" ilə tamamilə "tanış olurlar".

Göründüyü kimi, qadağanın pozulması yalnız psixoloji tələbat deyil, həm də bioloji tələbatdır. Sosial texnologiyalar baxımından, tərbiyəçi və uşağın qarşılıqlı münasibətləri baxımından uşağa müstəqil sahə ayrılmadıqda, onlar öz müstəqilliklərini qadağan olunmuş sahədə axtarırlar. Bu isə təbii ki, valideynləri, müəllimləri, tərbiyəçiləri qəzəbləndirir. Burada maraqlı cəhət ümumiyyətlə insanın təbiəti ilə bağlıdır: qadağan olunan şey cəzbedici olur.

Uşaq qadağan olunmuş işi görməklə sanki axtarır, öyrənir. Dəfələrlə fikrində, təsəvvüründə qadağa qoysa da, qadağan olunmuşu icra etmək istəyir. Deməli, qoyulmuş qadağa nə vaxtsa icra olunmalıdır. Belədə uşağın oynamasına qadağa qoymaq, məktəbdə bütün davranışı nəzarətdə saxlamaq mümkündürmü və ya lazımdırmı?

Psixoloqlar hesab edirlər ki, şərait yaratmaq lazımdır ki, uşaq oynasın, nəyisə qaralasın, stolun altına girsin, yəni o tələbat ödənilsin, sonra qadağa qoyulsun.

Əks halda psixikada nə baş verir? Uşaq qadağan olunmuş işi fikrən yerinə yetirir, onda qorxu hissi formalaşır və belədə uşaq ondan xilas olmağa can atır. Qadağan olunmuş, reallaşmayan istək psixikadan pozulmur, sadəcə olaraq şüuraltı sahəyə ötürülür və zamanını gözləyir. Bununla bağlı həyatdan, hər kəs öz həyatından istənilən qədər nümunə göstərə bilər. Uşaq vaxtı istədiyi gəlinciyi ala bilməyən qız uzun illər onu unuda bilmir. Deməli, tələbat ödənilməmiş qalır. Nəhayət, böyüyür, özü ana olur. Həminki gəlincikdən qızına alır. Guya ki, qızını öyrədir (təbii ki, özü də bilmədən) deyə gəlinciklə oynayır və yalnız bundan sonra qızının ixtiyarına buraxır. Uşaq vaxtı yaranan, lakin ödənilməyən tələbat ana olduqdan sonra ödənilir. Bu tələbat, hətta nənə olduqda da ödənilə bilərdi.

14 yaşlı oğlan atasından ona velosiped almasını xahiş edir: - Qonşu oğlanların var, qoy, mənim də olsun. Atadan əvvəl ana dillənir:

- Yox, yox olmaz! Qətiyyən olmaz! Sən dərs oxumalısan, həm də onlara qoşulma, sən onların tayı deyilsən. Sənin atan...

Oğlan pörtmüşdü. Qəhər onu boğurdu. Fikrindən isə özünü dartaraq, velosipedini o tərəf bu tərəfə sürən qonşu oğlanların qalib görnüşünü keçirdi:

- Ana, hələ yay tətilidir. Axı...
- Yox, yox! Dedim ki, olmaz.

Səhərsi gün ananın gözləri qəzəbdən bərəlmişdi. Onun saymadığı qonşu oğlan velosipedində oturmuşdu, oğlu isə velosipedi itələyirdi. Bir azdan velosiped sürət götürdü. Oğlu onun arxasınca qaçırdı. Velosiped uzaqlaşdı, oğul isə səkinin kənarında, daşın üstə oturdu. Ana eyvandan oğluna baxırdı. İndi o qəzəbli deyildi. Sadəcə olaraq heyrətlə oğluna baxırdı. Sanki kiminsə ona baxdığını hiss edən oğlan başını qaldırdı, evlərinə tərəf baxdı. Baxdı və anasını gördü.

Ana heyrət içində nə baş verdiyini anlamağa, dərk etməyə çalışırdı. Qonşu oğlan

velosipedin üstündə sürətlə geri qayıdırdı. Oğlunun yanında velosipedi qəflətən saxladı. Onun sifətində bir qalib ədası var idi.

Oğlu isə hələ də daşın üstündə oturub başını əlləri arasına almışdı. Və nəhayət ağır addımlarla evə qalxdı. Qapı açıq idi.

- Ana....

Ana oğlunun nə deyəcəyini gözləməyib, qucaqlayıb üz-gözündən öpürdü. Hər ikisi qəhərlənmişdi.

Böyüklərin tez-tez işlətdikləri bir söz var: “yoldan çıxarmaq”. Əslində “yoldan çıxarmaq” fikri fəaliyyətdir. Bu, həm fikirdə olan qorxunu çıxarmaq, eləcə də sirli, cəlbedici işi icra etmək tələbatıdır. Bu, özünütəsdiq mexanizmidir, qadağan olunmuşla istək arasında baş verən prosesdir. Bu isə sonda davranış normasının pozulması ilə nəticələnir. Başqa sözlə, qadağan olmuş hərəkətin, davranışın, istəyin icrasına təhrik edən özünütəqliddir. Məsələn, sərxoşluq istək və hərəkətin vəhdətidir. Bu, təxminən Siam əkizləri kimidir. Əbəs yerə demirlər ki, sərxoşun dedikləri, ayıq adamın fikrindədir. Yəni insan öz təxəyyülünün quludur. Burada ona nəzarət etməli olan iradə gücsüzdür. Ona görə də alkaqolikə “içmə” demək heç bir təsir göstərmir. Bu, yalnız həmin adamın özü istədikdə baş tuta bilər.

İnsanın təbiəti elədir ki, ona xoş gələn, istədiyi şeyə doğru can atır, istəmədiyindən çəkinir. Uşaq vaxtı qoyulan qadağa uşaqda elə təsəvvür yaradır ki, qadağan olunan şey şirindir.

Şəxsiyyətin formalaşması prosesi azadlıqdan və özününəzarətdən keçir. Özününəzarət isə həm xarici mühitin (obyektiv), həm də daxili mühitin (subyektiv) vəhdətində formalaşır. Hədsiz ciddi obyektiv səbəblər, kənar nəzarət şəxsiyyətin yaradıcılıq imkanlarını, məsuliyyət hissini məhdudlaşdırır. O, hər yerdə, hər şeydə kiminsə köməyinə, qayğısına möhtac olur.

Bütün valideynlər övladlarını xoşbəxt görmək istəyir. Ona görə də onun əvəzindən bütün qərarları özü verir. Uşağın özünə isə yalnız “sonra”, “vaxt gələndə” qalır. Vaxtın isə nə vaxt gəldiyini kimsə bilmir və ya bilmək istəmir. Vaxt gələndə isə gözlənilən, arzu edilən yox, başqa birisi gəlir. Böyüklər bütün bunları ona görə edirlər ki, sanki özlərinə və başqalarına sübut edirlər ki, onlar hər şeyə qadirdirlər, hər şeyi bacarırlar.

Valideynlik biz desək də, deməsək də, həm də eqoizmdir. Tez-tez hər birimiz belə sözlər eşidirik: “Mən onu dünyaya gətirdim. Mən onun üçün nələr etmədim? Amma o... O, neynədi?”

Valideynin eqoistik hissinin psixoloji mexanizmi təxminən belədir: “Verdiyim həyat üçün həyatını borclusan”.

Hələ uşaq doğulmamışdan qabaq ona münasibət formalaşır və bundan asılı olaraq hər bir cinsə-oğlan və ya qıza fərqli yanaşma meydana çıxır. Bunu ən azı uşağa qoyulan adlardan da görmək mümkündür. Hər kəs ilk doğulan qıza Qızyetər, Qızbəs və s. bu kimi adlar qoymur. Təbii ki, birinci qızın adı Aynur, Gültəkin, Arzu və s. olur. İkinci qıza da belə adlar qoyulur. Amma üçüncüdən sonra valideynlər narahat olmağa, prosesə müdaxilə etməyə başlayırlar. Əvvəlcə Kifayət, Qızbəsti, daha sonra Qızyetər və s. adlar qoyurlar.

Aydındır ki, bir neçə il valideynlərin Gültəkinlə Qızyetərə münasibətləri eyni olmayacaq. Biri əzizlənəcək, o birisinə laqeyd yanaşılacaq.

Bu gün böyüyən gənc nəsildə hansı keyfiyyətlərin formalaşdırılması son dərəcə vacib məsələlərdəndir. Gənc nəsil hansı keyfiyyətlərin daşıyıcıları olmalıdırlar? Bu sualların cavabları tapılmayınca, tərbiyə edənlərə, öyrədənlərə bu sahədə düzgün istiqamət verilməyincə xaotik vəziyyət davam edəcək, hər bir öyrədən, hər bir məktəb öz bildiyi, məqbul hesab etdiyi tərbiyə sistemi quracaq, keyfiyyətlər formalaşdırmağa cəhd edəcəkdir. Biz “cəhd edəcək” sözlərini əbəs yerə işlətmirik. Məlumdur ki, indi məktəblərdə şagird-müəllim münasibətləri o qədər də ürəkaçan deyildir. Şagirdlər daha çox müstəqillik, sərbəstlik istəyir, müəllimlər isə bunu

tədrisin, intizamın pozulması mənbəyi hesab edirlər. Nəticədə həm şagirdlər, həm müəllimlər, həm də valideynlər gərginlik keçirir, konflikt vəziyyətinə düşürlər.

Uşaq qəlbi həssas olur. O, böyüklərə inanır, etibar edir. Qadağa, təzyiq, təqib, inamsızlıq, cəza tərbiyə üsulu deyil. Bunlar uşaq qəlbini sındırır, ləyaqətini alçaldır. Onun insanlara inamı itir. Yerini qəddarlıq, qisasçılıq tutur. Lakin o hələ uşaqdır, helə gücsüzdür. Vaxtını, məqamını gözləyir. O, hələ böyüyür, güc toplayır. Qəddarlıq, qisasçılıq da onun qəlbində boy atır. Bəs, nə etməli? Burada çox da çətin bir şey yoxdur. Sadəcə sevin, sevgi ilə doldurun övladlarınızın, şagirdlərinizin qəlbini. Belədə o sizi sevəcək, özünü sevəcək, insanları sevəcək.

Eyni zamanda onu da bildirmək istərdik ki, çoxsaylı tellərlə bir-birilə bağlı olan tərbiyə işində birmənalı, qəti bir söz demək mümkün deyil. Amma onu deyə bilərik ki, tərbiyədə yeganə, düzgün bir yol var. Bu da sevgi, qayğı, hörmət və tələbkarlığın vəhdətidir. Sevin, hörmət edin, inam göstərin övladlarınıza, şagridlərinizə. Onlar sizi peşiman, məyus etməzlər.

Hələ tezdir, hələ uşaqdır deməyin. Bu çox təhlükəli yanaşmadır. Heç kəs fikirləşməsin ki, təhlükənin ona, onun ailəsinə dəxli yoxdur. Əgər ətrafda tək bircə təhlükə varsa, hesab edin ki, günlərin birində həmin təhlükə bu və ya digər şəkildə sizin də qapınızı döyə bilər.

***Rəyçi: prof. B.Əliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. Bayramov Ə.S., Əlizadə Ə.Ə. Sosial psixologiya. Bakı: Qapp – Poliqraf, 2003.
2. Əliyev R.İ. Psixologiya tarixi. Bakı: Nurlan, 2006 .
3. Əliyev R.İ. Tərbiyə psixologiyası. Bakı: Nurlan, 2006.
4. Əliyev R.İ. Etnopsixologiya: qloballaşma və millik. Bakı: Nurlan, 2007.
5. Ионин Л.Г. Социология культуры. М.: Лотос, 2000.
6. Хантингтон С. Столкновения цивилизации //Полис, 1994, №1.

**Р.Алиев**

**Социально-психологические проблемы гуманистического воспитания**

**Резюме**

В статье предлагается теоретически – исторический анализ, связанный с гуманистическим воспитанием. В условиях глобализации последуется проблемы деформации обычаев и традиций. Указывается, что при воздействии развития научно-технического прогресса, социальных сетей и телевидения у людей в особенности у подростков и молодежи меняется представления о взаимоотношениях и национальных ценностей. В связи с этим для формирования личности в системы образования требуется современные подходы

**R.Aliyev**

**Socio – psychological problems of humanism education**

**Summary**

Theoretical –historical analyses regerdingn humanism education are carried out in the articel. İt surveys the problems on customs – traditions deformation in the globalization condition. İt show that in the period accompanying influences by scientifically – technical progress, social webs and TV, you can see people’s, especially young people’s imagination shifts and changes about national values, mutual relations. Nevertheless it demands new treatments to the formation of personality in education system.

# ELMİ İDRAKDA VƏ MƏNƏVİ DƏYƏRLƏR SİSTEMİNDƏ İNSAN HƏYATININ MƏNASI PROBLEMİ



**Əziz Məmmədov,**
***Bakı Dövlət Universitetinin professoru, fəlsəfə elmləri doktoru***

**Siyavuş Talışlı,**
***Bakı Avrasiya Universitetinin professoru, fəlsəfə elmləri doktoru***



Məqalədə insan probleminin araşdırılması silsiləsində mühüm yer tutan və daima insan ruhunu düşündürən insan həyatının mənası problemi müxtəlif kontekstlərdə nəzərdən keçirilmişdir.

***Açar sözlər:*** *insan, mənəvi dəyərlər, həyatın mənası, həyat, ölüm, problem.*

***Ключевые слова:*** *человек, моральные ценности, смысл жизни, жизнь, смерть, проблема.*

***Key words:*** *human, moral values, meaning of life, life, death, problem.*

İnsan fenomeni ilə bağlı mühüm problemlərdən biri insan həyatının mənası və məqsədi məsələsidir. Bu insanın özü kimi əbədi, mühüm və həyati problem olmaqla, fəlsəfi antropologiyada mərkəzi yerlərdən birini tutur.

Özünə və onu əhatə edən dünyaya həmişə şüurlu yanaşmağı arzulayan və buna görə də yaşadığı həyatın mənasını daima arayan insan qarşısına fəlsəfi təmayüllü bir sıra suallar qoyur: insan kimdir? O, nə üçün və nəyin naminə yaşayır? İnsan həyatının mənası vardırmı, əgər vardırsa, o nədən ibarətdir? Həyatın mənası abstrakt məzmuna malikdir, yoxsa o, konkret səciyyə daşımaqla insanın unikal xarakteristikası kimi çıxış edir?

Müxtəlif fəlsəfi məktəblər bu sualların cavablını müxtəlif cür qiymətləndirmiş, bəzi təlimlər isə hətta həyatın mənasının olması fikrini qətiyyətlə rədd etmişlər. Sonuncuların söykəndikləri arqumentlərdən biri belə bir təsdiqdən ibarət olmuşdur ki, insan maddi obyektlərin növlərindən biri, onun həyatı isə materiyanın əbədi davam edən axarında mütəmadi baş verən doğulma, inkişaf və ölüm prosesidir. A.D.Akimenko-nun sözləri bu fikri daha sərrast ifadə edir: “Materiya hərəkət edir, hərəkət isə həmişə istiqamətlənir. Bu ilk mənbə və istiqamətin səbəbinin olması fərdin bir tam kimi mövcud olması səbəblərini, bununla da həyatın mənası və insanın vəzifəsi suallarını aradan qaldırır” (1).

Bu sahədə geniş yayılmış başqa bir arqument isə belə bir inama əsaslanır ki,

insanın həyatı başdan-başa şər və əziyyətlərdən ibarətdir. Halbuki, sağlam düşüncə tərzinə və zəngin həyat təcrübəsinə malik hər bir adama yaxşı bəllidir ki, şər adlanan bədxah əməllər heç bir vəchlə insan həyatının mənasını təşkil edə bilməz. Tanınmış rus filosofu V.S.Solovyev bu qəbildən olan baxışlara qiymət verərək yazırdı: "Onların mülahizələrini hərəkətləri ilə tutuşdurduqda bu qənaətə gəlmək olur ki, həqiqətən həyatın mənası vardır, onlar yalnız çərəziklikdən ona tabe olurlar, lakin onların ağlı bu mənanı dərk edə biləcək siqlətə malik deyil" (2). Ancaq filosoflar içərisində insan həyatının mənası haqqında bu cür düşünən təkcə Solovyev deyil, ümumiyyətlə keçmişin və çağdaş dövrün bir çox mütəfəkkirləri həyatın mənası məsələsinin tükənməz və əzablı elmi axtarışların predmeti saymışlar.

Həyatın mənası və məqsədi məsələsində materializmin nümayəndələri diqqəti həmişə obyektiv gerçəkliyə, insanların real həyat fəaliyyətinə, idealist və dini istiqamətin nümayəndələri isə allaha, əqlə, ruha, ideyalara doğru yönəltmişlər. Daimi diqqət çəkməsinə və bu sahədə mövcud nöqteyi-nəzərlərin bolluğuna baxmayaraq bu günün özünədək "Həyatın mənası nədir?" sualının birmənalı açıqlanmaması onun gələcəkdə də mütləq həll ediləcəyinə heç bir güman yeri qoymur.

İnsan nəslinin ayrıca bir fraqmenti olan konkret insan özünün şəxsiyyətini, insan ləyaqətini, daxili "Mən"ini dərk etmədən öz həyatının mənasını əsla dərk edə bilməz. Buna görə də həyatın mənasının qoyuluşu yalnız o zaman konkret məna kəsb edir ki, insan özünün "Mən"ini, öz şəxsi ləyaqətini dərk edərək həyatın obyektiv əhəmiyyəti məsələsi üzərində düşünməyə başlayır. Bəşər tarixinin hər bir dövrü cəmiyyət qarşısın pozitiv həlləri insan həyatının mənasını başa düşməyə imkan verən müxtəlif məsələlər qoyur. İnsanların maddi şəraitindən, sosial və mədəni tələbatlarından, cəmiyyətin sosial strukturundakı dəyişikliklərdən asılı olaraq onların həyatının mənası müxtəlif tarixi dövrlərdə müxtəlif cür başa düşülmüşdür.

Lakin bununla yanaşı həyatın bütün tarixi dövrləri və bütün insanlar üçün dəyişilməz qalan mənasının müəyyənləşdirilməsinə göstərilən təşəbbüslər də fəlsəfə və təbii elmi fikir tarixində az olmamışdır.

Həyatın mənası nədir? sualının başa düşülməsinə və onun həllinə filosoflar tarixən iki müxtəlif mövqedən yanaşmışlar: birincisi, ayrıca insanın fərdi şəxsiyyətinin həyatının mənası baxımından və ikincisi, bütövlükdə insan növünən, bəşəriyyətin həyatının mənası baxımından. Birinci mənada həyatın mənası fərdin mənəvi həyatının unikal sistemi kimi, ictimai dəyərlər sistemindən asılı olmayaraq onun özü üçün formalaşdırdığı keyfiyyət kimi başa düşülmüşlər.

Hər bir insana yaxşı məlumdur ki, digər canlı varlıqlardan fərqli olaraq o, özünün məxsusi həyatını dərk edir. Şüurlu varlıq olmaq etibarı ilə insanın öz həyatına və özünə olan münasibəti onun həyatının məna və məqsədində ifadə olunur. O, münasibət funksional səciyyə daşımaqla "sadəcə olaraq yaşayanlar üçün deyil", hər hansı ali məqsəd naminə yaşayanlar üçündür. Hər bir fərd həyatın mənasını özünün şəxsi mülahizələri, emosional və intellektual təcrübəsi sayəsində tərtib etdiyi iyerarxiya sxemi əsasında açıqlayır. Fikrimizə qüvvət vermək məqsədilə elmi yaradıcılıqda həyatın mənası məsələsində önəmli yer tutan fransız ekzis-

tensialisti Kamyunun (1913-1970) mövqeyinə nəzər salaq. "Şixaf haqqında mif" əsərində həyatın mənası məsələsini paradoksalcasına həll edən A.Kamyu təsdiq edir ki, dünya öz mahiyyətinə görə absurd olduğundan, onun həyatın mənasına inamı da absurd səciyyə daşıyır. Bununla belə o, həyatın mənasını inkar etməyərək onu insanın absurda qarşı qaldırdığı qiyamda görür. Kamyu absurd saydığı dünyada həyatın nə olması sualına cavab olaraq yazırdı:

"Gələcəyə etinasızlıq və verilmişlərin hamısının mənimsənilməsindən başqa heç bir şey həyatın mənasına inam insandan dəyərlər şkalası, seçmə, üstünlük vermə tələb edir. Tərifə görə absurda inam bizə tamamilə əks olan bir şey öyrədir. Öz həyatını, öz qiyamını, öz azadlığını yaşamaq tam şəkildə yaşamaq deməkdir. Həyata qiyməti bu qiyam verir" (4).

A.Kamyunun qənaətinə görə insanın yeganə məqsədi onun özüdür. O, yazırdı: "Mənim üçün heç bir fərqi yoxdur ki, bu həyat vulqardır, ya iyrənc, gözəldir, ya təsadüfə layiq". Burada izlənən başlıca məqsəd mümkün olan hər bir şeyi əldə etməkdir. Qeyd edək ki, A.Kamyunun mövqeyi digər ekzistensialist filosoflar üçün də səciyyəvi olmuşdur.

Onlar insan mövcudluğunun vəzifəsini, onun həyatının mənasını və məqsədini insanın öz həyatını necə yaşaması, şəxsiyyətin qiyamı, mübarizəsi, məhəbbəti, əziyyətləri, yaradıcılığı, özünü reallaşdırması uğrunda apardıqları səylərlə bağlayırlar. Əlbəttə, dialektik materialist mövqedən ekzistensialistlərin bu və ya digər müddəaları ətrafında istənilən qədər mübahisə aparmaq olar, ancaq belə bir fikirlə razılaşmamaq olmaz ki, həyatın mənası üzərində düşünən hər bir şəxs üçün o yalnız fərdi səciyyə daşıyır. Fərdin öz həyatının məqsəd və mənasını dərk etməsi mürəkkəb, ziddiyyətli və uzun sürən prosesdir. Tədqiqatlar göstərir ki, insanların heç də hamısı həyatın mənasını dərk etmir. Bu baxımdan şəxsiyyətin həyatının mənasının dərki onun ölçüləri və miqyası etibarı ilə onun mənəvi aləminin inkişaf göstəricidir.

Həyatın mənasının dərk olunması insanın öz həyatının mənasına çevirdiyi dəyərlərin, ideyaların mənimsənilməsi və qiymətləndirilməsi üzrə apardığı fasiləsiz işdir.

Həyatın mənası həm də insan nəslinin şüur fenomeni kimi mövcuddur. Onun axtarılması "həyatın mənasının" başa düşülməsinin ikinci aspekti ilə, bu sonuncu isə öz növbəsində insanın uzun sürən təkamül prosesi, onun təfəkkürünün reflektiv qabiliyyətinin inkişafı və özünüdərkin formalaşması ilə bağlıdır.

Həyatın mənasının dərkinin tarixən birinci forması dini təsəvvürlər olsa da, sonralar bu təsəvvürlərin müsafiri və opponenti kimi fəlsəfi təsəvvürlər irəli sürülmüşdür. İnsan həyatının abstrakt və ümumi axtarışlarında daha çox sədaqət nümayiş etdirən dini fəlsəfə həyatın mənasını insanın dini başlanğıca etiqadı ilə bağlayırdı. Rus dini fəlsəfəsinin tanınmış nümayəndələrindən olan V.S.Solovyev bu münasibətlə yazırdı: "Aydın məsələdir ki, həyatın mənası insan nəslinin saysız-hesabsız nümayəndələrinin ixtiyarı və dəyişkən tələbləri ilə üst-üstə düşə bilməz".

Göründüyü kimi, V.S.Solovyev insan həyatının mənəvi, fəlsəfi mənasını bir qədər başqa aspektdə anlamışdır. Solovyevin mövqeyi onun şəxsiyyət və cəmiyyətin nisbəti, onların mənafeyi və məqsədləri məsələsində daha qabarıq nəzərə çarpır. Onun fikrincə,

"şəxsiyyət və cəmiyyəti bir-birinə qarşı qoymaq olmaz, soruşmaq olmaz ki, bunların hansında məqsəd və yalnız məqsəd vardır"(2).

Dini fəlsəfədə həyatın mənası probleminin həllinin bariz nümunələrindən biri də rus filosofu S.L.Frankın konsepsiyasıdır. Frankın təbirincə dünya xaotik, mənasız və kor olduğundan onun ümumi axarının kiçik bir seli xatırladan olan insanın empirilik həyatının heç bir mənası yoxdur.

Böyük rus yazıçısı və mütəfəkkiri L.N.Tolstoy insan həyatının mənası və məqsədi məsələsi üzərində ən çox düşünən adamlardan biri olmuş və bu problemə həsr etdiyi üzücü düşüncələrinin yekunu olaraq belə qənaətə gəlmişdir ki, bunların hər ikisi şəxsiyyətin özünü təkmilləşdirməsindən başqa bir şey deyildir. Ölməz əsərlərində həyat həqiqətlərinin təkrarsız nümunələrini yaradan, insan psixologiyasının təsvirində heyrətamiz bacarıq və ustalıq nümayiş etdirən böyük yazıçı onu əhatə edən sosial mühitin müxtəlif yaradıcıları üzərində apardığı canlı müşahidələr əsasında belə qənaətə gəlmişdir ki, ayrıca bir şəxsiyyətin həyatının mənasını onun əhatəsində olduğu insanların həyatının mənasından kənarda axtarmaq düzgün sayıla bilməz. Başqa sözlə, Tolstoy insan həyatının mənasını yalnız bir insanın öz rifahı naminə yaşamasında görmürdü. O, cəmiyyətin və bəşəriyyətin rifahı naminə deyil, yalnız öz rifahı naminə yaşayanları ağılın iradəsinə tabe olmayan "heyvan şəxsiyyəti" adlandırırdı. Tolstoyun insan fenomeni haqqında güclü təsir qüvvəsinə malik ideyaları bu gün də aktuallığını saxlamaqdadır. Ancaq bununla belə demək olmaz ki, Tolstoy bu problemi axıradək həll edə bilmişdir. Onun aşağıdakı sözləri də fikirlərimizi təsdiq edl bilər: "insan üçün belə bir sirr hər zaman aydınlaşdırılmamış qalacaqdır ki, mən nə üçün yaşayıram? Bu sualın ağıllı cavabı yalnız birdir: Ona görə ki, bunu Allah istəyir. Bəs o bunu nə üçün istəyir? Bax, sirr elə burasındadır".

Əlbəttə, İnsan həyatının mütləq və ali məqsədi haqqında suala məntiqi cəhətdən tam əsaslandırılmış cavab vermək mümkün deyil. Çünki insan varlığının başlanğıc mənasını axtarmaq, hər şeydən əvvəl teoloji mövqedə durmaq və insana irəlicədən verilmiş məqsədlərin mövcudluğunu qəbul etmək deməkdir. Bu halda sözsüz ki, başqa bir sualla da qarşılaşacağıq: bu məqsədi kim müəyyənləşdirmişdir? Bu silsilə suallar aydın göstərir ki, həyatın mənası məsələsini nəzəri cəhətdən əsaslandırmaq mümkün deyil.

Bundan əlavə, həyatın mənası məsələsinin həlli Sokratın "özün-özünü dərk et" tezisinin reallaşdırılmasını da tələb edir. Bu da cavabı açıq qalan məsələlərdəndir. Bu sualın mütləq cavabının axtarılması əslində tükənməz olan həyatı prinsip etibarı ilə tükəndirmək deməkdir. Digər tərəfdən, burda Nitsşenin məşhur bir kəlamını öz-özünü dərk etmiş adam özünün cəlladıdır müddəasını da xatırlamaq yerinə düşərdi. Nəhayət, həyatın mənasını dərk etmək, həyatın həqiqi mənasını anlamaq, "biz nə üçün yaşayırıq" sualına cavab vermək üçün görünür ki, ölümün də mənasını dərk etmək və ümumiyyətlə mənası olmayan "biz nə üçün ölürük" sualına cavab axtarmaq lazımdır.

Doğrudan da, gec-tez hər bir adamın həyatında elə bir an gəlib çatır ki, o, öz varlığının sonlu olması barəsində düşünməyə başlayır. İnsan öz ölümünü dərk edən və onu özünün düşüncə predmetinə çevirməyə bacaran yeganə canlıdır. Labüd ölüm haq-

qında düşüncələrin yaratdığı güclü emosional sarsıntılar insan mənəviyyatının ən uzaq və dərin guşələrinə yayılaraq onun şüurunda silinməz izlər buraxır. Ölümün labüdlüyünü dərk edən, lakin bu zərurətlə barışmaq istəməyən hər bir insanda yaranan ilk reaksiya ümidsizlik və çaşqınlıq olur. Lakin öz iradəsi sayəsində o, bu hissə qalib gəldikdə belə, ömrünün qalan günlərini gec-tez baş verəcək labüd ölüm haqqındakı düşüncələrlə yaşayır. İnsan şüurunun ən dərin qatlarında kök salan və onun varlığına hakim kəsilən bu düşüncələr insanın sonrakı inkişafında və mənəvi təcrübəsində mühüm rol oynayır. Həyatın mənası və məqsədi məsələsinin kəskinliyi və aktuallığı insanın mənəvi təcrübəsində belə bir biliyin olması ilə bağlıdır. Bu suallar üzərində qurulan düşüncələr müxtəlif səviyyələrdə – cəmiyyətdə, əmək kollektivlərində, ailədə, dostların əhatəsində insanın əsas həyat xəttinin müəyyənləşdirilməsinin çıxış nöqtəsini təşkil edir. Bu «xəttdən» kənara çıxma halları isə onun həyat fəaliyyətində əzablı əxlaqi çarpışmalara, bu xəttin ümumiyyətlə itirilməsi isə insanın mənəvi, hətta fiziki məhvinə səbəb ola bilər. Hər bir şəxsiyyətin fərdi həyatının məqsədi və mənası bütün bəşəriyyət tarixinin, insanın yaşayıb yaratdığı cəmiyyətin məqsəd və mənası ilə müəyyən olunan sosial ideyalar ilə bağlıdır. Öz həyatında müəyyən mənəvi məqsədləri rəhbər tutan insan onları reallaşdırmaq üçün adekvat vasitələrdən istifadə etdiyi bütün hallarda yaxşı başa düşür ki, arzu olunan nəticəni heç də həmişə xeyir, həqiqət, ədalət və s. mənəvi kateqoriyalar ilə ifadə etmək mümkün olmur. Buradan isə belə bir sual doğur: bu, o demək deyildirmi ki, onun yeganə və təkrarsız həyatı hansı bir ölçüdə isə cəmiyyətdə məqsədsiz, mənasız, mənəviyyatsız ömür sürən və ətrafında yalnız yalan, şər, ədalətsizlik, səfalət törədən yaramaz insanların həyatı ilə bərabər tutulur? Bu sual ona görə xüsusi əhəmiyyət kəsb edir ki, hər bir adamın həyatı sonlu zaman kəsiyində mövcud olub nə zamansa, harada isə labüd baş verən ölümün gözlənilməz gəlişi ilə sona çatır. Buna görə də onun xeyir və şər, həqiqət və yalan, ədalət və ədalətsizlik kimi mənəvi etik kateqoriyalarla təmin olunması öz mənasını itirmirmi? İnsan varlığında hər şey ötəri olduğu halda, görəsən qeyri varlıqda doğrudanmı hamı bərabərləşir? Adamlar insan varlığının mənəvi əsaslarının məhvinə doğru istiqamətlənən bu cansıxıcı ziddiyyətlərdən həmişə çıxış yolu axtarmış və onu əvvəlcə "ruhun ölməzliyi" və "axirət dünyası" haqqında dini postulatlarda, sonlara isə insan mövcudluğunun mənəvi əsaslarını təşkil edən "mütləq ideya", "mütləq zəka", "mütləq mənəvi dəyərlər" haqqında obyektiv idealist fəlsəfi təsəvvürlərdə tapmışdır. Əbədi həyat sevdasına düşən orta əsr əlkimyaçılarının əsrlər boyunca möcüzəli "həyat iksiri" axtarışları da insanın həyat eşqindən, yaşamaq həvəsindən xəbər vermişdir. Lakin əbədi həyatın sirri tapılmamışdır.

Yer həyatının sonlu olmasını dərk edən və öz qarşısına həyatın mənası haqqında müxtəlif suallar qoyan hər bir insan özünün həyata və ölümə münasibətini aydınlaşdırmağa çalışır. İnsan üçün son dərəcə önəmli olan bu məsələ bəşər mədəniyyəti tarixində mərkəzi yerlərdən birini tutur. Bəşər mədəniyyəti tarixi insan həyatının mənası ilə onun ölüm sirrinin açılması arasındakı əlaqənin araşdırılması, insanın əbədi yaşamaq cəhdi, onun ölümə fiziki olmasa da mənəvi qələbə çata bilməsi sirrləri üzərində yüksələn fikirlərlə zəngindir. Bu sualın cava-

bının araşdırılması isə keçmişdə mifologiya və müxtəlif dini təlimlər, indi incəsənət və fəlsəfi istiqamətlər məşğul olmaqdadır. Məsələnin müəyyən həllini insana diktə edən müxtəlif mifoloji və dini təlimlərdən fərqli olaraq ehkamçı olmayan fəsləfi istiqamətlər bu məsələnin həllində belə bir mövqedə dayanırlar ki, insan həmin sualın cavabını müstəqil axtarmaq üçün və bunun üçün özünün əqlə və zəkaya əsaslanan şəxsi imkanlarından, bacarıq və vərdişlərindən, empirik və intellektual təcrübəsindən səmərəli istifadə etməlidir. Həmin məsələnin araşdırılmasında elmi prinsipin ardıcıl həyata keçirilməsi insanın “axirət həyatına” heç bir ümid yeri qoymayaraq onun fiziki ölməzliyi imkanını rədd edir. Beləliklə, elmi-nəzəri dünyagörüşünü şüurlu surətdə qəbul edən hər bir adam şəxsi cəsarət və mənəvi qüvvə tələb edən çətin bir addımı ataraq özünə təsəlli tapmaq imkanlarından imtina edir. Bu addım bir də ona görə çətinləşir ki, insanın ömür boyu topladığı zəngin mənəvi təcrübə uzun müddət dini sistem çərçivəsində dərk olunmuş və onun mənəvi dəyərlərini əsaslandıran bilikləri isə hər bir insanı  ölümdən sonra gözləyən məhkəmə və axirət dünyasına istinadən götürmüşdür. Beləliklə, müasir elm və dialektik fəlsəfə nəinki həyat, ölüm və ölməzliyin mənası haqqında məsələni aradan qaldırır, əksinə məsələnin humanist məzmununu açmaqla onu daha kəskin, hətta dramatik bir formada irəli sürür.

Həyatın mənası, ölüm və insanın ölməzliyi haqqında məsələnin həllinə marksizim fəlsəfəsinin nöqteyi-nəzəri də xüsusi əhəmiyyət kəsb edir. Marksizm sözü gedən problemlərlə, hər şeydən əvvəl, insan həyatının dəyərləri və məqsədləri baxımından yanaşaraq belə bir arqumenti əsas götürür ki, hər bir fərdə və şəxsiyyətə özözlüyündə deyil, tamın – yəni insan cəmiyyətinin hissəsi kimi baxılmalıdır. K.Marks hələ özünün erkən əsərlərində qeyd edirdi ki, fərd ictimai varlıq olduğu üçün onun həyatının hər cür təzahürünə ictimai həyatın özünün təzahürü və məqsədi kimi baxılmalıdır.

İnsan digər canlı varlıqlardan, hər şeydən əvvəl, bununla fərqlənir ki, o bütün fərdi həyatı boyunca özünün tarixi həyat məqsədlərinə heç bir zaman çata bilmir və bu mənada o, öz-özünü reallaşdıra bilməyən adekvat varlıq olaraq qalır. Marksın təbirincə desək, “həyatın özü üçün vasitə olduğu” situasiyalar insanı heç cür təmir etmir. Buna görə də, hər bir insanın həvəsi, meyili, vəzifəsi özünün bütün qabiliyyətlərini hərtərəfli inkişaf etdirməkdən, bəşəriyyətin mədəniyyət tarixinə və cəmiyyətin tərəqqisinə özünün şəxsi töhfəsini verməkdən ibarətdir.

Şəxsiyyətin cəmiyyət vasitəsilə reallaşdırdığı həyatın mənası məhz bundan ibarətdir. İnsan həyatının əsl mənası yalnız fəaliyyət prosesində açılır. M.Qorki çox haqlı olaraq yazırdı ki, mən həyatın mənasını labüdsüz və geniş üfüqlərə malik yaradıcılıqda görürəm. İnsan həyatının mənasını onun dəyərlərinin bu cür başa düşülməsi insanın sosial mahiyyəti haqqında təlimə əsaslanır. L.N.Tolstoy bu barədə yaxşı demişdir: “insan özünə həm heyvanlar içərisində bu günü ilə yaşayan heyvan kimi, həm də ailənin və əsrlərdən bəri mövcud olan cəmiyyətin, xalqın bir üzvü kimi, həm də sonsuz zaman müddətində yaşayan hüdudsuz dünyanın bir hissəsi kimi baxa bilər. Buna görə də ağıllı insan onun hərəkətlərinə təsir göstərə biləcək sonsuz kiçik həyat hadisələrinə nəzərən riyaziyyat-

da inteqrallanma adlanan hər şeyi etməlidir və bunu etmişdir, başqa sözlə, o özünə yaxın həyat hadisələri ilə yanaşı bir tam kimi qəbul etdiyi zaman və məkan etibarı ilə sonsuz dünyada da öz münasibətini bildirməlidir".

Tolstoyun ölüm və ölümsüzlük məsələlərinə münasibəti də xeyli maraq doğurur. Tolstoy yaradıcılığından qırmızı xətlə keçən insanın bioloji ölümünün labüdlüyü məsələsi onun mənəvi ruhu ölməzliyi ideyası ilə qırılmaz surətdə bağlı olmuşdur. O, yazırdı ki, "ölüm yalnız özünün şəxsi tənha həyatının mənasız və puç olduğunu görməyənlər və özlərinin ölməyəcəyini düşünən insanlar üçün qorxunc görünə bilər. Bütün başqa adamlar kimi mən də öləcəyəm, lakin mənim həyatımın və ölümümün həm özüm üçün, həm də hamı üçün mənası olacaqdır".

Tolstoy həyatın mənəvi mənasını ölümə də şamil edərək belə bir qənaətə gəlmişdir ki, "insan ölsə də onun dünyaya münasibəti insan həyatda olduğundan dəfələrlə daha güclü təsir edir, zəka və məhəbbətdən asılı olaraq bu təsirin gücü daima artmaqda davam edir".

Beləliklə, həyatın mənası və məqsədi məsələsi üzrə aparılan fəlsəfi araşdırmalar göstərir ki, müxtəlif tarixi dövrlərdə həyatın mənası müxtəlif cür təzahür etmiş və o fərdin dünyagörüşü yönümündən əhəmiyyətli dərəcədə asılı olmuşdur. Cəmiyyətin inkişafı gedişində həyatın mənası məsələsi yeni-yeni cəhətlər kəsb edərək ictimai münasibətlərin tipindən və formasından asılı olaraq hər bir dövrdə demək olar ki, tamamilə başqalaşmışdır.

İnsan həyatının mənası fəaliyyətin müxtəlif növlərində – əməkdə, tərbiyədə, ailə həyatında, elmi və incəsənətlə məşğuliyyətdə və s. də açıqlanır. Həm də bu halda əmək və istehsal heç də məqsəd olmayıb, hər bir adamın özünün bacarıq və imkanlarını, istedadının təzahürü üçün zəruri şərt və real əsasdır. Qeyd etmək lazımdır ki, əgər insan fəaliyyətinin əsasını qabaqcıl əxlaqi prinsiplər təşkil etmirsə, o əhəmiyyətli ictimai ideyalarla ilhamlanmırsa öz-özlüyündə nə əmək, nə də məşğuliyyət insan həyatının mənasını təyin etmək üçün kifayət etməyəcəkdir. İnsan həyatının nisbətən dərin mənası ondadır ki, hər bir fərd digər insanların mənafeyi naminə öz şəxsi imkanlarını inkişaf etdirmiş olsun.

Ölüm problemi nə qədər mühüm olsa da, onu həyat problemindən ayrı düşünmək olmaz. Həyat və ölüm bir-birini inkar etsələr də, bu inkar mütləq deyil, yalnız nisbi səciyyə daşıyır. Zira ölüm orqanizmin həyat fəaliyyətinin zəruri və immanent momenti, onun qanuna uyğun və təbii nəticəsidir. Həyatın son məqamı insanı fəaliyyətə, bu günün işini sabaha qoymamaq, özünün bacarıq və qabiliyyətlərini üzə çıxarması, qüvvələrini səfərbərliyə almaq və onlardan optimal və məqsədyönlü istifadə etməyə səsləyir. Labüd ölüm qarşısında insan həyatı öz pozitiv mənasını heç vaxt itirmir. İnsan müdrikliyi onun ölüm haqqındakı fikirləri ilə deyil, həyat barəsindəki sağlam düşüncələri ilə müəyyən olunur. Böyük yunan filosofu Epikur təsdiq edirdi ki, "ölüm insan üçün heç də dəhşətli deyil, çünki biz mövcud olduğumuz müddətdə ölüm hələlik yoxdur, o gəldikdə isə artıq biz olmayacağıq". Bu baxımdan L.N.Tolstoyun "ölümdən qorxursunuzmu?" sualına cavab çox ibrətamizdir: "insan həyatı şüurdur; nə qədər ki, mənim şüurum var, mən ölməyəcəyəm, şüurum olmadıqda isə artıq heç nəyin mənim üçün əhəmiyyəti olmayacaqdır".

Bütün yuxarıda deyilənlər belə nəticə çıxarmağa əsas verir ki, həyatın mənası və

məqsədi məsələsinə mütləq inkarı mövqedən yanaşmaq və onu cəfəngiyyat bir şey adlandırmaq olmaz. Ayrıca bir şəxsiyyətin həyatına tətbiq edildikdə bu məsələnin real mənası və əhəmiyyəti, əlbəttə, böyükdür. Bundan əlavə, əgər hər bir adam bu suala özü üçün cavab axtarmasa idi, o halda insanın özünün mövcudluğu da mənasız bir şeyə çevrilərdi. Bu baxımdan Dostoyevski çox gözəl demişdir ki, əgər insan nə üçün yaşadığını bilməsə idi, o heç bir vəchlə yaşamağa razı olmazdı, hətta onun bütün ətrafı çörək olmuş olsaydı belə, o yenə də yaşamağa razı olmazdı və özünü məhv edərdi. Nitsşenin aşağıdakı sözlərinin dərin mənası və müdrikliyi insanın öz həyatının məqsədinə olan inamının əhəmiyyətindən xəbər verir: "nə üçün yaşadığını bilən adam hər cür çətinliyə tab gətirə bilər". Bu baxımdan V.Franklin işləyib hazırladığı loqoterapiya konsepsiyası mühüm nəzəri və praktiki əhəmiyyət kəsb edir. Bu yeni konsepsiyada izlənən başlıca məqsəd həyatın mənasının başa düşülməsində insanlara yaxından kömək etmək və bununla da onların ruhunu sağlamlaşdırmaqdır. Bu məsələ öz-özlüyündə çox mühüm bir məsələdir, belə ki, həyatın mənası insanın nəzərdə tutduğu müəyyən məqsədin inkişaf etdirilməsindən, onun hərtərəfli təkmilləşdirilməsindən ibarətdir.

İnsan problemi ilə bağlı xüsusi aktuallıq kəsb edən fəlsəfi məsələlərdən biri də "insan nə qədər, necə və nəyin naminə yaşamalıdır?" sualı ilə bağlıdır.

İnsana belə bir yanaşma üsulu sosial və mənəvi əsaslardan çıxış edərək insan həyatının sürəkliliyinə və onun uzadılması imkanlarına yeni rakursdan yanaşmağa əsas verir.

İnsan nə qədər ömür sürə bilər? Bu sualı konkret cavablandırmaq üçün insan həyatının sürəkliliyi məsələsinə üç istiqamətdən – bioloji, sosial və mənəvi baxımdan yanaşmaq lazımdır. Sırf mənəvi (humanizm) baxımından insan həyatının sürəkliliyini qənaətbəxş saymaq olar; sosial baxımdan isə onun uzadılması zəruridir. İnsan həyatının bioloji sürəkliliyinə gəldikdə isə hazırda onu xüsusi üsullarla maksimum uzadılmasına çalışırlar. Həyatın uzadılmasının rəngarəng süni üsullarının (transplantasiya, texniki bionika, mikrobiologiya, gen mühəndisliyi və s.) kəşf edilməsi ilə əlaqədar hazırda belə bir fikir söylənilir ki, bəşəriyyət təbabətin nailiyyətləri sayəsində "Homo Sapisen"in (zəka adamı), "Homo lonqevusus"a (uzun ömürlü adam) çevrilməsi ərəfəsindədir. Üzərində tibb elminin ciddi axtarışlar apardığı həmin proses qadın və kişilərə hətta ixtiyar yaşlarında belə özlərinin əqli və fiziki gümrahlıqlarını qoruyub saxlamaq imkanı verəcəkdir. Bu isə göstərir ki, yaxın gələcəkdə alimlər həyata yeni kəşflərlə baxmalı olacaqlar.

Qeyd etmək vacibdir ki, həyatın bu yeni görünüşünü humanist ideallarla dəyərlər fonunda təşkil olunması zamanı belə bir məsələ dəqiqləşdirilməlidir ki, insan məhz nə üçün uzun ömür sürməli və şəxsiyyətin fərdi xüsusiyyətlərinə uyğun gələn normal yaş parametrləri hansı səbəblərlə şərtlənməlidirlər? Sosial şərtlərdən asılılığı şübhə doğurmayan bu şəxsi məqsədlər öz növbəsində həmin sosial şərtlərə əks təsir göstərərək bioloji, sosial, etik və humanist cəhətlərin dialektikcəsinə birləşdiyi insan həyatının vaxt ölçüsünü təyin etməyə imkan verir. Həmin ölçü insan qüvvələrinin mahiyyətinin optimal reallaşdırılması imkanları ilə möhkəm bağlıdır. Ancaq bununla belə elm və cəmiyyət üçün, xüsusilə

insanın özü üçün onun yalnız fərdi həyatının sürəkliliyi deyil, həm də təbiətinin zənginliklərinin inkişafı, bəşəriyyətin kollektiv həyatına aidiyyəti dərəcəsi, ictimai varlıq olmaq etibarı ilə insanın qeyri-məhdud inkişaf etdirilə bilməsi ideyasının reallaşdırılmasında iştirakı, insan həyatının bioloji imkanları ilə uzlaşan fərdi parametrləri də önəmli əhəmiyyət kəsb edəcəkdir.

Real fəlsəfi humanizm insan həyatının fərdi, şəxsi və ümumbəşəri, sosial parametrlərdə mənasını müəyyən edən belə ideallar az məlum deyil. Bu ideal isə insan varlığında bioloji və sosialın, sonlu və sonsuzun, ölüm və ölməzliyin dialektik vəhdətini təsdiq etməklə bəşəriyyətin maddi və mənəvi mədəniyyətində tutduğu yerə və onun mahiyyətinə tam uyğun gəlir. İnsanın həyatda ən böyük qisməti, onun yer üzərində həyatın və zəkanın qorunub saxlanılmasında ən ağır məsuliyyəti məhz bundan ibarətdir. İnsanda ağıl və humanizmin potensialının tam reallaşması üçün görünür bəşəriyyətə yüz və hətta min illər lazım olacaqdır. Bu isə artıq insanın həqiqi zəka və humanizm cəmiyyətində həqiqi tarixi olacaqdır.

Lakin yaşadığı ictimai münasibətlər sistemindən, zaman kəsiyi və məkan hissəsindən asılı olmayaraq yaşamaq və yaratmaq eşqi insanı heç zaman tərk etməyəcəkdir. Biz insan problemi üzrə apardığımızhəyatının mənası üzrə mülahizələrimizə zəmanəmizin görkəmli yazıçısı Nobel mükafatı laureatı Qabriel Qoosia Markesin aşağıdakı sözləri ilə nöqtə qoymaq istərdik: “Ölümün əbədiliyi mənə ağır gəlir və inanın ki, yenidən əlli yaşında olmaq üçün Nobel mükafatını da geriyə qaytarardım. Kaş hər şey yenidən başlanaydı”.

***Rəyçi: prof. F.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Psychology today. 1974, № 6, p. 90-93.

2. Norris D. The Maked Ape: A zoologiat stady of the Human Animal, 1969.

3. Lederberg J. Genetics of Human Socia Beseach 1983, v 40, № 3, 375-406 p.

4. Renchlin M. La psyhologite differentielle. P. 1974.

**А.Мамедов,**
**С.Талышлы**

**Проблема человеческой жизни в научном познании и в системе нравственных ценностей**

**Резюме**

В статье раскрывается сущность смысла человеческой жизни в разных контекстах, которая занимает важное место в изучении человеческих проблем.

**A.Mammadov,**
**S.Talishli**

**The problem of human life in scientific cognition and moral values system**

**Summary**

The essence of the meaning of human life, which occupies an important place in the study of human problems and always suggests human spirit, has been examined in different contexts.



# TƏHSİLDƏ KEYFİYYƏT ƏSAS DEVİZİMİZDİR

**Nizami Namazov,**
***Sumqayıt Şəhər Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *ümumi orta təhsil, təmayüllü siniflər, qiymətləndirmə, müsabiqələr.*

***Ключевые слова:*** *общее среднее образование, классы соответствия, оценка, соревнования.*

***Key words:*** *general secondary education, correspondence classes, evaluation, competitions.*

Ölkəmizdə iqtisadi və sosial siyasətin bütün sahələrində, o cümlədən elm və təhsildə güclü tərəqqiyə nail olunub. Bu işdə Sumqayıt şəhəri təhsil işçiləri də əməyini əsirgəməmiş, bütün pedaqoji kollektivlərin məsuliyyətini artırmaqla, onların fəaliyyətində ciddi dönüş yaradılmasına, nailiyyətlərin daha da artmasına səylə çalışmışdır.

Ötən dərs ilində Sumqayıt şəhər ümumtəhsil məktəblərində 1872 sinif komplektində 47545 şagird təhsil almışdır. Bu əvvəlki dərs ili ilə müqayisədə şagird sayının 2000 nəfərdən çox artması deməkdir.

İbtidai təhsil səviyyəsində (I-IV siniflərdə) 21915 nəfər şagird təhsil almışdır. Onlardan 7068 nəfəri dərs ilini "əlaçı", 9796 nəfəri isə "4" və "5" qiymətlərlə başa vurmuşdur.

2016/2017-ci dərs ilinin IX sinif məzunları üçün buraxılış imtahanları məzmun və formaca yeni qaydalara əsasən təşkil edilmişdir. Ümumi orta təhsil səviyyəsində keçirilən buraxılış imtahanlarının nəticələri respublika üzrə ən yaxşı göstəricilərdəndir. Şəhər üzrə imtahanda iştirak edən 3671 nəfərdən 3081 nəfəri, yəni iştirakçıların təxminən 84%-i müsbət qiymət almışdır.

Şəhərin XI sinif üzrə buraxılış imtahanında iştirak etmiş 2600 nəfər şagirddən 2234-ü hər üç imtahan fənnindən müsbət qiymət almışdır ki, bu da şəhər üzrə müvəffəqiyyət faizinin təxminən 86% olması deməkdir. Ötən illə müqayisədə müvəffəqiyyət faizi 4% artmışdır.

Azərbaycan Respublikası təhsil nazirinin 08.06.2017-ci il tarixli 129 nömrəli əmri ilə təsdiq edilmiş "Ümumi orta təhsil haqqında və tam orta təhsil haqqında fərqlənmə attestatlarının verilməsi Qaydası"na əsasən ötən dərs ilində ilk dəfə olaraq XI sinif məzunlarına da fərqlənmə attestatı ilə təltif olunmaq imkan yaranmışdır. 2016/2017-ci dərs ilinin yekununda 103 nəfər XI, 68 nəfər IX sinif məzunu fərqlənmə attestatına layiq görülmüşdür.

2017-ci ildə Sumqayıt şəhəri ümumtəhsil məktəblərini 2550 nəfər XI sinif şagirdi başa vurmuş, Dövlət İmtahan Mərkəzinin məlumatlarına əsasən onlardan

2080 nəfəri ali məktəblərə sənəd vermişdir.

İlkin təhlillərə əsasən ali məktəblərin I-IV ixtisas qruplarına sənəd verən 2267 nəfərdən 1403-ü, yəni abituriyentlərin təxminən 69%-i tələbə adını qazanmışdır. Bu, şəhər üzrə ötən ilin qəbul faizi ilə müqayisədə xeyli yüksək olması ilə yanaşı, respublika üzrə ən yüksək göstəricilərdən biridir.

Qəbul imtahanları zamanı digər keyfiyyət göstəricilərinin də əvvəlki illərə nisbətən yüksəlməsi müşahidə edilmişdir. Belə ki, şəhər üzrə abituriyentlərin topladıqları orta bal 345,4 bal təşkil etmişdir. Bu şəhərin ötənilki analoji göstəricisi ilə müqayisədə 55,6 bal və ya 19% çoxdur.

Qəbul imtahanlarında iştirak edən məzunların (I-IV qruplar üzrə) 411 nəfəri, yəni məzunların 22%-i 500-dən, o cümlədən 167 nəfər 62 nəfəri 650-dən yuxarı bal toplamışdır.

Təbiət elmləri təmayüllü gimnaziyanın məzunu Eldar Əfəndiyev isə qəbul imtahanında maksimum nəticə göstərərək 700 bal toplamışdır. 8 məzunumuz ali məktəblərə qəbul zamanı yüksək bal topladığına görə Prezident təqaüdünə layiq görülmüşdür.

Ötən dərs ili Sumqayıt təhsilinin, istedadlı şagirdlərimizin bir sıra beynəlxalq və respublika əhəmiyyətli yarış və müsabiqələrdə uğurlu iştirakı ilə də yadda qalmışdır.

Nazirliyin müvafiq əmrinə uyğun olaraq V-VI sinif şagirdləri arasında riyaziyyat, fizika, kimya və biologiya fənlərindən fənn müsabiqəsi keçirilmişdir. İyunun 17-də keçirilən Respublika final mərhələsində ümumtəhsil məktəblərimizi təmsil edən 15 şagird mükafata layiq yerlər tutmuş, şəhərimiz isə komanda hesabında Respublikada birinci olmuşdur.

2016-cı ilin dekabrında İndoneziyanın Bali şəhərində keçirilən və dünyanın 48 ölkəsindən məktəblilərin iştirak etdiyi yeniyetmələrin 13-cü Beynəlxalq Elm Olimpiadasında (İJSO) Sumqayıt şəhərin-dəki Təbiət elmləri təmayüllü gimnaziyanın şagirdi Günel Həsənova, “İstedad” liseyinin şagirdi Şəbnəm Nəbizadə ölkəmizi uğurla təmsil edərək, bu mötəbər bilik yarışının bürünc medallarını qazanmışdır.

Ənənəvi olaraq keçirilən və dərs ilinin ən yaddaqalan hadisələrindən hesab edilən Respublika fənn olimpiadalarının məktəb turu kütləviliyi ilə seçilmiş, istedadlı məktəblilərinin obyektiv seçimi təmin edilmişdir. 22 aprel 2017-ci il tarixində keçirilən Respublika final turunda ümumtəhsil məktəblərimizin 21 şagirdi qalib olmuşdur.

15-17 fevral tarixlərində Bakı şəhərində “Sabahın alimləri” VI Respublika müsabiqəsi keçirilmiş, müsabiqənin yekunlarına əsasən şəhərin ümumtəhsil məktəblərinin IX-XI sinif şagirdlərindən 6 nəfəri 4 nominasiya üzrə qalib adına layiq görülmüşdür.

Ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü ilə əlaqədar ümumtəhsil məktəblərinin şagirdləri arasında “Ən yaxşı təqdimat” müsabiqəsinin keçirilməsi barədə təhsil nazirinin əmrinə müvafiq olaraq şəhərin bütün ümumtəhsil məktəblərinin IX-XI sinif şagirdləri arasında ulu öndər Heydər Əliyevə həsr olunmuş iki mərhələdən ibarət “Ən yaxşı təqdimat” müsabiqəsi keçirilmişdir. Müsabiqənin final mərhələsində şəhərimizi uğurla təmsil etmiş 5 nömrəli tam orta məktəbin XI sinif şagirdi Qönçə Abbasova III yerə, Təbiət elmləri təmayüllü gimnaziyanın XI sinif şagirdi

Aytac Əliyeva isə IV yerə layiq görülmüşdür.

Azərbaycan Uşaqlarının IV Forumu çərçivəsində keçirilən bilik yarışmasında iştirak etmiş Sumqayıt şəhərinin Təbiət elmləri təmayüllü gimnaziya, Texniki və təbiət elmləri liseyi, 11 və 31 nömrəli tam orta məktəblərinin yuxarı sinif şagirdlərindən ibarət komandası Respublka final turunda yüksək nəticə göstərərək yarışmanın qalibi olmuşdur.

Aprel döyüşləri hərb salnaməmizin əhəmiyyətli əks-hücum əməliyyatları kimi Azərbaycan hərb tarixində şərəfli yer tutur. Bununla bağlı çoxlu sayda tədbirlər keçirilmişdir.

Ötən dərs ilindən başlayaraq təhsilimizdə tətbiq edilən mütərəqqi yeniliklərdən biri də ümumtəhsil məktəlrində 5 yaşlı uşaqlar üçün dövlət hesabına məktəbəhazırlığın təşkil olunmasıdır.

Sumqayıt Şəhər Təhsil Şöbəsində 2017/2018-ci dərs ilində tam orta təhsil pilləsində tədrisin təmayüllər üzrə təşkili istiqamətində bir sıra işlər görülmüşdür.

Növbəti dərs ilindən X siniflərdə təmayül siniflərinin yaradılması üçün son bir neçə ay ərzində məktəblərlə aparılan işlərin nəticəsi olaraq 40 məktəbdə, yəni ümumtəhsil məktəblərinin 83%-dən çoxunda təmayül siniflərinin yaradılması nəzərdə tutulmuşdur.

13 məktəbdə yalnız təmayül siniflərinin, 27 məktəbdə isə həm təmayül, həm də adi siniflərin açılması planlaşdırılır. Ümumilikdə 87 təmayül sinfi, o cümlədən 32 kombinə edilmiş təmayül siniflərinin fəaliyyətə başlaması nəzərdə tutulub.

2015/2016-cı dərs ilində Sumqayıt şəhəri üzrə 4000 nəfərə yaxın müəllim diaqnostik qiymətləndirmədə iştirak etmişdir.

Sumqayıt təhsil işçiləri 2017/2018-ci dərs ilinin "Ümumi təhsildə keyfiyyət ili" elan edilməsi ilə əlaqədar məsuliyyəti dərk edir və təhsilin inkişafı, şəffaflığı, keyfiyyəti və peşəkarlığın yüksəldilməsi istiqamətində böyük əmək sərf edirlər.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. H.Əliyev. Təhsil millətin gələcəyidir. Bakı, 2002.
2. Təhsilin konseptual problemləri. Bakı, 2008.
3. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. Bakı, 2009.

**Н.Намазов**

**Качество обрзования - наш главный девиз**

**Резюме**

В статье рассматриваются достижения в области образования в Сумгаите. Упоминаются советы по развитию образования. Приводятся образцы работ, выполненных в области образования в городе.

**N.Namazov**

**Quality of education is our main motto**

**Summary**

The article examines the achievements in the field of education in Sumgait. Tips for the development of education are mentioned. Sample works performed in the field of education in the city are given.



# NAİLİYYƏTLƏRİMİZ BİZİ ARXAYINLAŞDIRMIR

**Əjdər Kərimov,**
***Neftçala Rayon Təhsil Şöbəsnin müdiri***

***Açar sözlər:*** *keyfiyyət göstəriciləri, texniki istiqamətli təmayüllü siniflər, diaqnostik qiymətləndirmə, məktəb şəbəkəsi.*

***Ключевые слова:*** *показатели качества, классы технической ориентации, диагностическая оценка, школьная сеть.*

***Key words:*** *quality indicators, technical orientation classes, diagnostic evaluation, school network.*

Ölkəmizdə prioritet sahələrdən biri olan təhsilin inkişafına ardıcıl diqqət yetirilir, gənc nəslin biliklərə mükəmməl yiyələnməsi üçün hər cür şərait yaradılır.

Neftçala rayonunda 50 ümumtəhsil məktəbi, o cümlədən 28 tam orta ( onlardan biri hümanitar təmayüllü liseydir), 16 ümumi orta, 6 ibtidai məktəb, 1 İnteqrasiya təlimli internat tipli gimnaziya, 1 məktəbdənkənar tərbiyə müəssisəsi, 1 peşə liseyi, 16 məktəbəqədər təhsil müəssisəsi fəaliyyət göstərir. Rayonda fəaliyyət göstərən 50 məktəbin 47-si bir növbəli və 5 günlük iş həftəsilə, 3-ü iki növbəli və 6 günlük iş həftəsilə işləyir.

Rayonumuzda Təhsil Strategiyasından irəli gələn bir sıra yeniliklər həyata keçirilmişdir. Bunlardan biri məktəbəhazırlıq qruplarının təşkilidir. Belə ki, 2016-2017-ci dərs ilində 5 yaşı dekabr ayının 31-dək tamam olan 1413 uşaqdan 635 nəfəri (45%) rayonun 28 ümumtəhsil məktəbində məktəbəhazırlıq qruplarına cəlb edilmişdir. Yeni dərs ilində isə 2012-ci ildə doğulmuş 1052 nəfər uşaqdan 692 nəfərinin (66%) məktəbəhazırlıq qruplarına cəlb olunması nəzərdə tutulmuşdur.

“Tam orta təhsil səviyyəsində təhsilin təmayüllər üzrə təşkil olunduğu pilot məktəblərin şəbəkəsinin genişləndirilməsi haqqında Azərbaycan Respublikası təhsil nazirinin əmrinə əsasən 2016/2017-ci tədris ilində şəhər 1 nömrəli tam orta məktəbində texniki fənlər üzrə, şəhər 4 saylı və Aşağı Surra kənd tam orta məktəblərində humanitar fənlər üzrə təmayül siniflər yaradılmışdır.

2017-2018-ci dərs ilində isə şəhər 1 nömrəli tam orta məktəbində humanitar, texniki-riyaziyyat-iqtisadiyyat, şəhər 4 nömrəli tam orta məktəbində texniki, Bankə qəsəbə 1 nömrəli tam orta məktəbində riyaziyyat-iqtisadiyyat-humanitar, Aşağı Surra kənd tam orta məktəbində riyaziyyat-iqtisadiyyat-humanitar və Qədimkənd kənd tam orta məktəbində texniki istiqamətli təmayül siniflərin açılması planlaşdırılmışdır.

Ümumilikdə, 6 təmayüllü sinifdə 135 nəfər, 23 tam orta məktəbin adi siniflərində isə 382 nəfər şagirdin X sinifdə təhsil alması nəzərdə tutulmuşdur.

Təhsil Nazirliyinin tabeliyində fəaliyyət göstərən məktəbdənkənar təhsil müəssisələrinin şəbəkəsinin rasionallaşdırılması barədə Azərbaycan Respublikası təhsil nazirinin 02.08.2017-ci il tarixli 233 nömrəli

əmrinə əsasən Neftçala rayon iki Uşaq Gənclər İdman Məktəbi və Neftçala rayon Uşaq Gənclər Şahmat Məktəbi birləşdirilərək onların bazasında Neftçala rayon Uşaq Gənclər İdman – Şahmat Məktəbi yaradılmışdır.

2016-2017-ci tədris ilində rayonun ümumi təhsil məktəblərində 9895 nəfər şagird təhsil almış, onların təlim-tərbiyəsi ilə 1191 nəfər müəllim məşğul olmuşdur.

2016-cı ilin dekabr ayında keçirilən müəllimlərin diaqnostik qiymətləndirilməsində rayonumuzun müəllimləri də iştirak etmişlər. Diaqnostik qiymətləndirmədə 1105 nəfər müəllim iştirak etmiş, onlardan 244 nəfəri 50% dan aşağı nəticə, 688 nəfəri 50% dan yuxarı, 172 nəfəri isə 80% dan yuxarı nəticə göstərmişdir. Diaqnostik qiymətləndirmədən müvəffəqiyyətlə keçən müəllimlərin əmək haqqı 01 yanvar 2017-ci il tarixdən artırılmışdır. Direktor, direktor müavinləri, metodistlər, müəyyən səbəblərə görə qiymətləndirmədə iştirak edə bilməyən və iki ixtisasa malik olan 107 nəfər pedaqoji işçi 17-19 avqust 2017-ci il tarixlərində keçirilən Diaqnostik qiymətləndirmədə iştirak etmişlər. Ümumilikdə, rayon müəllimlərinin, demək olar ki, 80 faizi 50 faizdən yüksək nəticə göstərmisdir.

2016/2017-ci tədris ilinin əvvəlində təhsil alan 9895 nəfər şagirddən 267 nəfəri məktəblərdən çıxmış, 226 nəfəri isə gəlmişdir. Çıxan şagirdlərdən 145 nəfəri rayonun, 59 nəfəri isə respublikanın digər ümumtəhsil məktəblərinə getmişdir. Onlardan 13 nəfəri təhsildən yayınmış, digər 13 nəfəri xarici ölkələrə, 34 nəfəri isə başqa səbəblərə görə rayonun məktəblərindən çıxmışdır.

Rayonun IX siniflərində ilin əvvəlində 740 nəfər şagird təhsil almış, il ərzində 15 şagird çıxmış, 8 nəfəri isə gəlmişdir. Çıxan şagirdlərdən 2 nəfəri rayon daxili, 4 nəfəri respublika daxili hərəkət etmiş, 6 nəfəri təhsildən yayınmış, 3 nəfəri isə başqa səbəblərə görə məktəbdən çıxmışdır. Dərs ilinin sonunda məktəbi 733 şagird bitirmiş, onlardan 723 nəfəri ümumi orta təhsil haqqında atttestat, 10 nəfəri isə arayış almışdır.

XI siniflərdə dərs ilinin əvvəlində 657 nəfər təhsil almış, 23 nəfəri il ərzində məktəblərdən çıxmış, onlardan 12 nəfəri rayon daxili, 2 nəfəri respublikanın digər ümumtəhsil məktəblərinə getmiş, 1 nəfəri peşə, 1 nəfəri orta ixtisas məktəbinə getmiş, 6 nəfəri isə təhsildən yayınmışdır. Dərs ilinin sonunda 650 nəfər şagird məktəbi bitirmiş, onlardan 640 nəfəri tam orta təhsil haqqında attestat, 10 nəfəri isə arayış almışdır.

Təhsildən yayınan şagirdlərin təhsilə cəlbi üçün bütün lazımi tədbirlər həyata keçirilmiş, onların əksəriyyəti ailələrinin heyvandarlıqla məşğul olması səbəbilə tez-tez yerdəyişməsinə görə təhsildən yayınan şagirdlər sayılmışdır.

Məktəblərdə şagirdlərin dərslərə davamiyyətinə, dərslərdə yeni təlim metodlarının tətbiqinə və dərs prosesində şagirdlərin fəallığının yüksəldilməsinə diqqət artırılmışdır. Rayon təhsil şöbəsi IX sinif buraxılış imtahanlarının I mərhələsində Azərbaycan dili və riyaziyyat fənlərindən verilən açıq tipli sualların şagirdlər tərəfindən yerinə yetirilməsi vəziyyətini öyrənmək üçün rayonun bütün ümumtəhsil məktəblərində sınaq test yoxlamaları aparılmış və nəticəsi təhsil şurasında müzakirə edilmişdir. Aparılan sınaq yazı işlərinin nəticələri göstərmişdir ki, bəzi məktəblərdə Azərbaycan dili və riyaziyyat fənlərindən açıq tipli sualların həll edilməsində şagirdlər çətinlik çəkirlər. Şuranın qərarı pedaqoji kollektivlərdə geniş

müzakirə edilmiş və şagirdlərin buraxılış imtahanlarında yüksək nəticələr əldə etməsinə nail olmaq üçün fənn müəllimlərinin məsuliyyəti daha da artırılmışdır.

Rayonun ümumtəhsil məktəblərinin ibtidai siniflərində tədrisin vəziyyəti öyrənilmiş və nəticəsi təhsil şurasında geniş müzakirə edilmişdir. Yazıb oxumaqda çətinlik çəkən şagirdlərlə əlavə məşğələlər keçirilmiş, onların valideynləri ilə əlaqə saxlanılaraq geriliyin qarşısı alınmışdır.

2016/2017-ci dərs ilində rayon üzrə 2354 nəfər əlaçı şagird olmuşdur. Onlardan 1433 nəfəri ibtidai təhsil səviyyəsində, 720 nəfəri ümumi orta səviyyəsində, 194 nəfəri isə tam orta təhsil səviyyəsində təhsil almışdır. Bu göstəricilər qeyd edilən təhsil səviyyələri üzrə təhsil alan şagirlərin ibtidai təhsil səviyyəsi üzrə 36, ümumi orta təhsil səviyyəsi üzrə 17, tam orta təhsil səviyyəsi üzrə isə 15 %-ni təşkil edir.

Bu il IX sinif bitirən şagirdlərdən 13 nəfəri ümumi orta təhsil haqqında fərqlənmə attestatı almışdır. Buraxılış imtahanlarında 723 nəfər şagird imtahanda iştirak etmişdir.

Yeni dərs ilində məktəb şəbəkəsinin rasionallaşdırılması ilə əlaqədar müəyyən tədbirlər həyata keçiriləcəkdir.

Məktəblərin informasiya – kommunikasiya texnologiyaları ilə təmin edilməsi ötən dərs ilində də davam etdirilmişdir. Hazırda rayonun ümumtəhsil məktəblərində 457 ədəd kompüter dəsti, 35 ədəd proyektor, 83 ədəd noutbuk vardır. 28 kompüter kabineti quraşdırılmışdır. Rayon Təhsil Şöbəsi və 23 məktəb sürətli internetə qoşulmuşdur.

Ali məktəblərə tələbə qəbulunda uzun illərdir ki, rayonumuz yüksək nəticə göstərən rayonlar sırasındadır. DİM-in ötən il üçün məzunların ali məktəblərə qəbul imtahanlarının nəticələrinə dair statistik məlumatlarına əsasən ana-dili, ədəbiyyat, riyaziyyat, fizika, kimya, tarix və coğrafiya fənləri üzrə göstəricilər respublika üzrə orta göstəricilərdən yuxarı olmuşdur.

Bu il ali məktəblərə qəbul imtahanlarında nəticələrimiz ötən illərlə müqayisədə daha yüksək olmuşdur.

Belə ki, 2016-2017-cı tədris ilində Neftçala rayonu üzrə ümumtəhsil müəssisələrinin 640 məzunundan 315 nəfəri ali məktəblərə qəbul imtahanlarında iştirak etmiş, onlardan 231 nəfəri ali məktəblərə qəbul olunmuşdur. Ali məktəblərə qəbul olunanlardan 49 nəfəri 500-700 bal arasında, o cümlədən 16 nəfəri isə 600 - dən yuxarı bal toplamışdır.

Ali məktəblərə tələbə qəbulunda Şəhər 1, 4 nömrəli, Muğan liseyi, Aşağı Surra, Qədimkənd, Astanlı, Xolqaraqaşlı, Yuxarı Qaramanlı, II Qaralı kənd tam orta məktəbləri ən yaxşı nəticə göstərmiş məktəblərdir.

Qeyd etmək istəyirəm ki, Təhsil Nazirliyinin əmr və sərəncamları, təlimati məktubları barədə məktəb rəhbərləri məlumatlandırılmış və icrası ilə əlaqədar bütün tədbirlər vaxtında həyata keçırılmışdir. Keçirilən tədbirlərin nəticəsində şagirdlərimiz zona və respublika miqyaslı yarışlarda bir sıra uğurlar qazanmışlar.

Belə ki, Təhsil Nazirliyinin istedadlı şagirdlərin aşkara çıxarılmasında əhəmiyyətli rol oynayan fənn olimpiadalarının final mərhələsində iştirak edən 5 nəfər şagirddən 3 nəfəri bürünc medallara layiq görülmüşdür.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 25.08.2015-ci il tarixli 9 nömrəli “ Beynəlxalq fənn olimpiadalarının hazırlıq işlərinin təşkili barədə” əmrinə əsasən rayonda fənn müsabiqələri təşkil edilmişdir. Rayon turunda qalib gələn şagirlərdən ibarət 16 nəfərlik komanda respublika turunda iştirak etmişdir.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin “Ədəbiyyat biliciləri” müsabiqəsinin keçirilməsi barədə” 07 noyabr

2016- cı il tarixli 722 nömrəli əmri ilə təsdiq edilmiş qaydalara uyğun olaraq 19 fevral 2017-ci il tarixində şəhər 1 nömrəli tam orta məktəbində keçirilən müsabiqənin rayon mərhələsində Bankə qəsəbə 1 nömrəli tam orta məktəbin XI sinif şagirdi Səbinə Abdullayeva rayon mərhələsinin qalibi seçilərək Respublika mərhələsində IV yerə layiq görülmüş və Təhsil Naziliyinin həvəsləndirmə diplomu ilə mükafatlandırılmışdır.

Təhsil Nazirliyinin 27 fevral 2017-ci il tarixli, 119 nömrəli əmrinə müvafiq olaraq Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunmuş "Ən yaxşı təqdimat" müsabiqənin rayon mərhələsində Şorkənd kənd ümumi orta məktəbin IX sinif şagirdi Məhərrəmov Tayfur Məhərrəm oğlu müsabiqənin qalibi elan edilərək respublika mərhələsinin iştirakçısı olmuşdur.

Möhtərəm prezidentimiz cənab İlham Əliyevin sərəncamı ilə 2017-ci il Azərbaycanda "İslam Həmrəyliyi İli" elan edilmişdir. Bu məsələ də pedaqoji kollektivimizin xüsusi diqqət mərkəzində saxlanılmış, təhsil müəssisələrində İslam Həmrəyliyi İli ilə bağlı xeyli maraqlı tədbir həyata keçirilmişdir. IV İslam Həmrəyliyi oyunlarının təbliği ilə əlaqədar Salyan Olimpiya İdman Kompleksində stolüstü tennis idman növü üzrə keçirilən yarışda rayon komandası III yerə layiq görülmüşdür. Qaliblər diplom, medal və hədiyyələrlə təltif edilmişdir.

Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyinin 2003-2004-cü il təvəllüdlü idmançılar arasında boks üzrə keçirdiyi Respublika birinciliyində iştirak edən Uşaq Gənclər İdman məktəbinin yetirmələrindən Akif Əzizov I, Əli Cəfərov, Abbasqulu Hacıyev, Əvəz İsmiyev isə III yerə layiq görülmüşlər.

Fevral-mart aylarında "Şahin" hərbi – idman yarışlarının rayon turu keçirilmişdir. Rayon turunun qalibi olan şəhər 4 nömrəli tam orta məktəbin komandası 20 aprel 2017-ci il tarixdə Astara şəhərində keçirilmiş respublika zona mərhələsində iştirak edərək 9 komanda arasında IV yerə layiq görülmüşdür.

Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi istedadlı uşaqların iştirakı ilə hər il Azərbaycanın Əməkdar Elm Xadimi, Tibb Elmləri doktoru, Oftalmoloq alim Zərifə xanım Əliyevanın ildönümü ilə əlaqədar "Qələbəyə doğru" kuboku uğrunda intellektual yarış təşkil edir. Bu il Zərifə xanım Əliyevanın 94-cü ildönümünə həsr olunmuş "Qələbəyə doğru" kuboku uğrunda yarışmada iştirak edən Neftçala şəhər E.Həbibov adına 4 saylı tam orta məktəbin 5 nəfərdən ibarət "Everest" komandası 29 mart 2017-ci il tarixdə Lənkəran şəhərində keçirilmiş yarışmada iştirak edərək III yerə layiq görülmüşdür.

Rayon məktəbliləri Mədəniyyət şöbəsi, rayon Tarix Diyarşünaslıq Muzeyinin əməkdaşları ilə birlikdə 20 yanvar, Xocalı faciəsi, 31 mart - Azərbaycanlıların soyqırımı və aprel döyüşlərinin ildönümü münasibətilə tədbirlər hazırlayıb həyata keçirmişlər. Bundan başqa Heydər Əliyev Mərkəzində şəhər 1, 3, 4 nömrəli, "Muğan" liseyi, Mirqurbanlı kənd tam orta məktəbinin müəllim və şagirdləri açıq dərslər və ədəbi bədii kompazisiyalar təşkil etmişlər.

Şagirdlərin sağlamlığı daim diqqət mərkəzində saxlanılır, rayonun səhiyyə işçiləri vaxtaşırı məktəblərdə olur və şagirdlərin tibbi diaqnostikasını həyata keçirirlər.

Hazırda rayonda fəaliyyət göstərən təhsil müəssisələrindən 21 məktəbin əsaslı təmirə, 15 məktəbin isə yeni tikintiyə ciddi ehtiyacı vardır. Bu məktəblərdən 7-si qəzalı

vəziyyətdədir. Bir çox məktəblərdə zəruri təmir işləri aparılmışdır. Təhsil Nazirliyi tərəfindən Xıllı qəsəbə 1 nömrəli tam orta məktəbin dam örtüyü dəyişdirilərək yenilənmişdir. Bu il rayonun Tatarməhlə, Yenikənd kəndlərində modul tipli 56 yerlik məktəblərin tikintisi tamamlanmış, hal-hazırda Mikayıllı, Sübh kəndlərində modul tipli məktəblərin tikilməsi davam etdirilir. Eyni zamanda Şorkənd kənd ümumi orta məktəbi üçün ASKİ qeyri-hökümət təşkilatı tərəfindən 7 əlavə sinif otağı tikilir.

Neftçala Qadın Resurs Mərkəzi tərəfindən Həsənabad, Bankə qəsəbə 1 və Xıllı qəsəbə 1 nömrəli tam orta məktəblərində sanitar qovuşaqlar təmir olunmuş, şəhər 4 nömrəli tam orta məktəb üçün su çəni tikilmiş və məktəbə su xətti çəkilmişdir. Mirzəqurbanlı kənd ümumi orta məktəbi üçün artezian quyusu vurulmuşdur.

Yeni dərs ili ərəfəsində isə Təhsil Nazirliyi tərəfindən verilmiş 96 adda 25086 ədəd dərslik və metodik vəsait gətirilib məktəblərə paylanmışdır.

Etiraf etmək lazımdır ki, müəyyən nailiyyətlər qazanılmasına baxmayaraq rayonun ümumtəhsil məktəblərində həm maddi- texniki baza, həm də tədris prosesi ilə bağlı bir sıra nöqsanlar qalmaqdadır. Bu nöqsanların aradan qaldırılması üçün əsaslı tədbirlər həyata keçirilməkdədir.

2017/2018-ci dərs ili Azərbaycan Respublikası Təhsil Nazirliyinin 28.08. 2017-ci il tarixli 261 əmri ilə "Ümumi təhsildə keyfiyyət ili" elan edilməsi baxımından şagird kontingentinin optimallaşdırılması, müəllimlərlərə bilik və bacarığına uyğun dərs saatı verilməsi, məktəbəhazırlıq qruplarında təhsilin təşkilinin, təmayül siniflərdə təhsilin keyfiyyətinə, müəllimlərin fəaliyyətinə davamlı nəzarət edilməsi, ibtidai sinif müəllimlərinin tədris dili və riyaziyyat fənnindən savadlılıq səviyyəsinin araşdırılması, məktəb şəbəkəsinin rasionallaşdırılması ilə əlaqədar əsaslandırılmış təkliflərin hazırlanması qarşıda duran mühüm vəzifələrdəndir.

***Rəyçi: p.e.d İ.Cəbrayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi. 2013, №5.
2. Yeni təhsil proqramlarının (kurikulumlarının) tətbiqi məsələləri. Bakı, 2014.
3. Azərbaycan Respublikası Ümumi Təhsilin Milli Kurikulumu. Bakı, 2016.

**А.Каримов**

**Наши достижения не делают нас самоуверенными**

**Резюме**

В статье представлен обзор проблемы тенденции в образовании. Перечислены успехи обязательного образования. Показано, что внимание уделяется всестороннему развитию студентов, которое дает основания для качества образования, предоставляемого выпускными классами.

**A.Karimov**

**Our achievement does not make us self-confident**

**Summary**

The article presents an overview of the problem of the trend in education. Successes of compulsory education are listed. It is shown that attention is paid to the comprehensive development of students, which gives grounds for the quality of education provided by graduating classes.



# QARŞIDA BİZİ MÜHÜM İŞLƏR GÖZLƏYİR

**Oqtay Abdullayev,**
***Xızı Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *strateji istiqamətlər, sabit kontingent, strateji hədəflər, test üsulu, fəaliyyət sistemi.*

***Ключевые слова:*** *стратегические тенденции, фиксированная квота, стратегические цели, метод тестирования, операционная система.*

***Key words:*** *strategic tendencies, fixed quota, strategic goals, testing method, operating sys*tem.

Müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu olan Heydər Əliyevin müstəqilliyimizin qorunub saxlanması və möhkəmlənməsində, azərbaycançılıq ideyasının, milli həmrəyliyin, Azərbaycanın inkişaf modelinin formalaşmasında, ölkəmizin dünyaya inteqrasiyasında xidmətləri misilsizdir.

Ulu öndər Heydər Əliyevin hakimiyyəti illərində sosial-iqtisadi həyatın bütün sahələrində olduğu kimi, təhsil sahəsində də köklü islahatlara başlandı, hərtərəfli inkişaf mərhələsinə qədəm qoyuldu. Ulu öndər Heydər Əliyev demişdir: "İndi təhsil sistemində islahatların əsas məqsədi ondan ibarətdir ki, Azərbaycan təhsil sistemi dünya təhsil siteminin standartlarına uyğunlaşsın".

Müstəqil Azərbaycan özünün təhsil sistemini dünyanın ən mütərəqqi ölkələrinin təhsil prinsiplərindən istifadə etməklə təkmilləşdirir, məzmun və struktur dəyişiklikləri aparır.

Ölkənin gələcək sosial-iqtisadi və mədəni yüksəlişinin əsas şərtlərindən, müstəqil dövlətin təməl təchizatlarından müasir təhsil sisteminin qurulmasını hədəfləyən "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın ölkə Prezidenti tərəfindən təsdiq olunmasının müstəsna tarixi əhəmiyyəti vardır. Strategiyada səriştəyə əsaslanan şəxsiyyət yönümlü təhsil məzmununun yaradılması nəzərdə tutulan strateji istiqamətlər içərisində birinci yerdə durur.

2015-ci ilin yanvarın 16-da Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əmək haqqının artırılması ilə bağlı sərəncamı, yanvarın 19-da isə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı "Fəaliyyət Planı"nı təsdiq etməsi bu sahədə görüləcək işləri konkretləşdirmiş və praktik əməli addımlar atılmasına yönəlmişdir. "Fəaliyyət Planın"-da göstərilən istiqamətlər təhsilin bütün pillələri üzrə yeni kurikulumların hazırlanması və inkişafı kimi vacib olan strateji hədəfləri əhatə edir. Hörmətli Prezidentimiz İlham Əliyevin söylədiyi "Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik" konseptual müddəası tədricən həyata keçirilməkdədir.

Təhsil islahatı proqramının həyata keçirilməsi ilə artıq "Milli kurikulum" əsasında I-IX siniflərdə iş başa çatdırılmışdır. Yeni dərs ilində X siniflərdə də tədris "Milli kurikulum" əsasında həyata keçirilir.

2016/2017-ci dərs ilində rayonda 8 tam orta, 6 ümumi orta, 1 ibtidai məktəb, 1 uşaq Gənclər İdman məktəbi, 1 Uşaq Gənclər Şahmat məktəbi, 1 Uşaq Yaradıcılıq Mərkəzi fəaliyyət göstərmişdir.

Rayonun məktəblərində şəbəkənin sabit saxlanılması diqqətdən kənarda qalmamışdır. Buraxılış siniflərində gedən-gələn şagirdlərin olmaması səbəbindən kontingent sabit saxlanılmışdır. Rayon üzrə

təhsildən yayınma halları baş verməmişdir.

Son illərdə rayonun Altıağac qəsəbəsində yeni məktəb binasının inşası, Fındığan kənd, Giləzi qəsəbə, Şuraabad qəsəbə, Xızı şəhər, Yeni-Yaşma kənd tam orta məktəblərində bərkitmə-möhkəmləndirmə işləri görülməklə əsaslı təmir işləri başa çatdırılmışdır. Tıxlı kənd ümumi orta məktəbinin yeni binasının tikintisi başa çatdırılaraq istifadəyə verilmişdir. Hazırda rayonun Z.Abbasov adına Baxşılı kənd ümumi orta məktəbinin qədim və yararsız binasının yerində Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarovun tapşırığı ilə yeni “Modul” tipli məktəb binası tikilərək məktəblilərin istifadəsinə verilmişdir.

Hər il olduğu kimi, bu il də Təhsil şöbəsi məktəblərin dərsliklərlə təmin olunmasına xüsusi diqqət yetirmişdir. I-XI sinif şagirdləri üçün 79 adda 6571 ədəd pulsuz dərslik və 30 adda 499 ədəd müəllim üçün vəsait alınıb məktəblərə çatdırılmışdır.

Təhsil şöbəsi Təhsil Şurasının iş planına uyğun hər ay rayonun ümumtəhsil məktəblərində ayrı-ayrı fənlər üzrə təhsilin keyfiyyətinin monitorinqini aparmışdır. Belə ki, dərs ili ərzində 42 məsələyə baxılmış və Təhsil Şurasında müzakirə edilmişdir. Müzakirələr zamanı öz fəaliyyətlərini mütərəqqi təlim metodları əsasında qurmaqla şagirdlərin dərin və əsaslı biliklərə yiyələnməsinə diqqət yetirən məktəblərin işi qənaətbəxş hesab edilmişdir. Eyni zamanda müzakirələr zamanı uğurlarla yanaşı yol verilmiş nöqsanlar da qeyd edilmiş, bu nöqsanları tezliklə aradan qaldırmaq üçün məktəb rəhbərlərinə və fənn müəllimlərinə bir sıra tövsiyələr verilmişdir.

Təhsilin məzmununa müasir yanaşmaları özündə əks etdirən yeni fənn kurikulumlarının tətbiqi rayonumuzun ümumtəhsil məktəblərində olan müsbət irəliləyişlərin əldə edilməsinə şərait yaradır.

Buraxılış imtahanlarında XI siniflərin hər 3 imtahan fənni üzrə rayonun Şuraabad, Sitalçay 1 nömrəli, Giləzi və Sitalçay kənd tam orta məktəblərinin nəticələri yaxşı, Altıağac və Yeni Yaşma məktəblərinin nəticələri zəif olmuşdur. IX siniflərin hər 2 imtahan fənni üzrə rayonun Yeni Yaşma, Sitalçay 1 nömrəli, və Xızı şəhər tam orta məktəblərinin nəticələri yaxşı, Baxşılı və Ağdərə kənd ümumi orta məktəblərinin nəticələri zəif olmuşdur. Buraxılış imtahanlarında zəif nəticələri olan məktəblərin rəhbərlərinə yeni dərs ilində təlimin keyfiyyətinin yaxşılaşdırılması üçün təcili və təsirli tədbirlərin görülməsi tapşırığı verilmişdir.

2016/2017-ci tədris ilində rayonun 7 tam orta məktəbində 132 uşaq üçün məktəbə hazırlıq qrupları təşkil olunmuşdur. Dərs ili ərzində təhsil şöbəsi həmin qruplarda tədrisin təşkili və təlimin keyfiyyətini daima nəzarət altında saxlamış, müvafiq göstəriş və tövsiyələrini vermişdir.

2016/2017-ci dərs ilinin sonunda Təhsil şöbəsi təlim-tərbiyə müəssisələrinin rəhbərləri ilə ayrı-ayrı ixtisaslar üzrə pedaqoji kadrlara olan tələbat müəyyənləşdirilmiş, vakant yerlər haqqında məlimatı Təhsil Nazirliyinə təqdim etmişdir. Müəllimlərin işə qəbulu ilə əlaqədar ayrı-ayrı fənlər üzrə imtahan verən müəllimlərdən artıq 71 nəfəri işləmək üçün rayona gəlmişdir.

2016-cı ilin noyabr ayında Quba şəhərində keçirilən ümumtəhsil məktəbi müəllimlərinin diaqnostik qiymətləndirilməsində rayonumuzun 203 nəfər müəllimi iştirak etmişdir.

Ümumi təhsilin dövlət və cəmiyyət qarşısında qoyduğu ən mühüm vəzifələrdən biri də ayrı-ayrı sahələr üzrə istedadlı, xüsusi qabiliyyəti ilə fərqlənən şagirdlərin vaxtında aşkara çıxarılması və davamlı inkişafı üçün onlara lazımi şəraitin yaradılmasıdır. İstedadlı şagirdlərin aşkar edilməsində fənn olimpiadalarının da böyük əhəmiyyəti vardır. Rayonun ümumtəhsil məktəblərində fənn olimpiadalarının məktədaxili mərhələsi noyabr ayında keçirilmişdir. Fənn olimpiadalarının IX-XI sinif şagirdləri arsında rayon üzrə I mərhələsi isə 2017-ci ilin yanvar ayında Giləzi qəsəbə tam orta məktəbində keçirilmişdir. Olimpiadada işti-

rak edən 26 nəfərdən 6-sı daha yüksək bilik nümayiş etdirərək, fənn olimpiadalarının respublika turunun yarımfinal mərhələsinə çıxmışlar.

Fənn olimpiadalarının respublika turunun Sumqayıt şəhərində təşkil olunmuş yarımfinal mərhələsində 6 iştirakçımız 1 nəfəri - Sitalçay kənd tam orta məktəbinin XI sinif şagirdi Əliyeva Naznaz tarix fənnindən zona mərhələsində I yeri tutaraq respublika turunun final mərhələsində iştirak etmək hüququ qazanmışdır.

2016/2017-ci dərs ilində də metodiki işin təşkili və canlandırılmsı istiqamətində xeyli iş görülmüşdür. Ümumtəhsil məktəblərində metodiki işlərin həyata keçirilməsi üçün "Dayaq məntəqələri" yaradılmışdır. "Dayaq məntəqələri"ndə fənn metodbirləşmələri təşkil olunmuş, "Dəyirmi masa"lar, orada açıq dərslərin təşkili, qabaqcıl təcrübənin öyrənilməsi və yayılması, istedadlı şagirdlərin üzə çıxarılması kimi məsələlərin həlli öz əksini tapmışdır.

Təhsil şöbəsi 2017-ci ilin fevral-mart aylarında rayonun bütün ümumtəhsil məktəblərinin II-XI siniflərində cavab kartı tətbiq olunmaqla ayrı-ayrı fənlər üzrə test üsulu ilə monitorinq aparmış, nəticələr məktəb rəhbərlərinin və fənn müəllimlərinin iştirakı ilə pedaqoji şuralarda təhlil edilmişdir.

2016/2017-ci tədris ilində də Təhsil şöbəsi rayonun Heydər Əliyev mərkəzində ulu öndərin həyat və fəaliyyətinə həsr edilmiş məşğələlərdə bütün XI sinif şagirdlərinin iştirakını təmin etmişdir.

Rayonun ümumtəhsil məktəblərində Konstitusiya Günü, Bayraq günü, Dünya Azərbaycanlılarının Həmrəyik günü, "Novruz" bayramı, Müstəqillik Günü tədbirləri təntənəli şəkildə qeyd edilmişdir.

16 mart 2017-ci il tarixində Siyəzən şəhərində IV Ümumrespublika Forumuna iştirakçıların seçilməsi və "Qələbəyə doğru" intellektual yarışın regional seçim turunda Xızı rayonunun komandası dünyagörüşü və intellektual səviyyəsi yüksək olan 5 nəfər şagird ilə təmsil olunmuşdur.

"Ölkəmizi tanıyaq" devizi ilə keçirilən maarifləndirici tur-aksiyaya Xızı məktəbliləri də qoşulublar. Martın 23-də rayon üzrə ümumtəhsil məktəblərinin IX-XI siniflərindən təhsildə xüsusi ilə fərqlənən 40 nəfər şagird Lənkəran-Masallı-Astara marşurutu üzrə yola düşmüşlər. Layihənin keçirilməsində əsas məqsəd gənclərin vətənpərvərlik, tarixi-mədəni irsimizə hörmət ruhunda tərbiyə olunması, məktəblilərin dünyagörüşünün daha da zənginləşməsi baxımından xüsusi əhəmiyyət kəsb edir.

Fevral-may aylarında Yeni-Yaşma kənd, Giləzi qəsəbə, Şuraabad qəsəbə və Xızı şəhər tam orta məktəblərində "Bədii qiraət" gecələri keçirilmiş fərqlənən şagirdlər Fəxri fərmanlarla təltif olunmuşlar.

Ali məktəblərə sənəd vermiş məzunlardan 31 nəfəri ali məktəblərə, 10 nəfəri isə orta ixtisas təhsil müəssisələrinə, IX sinif bazasından 12 nəfər kolleclərə qəbul olmuşlar.

Bu dərs ilindən rayonun Xızı şəhər, Giləzi qəsəbə, Şuraabad qəsəbə, Altıağac qəsəbə, Yeni Yaşma kənd, Sitalçay kənd, Sitalçay 1 saylı tam orta və Tıxlı kənd ümumi orta məktəblərində 155 nəfər şagird üçün 9 sinif komplekti olmaqla 2012-ci ildə anadan olmuş uşaqlar üçün məktəbə hazırlıq qrupları təşkil olunmuşdur.

Məktəbəhazırlıq qruplarında təhsilin təşkilinə müntəzəm nəzarətin həyata keçirilməsi, dərs ilinin dekabr və may aylarında bu qruplara cəlb olunmuş uşaqların müəyyən olunmuş qaydalar və məzmun üzrə məktəbəhazırlıq təhsili almalarının səviyyəsinin seçmə yolla öyrənilməsi.

Xızı şəhər tam orta məktəbində yaradılacaq təmayül sinfində təhsilin keyfiyyətinə, müəllimlərin fəaliyyətinə davamlı nəzarət edilməsi, şagirdlərin təmayül fənləri üzrə bilik və bacarıqlarının monitorinqlərinin keçirilməsi, nəticələrə uyğun olaraq tədbirlərin görülməsi.

Hər bir ümumi orta və tam orta

məktəbdə fənn sahələri və digər sahələr üzrə VI sinifdən başlayaraq istedadlı şagirdlərin uçotunun aparılması, onların təhsil şöbəsində qeydiyyata alınması və ümumi “Məlumat bankı”nın yaradılması. Şagirdlərin fənn olimpiadalarına hazırlığının gücləndirilməsi məqsədilə Təhsil Nazirliyindən daxil olan təlimat və göstərişlərin vaxtında yerinə yetirilməsi.

İbtidai sinif müəllimlərinin tədris dili və riyaziyyat fənlərindən savadlılıq səviyyəsinin müxtəlif yoxlama formalarından istifadə etməklə araşdırılması və təkliflərin hazırlanması.

Məktəb rəhbərlərinin Əmək Məcəlləsi üzrə məlumatlılıq səviyyəsinin testlər vasitəsilə yoxlanılması.

Zəruri ehtiyacı nəzərə alaraq, ümumi təhsilin yeni məzmununun mahiyyəti, müasir təhsil texnologiyaları və şagird nailiyyətlərinin qiymətləndirilməsi sahəsində müsbət təcrübə toplamış müəllimlər, məktəb rəhbərləri tərəfindən digər müəllimlər üçün öyrədici təlimlərin və təqdimatların keçirilməsi.

2017/2018-ci dərs ilinin “Ümumi təhsildə keyfiyyət ili” elan edilməsi barədə Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarovun müvafiq əmrinin icrası ilə əlaqədar qarşıda duran vəzifələr haqqında məktəb direktorlarına və məktəb pedaqoji kollektivlərinə ətraflı məlumat verilməsi. “Təhsildə keyfiyyət ili” ilə bağlı Nazirliyin Fəaliyyət planında nəzərdə tutulan hədəflərin vaxtında yerinə yetirilməsi istiqamətində məqsədyönlü təşkilati-pedaqoji tədbirlər həyata keçirmək.

Ümumi təhsil müəssisələrində 2017-2018-ci tədris ilinin ilk dərs məşğələsi Azərbaycan Respublikasının Təhsil Nazirinin əmrinə uyğun olaraq “Cocuq Mərcanlı-tarixi qayıdışın başlanğıcı” mövzusuna həsr olunub.

Şübhəsiz ki, fəaliyyətimizi, uğurlarımızı bütün təfərrüatı ilə sadalamaq fikrində deyiləm. Təhsil şöbəsi yeni dərs ilində də görülən işləri ətraflı təhlil edərək, mövcud problemlərin, nöqsan və çatışmazlıqların aradan qaldırılması istiqamətində düşünülmüş və məqsədyönlü fəaliyyət sistemi müəyyənləşdirəcəkdir. Eyni zamanda Təhsil şöbəsi icra intizamının möhkəmləndirilməsi və peşə məsuliyyətinin artırılması, təhsil müəssisələrinin idarə olunmasının təkmilləşdirilməsi, təlim-tərbiyə prosesinin müasir pedaqoji innovasiyalar əsasında qurulması istiqamətində təsirli tədbirlər həyata keçirməli, təhsilin keyfiyyətinin yüksəldilməsinə nəzarəti gücləndirməlidir.

Pedaqoji kollektivimiz təhsil sahəsində İslahat Proqramında, “Təhsil Qanunu”nda, “Milli kurikulum”un tətbiqində göstərilən müddəaları əldə rəhbər tutaraq, təhsilin keyfiyyətinin yüksəldilməsi üçün səylə çalışacaqlar.

***Rəyçi: dos. H.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, № 5.
2. Təhsilin konseptual problemləri. Bakı, 2014.
3. Abbasov Ə. Kurikulum islahatının əsas istiqamətləri. // Azərbaycan məktəbi, 2011, №4.


**О.Абдуллаев**

**Впереди нас ждут важные дела**

**Резюме**

В статье рассматривается развитие образования в отдаленном горном регионе, а также перспективы будущего. Уделяется внимание управлению образованием. Напоминаются исследования в области повышения качества образования.

**O.Abdullayev**

**Important things are waiting for us**

**Summary**

The article examines the development of education in a remote mountain region, as well as prospects for the future. Attention is paid to education management. Studies in the field of improving the quality of education are reminded.

# ƏJDƏR AĞAYEV VƏ "AZƏRBAYCAN MƏKTƏBİ"





**Nəcəf Nəcəfov,**
***"Azərbaycan məktəbi" jurnalının baş redaktoru, filologiya üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim, Azərbaycan Yazıçılar və Jurnalistlər Birliyinin üzvü***

**Elnarə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

Məqalədə 1974-1981-ci illərdə "Azərbaycan məktəbi" jurnalının baş redaktoru işləmiş görkəmli alim-pedaqoq, Azərbaycan Təhsil Şurasının sədri, professor, əməkdar müəllim Əjdər Ağayevin "Azərbaycan məktəbi" jurnalı ilə bağlı yaradıcılıq yolundan bəhs edilir. Məqalədə Ə.Ağayevin əsasən Azərbaycanda pedaqoji fikrin formalaşması ilə bağlı məqalələri ön plana çəkilmişdir.

***Açar sözlər:*** *elm xadimi, Təhsil şurası, pedaqoji fikir, şəxsiyyətin formalaşdırılması.*
***Ключевые слова:*** *ученый, совет образования, педагогическая мысль, формирование личности.*
***Key words:*** *scientist, educational council, pedagogical thought, personality formation.*

Görkəmli elm xadimi, pedaqoji elmlər doktoru, professor, əməkdar müəllim, Rusiya Federasiyası Sosial və Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Prezidentin fərdi təqaüdçüsü, Azərbaycan Yazıçılar və Jurnalistlər Birliyinin üzvü, Qızıl qələm və akademik M.Mehdizadə adına mükafatın laureatı Əjdər Əbdülhüseyn oğlu Ağayev Azərbaycanda pedaqoji fikrin öyrənilməsi və tədqiqi yolunda çalışan cəfakeş alimlərdəndir. Ötən əsrin 70-ci illərində Azərbaycanda klassik pedaqoji irsin tədqiqinin aktual problem kimi gündəmə gəldiyi bir dövrdə Əjdər Ağayev Azərbaycan pedaqoji fikir klassiklərinin tədqiqi ilə məşğul olur, "silsilə məqalələr ilə pedaqoji fikir tarixinin tədqiqində yeni cığır açır, bu istiqamətli araşdırmaların təşəbbüsçüsü kimi pedaqoji elmə daxil olur" (5, 408). Uzun müddətli sistemli və ardıcıl araşdırmaların ümumiləşdirilməsinin yekunu kimi o, pedaqogika elmimizdə nailiyyət sayılan "Azərbaycan ictimai pedaqoji fikrində şəxsiyyətin formalaşdırılması problemi" kimi fundamental tədqiqat əsərini ortaya qoyur. Prof. Z.Qaralov həm nəzəri, həm də praktik cəhətdən əhəmiyyətli olan bu dissertasiya işini "Azərbaycanda pedaqoji fikrin inkişafına, tədqiqat mədəniyyətinin artırılmasına, təhsil-tərbiyə quruculuğunun yenidən təkmilləşdirilməsinə və yetkinləşməsinə əsaslı təsir göstərə bilən" (5, 412) əsər adlandırmışdır.

Maraq dairəsi geniş olan Əjdər Ağayevin elmi-pedaqoji fəaliyyətinin bütün sahələrini bir məqalədə əhatə etmək mümkün olmadığından biz onun ancaq "Azərbaycan məktəb"i ilə bağlı fəaliyyə-

tindən bəhs etməyi məqsədəuyğun saydıq.

Ötən əsrin 70-ci illərində “Azərbaycan məktəbi” jurnalının elmi-nəzəri səviyyəsini yüksəltmək, onu Azərbaycan pedaqoji elminin dolğun məzmunlu, etibarlı bilik xəzinəsinə çevirmək məsələsi bir vəzifə kimi qarşıya qoyulanda, ilk növbədə jurnalın rəhbərli-yinin möhkəmləndirilməsi problemi yarandı. Elə o anlarda bacarıqlı, gənc, erudisiyalı alim Əjdər Ağayev yada düşdü və o, 1974-cü ildə “Azərbaycan məktəbi” jurnalına baş redaktor təyin olundu. Onun həyatının yeni bir dövrü başlandı, o elmi tədqiqat işindən mətbuat aləminə keçdi. Hələ gəncliyindən yenilikçi, təşəbbüskar pedaqoq-alim kimi tanınan Ə.Ağayev 8 əlavəsi ilə birlikdə “Azərbaycan məktəbi” jurnalının nəşrinə başçılıq etməli oldu.

Azərbaycanda pedaqoji fikrin formalaşmasında müstəsna rol oynamış "Azərbaycan məktəbi" yarandığı gündən görkəmli pedaqoq-psixoloq alimlərin yaradıcılıq beşiyi olmuşdur. Pedaqogika elminin korifeyləri M.Mehdizadə, Ə.Seyidov, M.Muradxanov, bir qədər sonra H.Əhmədov, N.Kazımov, B.Əhmədov, Ə.Əlizadə, Ə.Həşimov, Y.Kərimovun yaradıcılıq fəaliyyətində "Azərbaycan məktəbi"nin müstəsna rolu olmuşdur. Bu cərgədə öz həmkarları ilə bir sırada Ə.Ağayev də cəsarətlə addımlayaraq qırılmaz tellərlə jurnala bağlanmış, 8 il onun idealoji rəhbəri olmuşdur. O, jurnala pedaqogika elminin inkişafının ən qaynar və mübahisəli illərində rəhbərlik etmişdir. Bir müddət eyni zamanda jurnalın əlavəsi olan “Məktəbdə bədən tərbiyəsi” məcmuəsinin redaktorluğunu da aparan Əjdər müəllim burada da fiziki tərbiyə və idmana aid çox dəyərli məqalələrlə çıxış etmişdir. Arada müəyyən müddət yaradıcılıq laboratoriyası kimi sönük bir təsir bağışlayan "Azərbaycan məktəbi" Ə.Ağayevin baş redaktor təyin olunması ilə, demək olar ki, yeni bir qaynar pedaqoji elm arsenalına çevrildi. "Azərbaycan məktəbi" ilə əməkdaşlığına o, "ömrünün bir parçası", "fəaliyyətinin əhəmiyyətli bir hissəsi" kimi baxmışdır. Özünün etiraf etdiyi kimi, jurnalın baş redaktoru vəzifəsində çalışdığı illərdə o özü də xeyli təkmilləşmiş, təşkilatçılıq qabiliyyətinə yiyələnmişdir. İllər keçəndən sonra Əjdər müəllim yazırdı ki, "Jurnal mənə çox şey verdi. Belə ki, əvvəlcə, məndə idarəçilik qabiliyyətini formalaşdırdı. İşgüzarlıq, ahəngliliyi daim saz saxlamaq, kollektiv üzvlərinin fərdi iradi xüsusiyyətlərini ictimai



maraqlarla uzlaşdırmaq, qayğı və hörmətlə yanaşmaq, vəzifə və peşə tələbkarlığını yüksəltmək, ünsiyyət və davranış mədəniyyətinə, rəhbərlik etikası normalarına əməl etmək, təmkinlilik, səbirlilik və s. kimi idarə başçısına xas olan bir çox keyfiyyətlərə yiyələnmək və s. o illərin izləridir”.

Ə.Ağayev Azərbaycan Təhsil Şurasının, Təhsil Nazirliyi Elmi - Metodiki Şuranın "Pedaqogika və psixologiya" bölməsinin sədri, Dissertasiya Şurasının, "Azərbaycan məktəbi" jurnalının redaksiya heyətinin üzvüdür. Əjdər müəllim AAK Ekspert Şurasının, Azərbaycan Respublikasında Təhsil sahəsində İslahat Proqramı və Təhsil haqqında qanun layihəsi hazırlayan işçi qruplarının üzvü olmuşdur. Böyük həyat təcrübəsinə malik, çox mənalı ömür

yolu keçmiş Əjdər müəllim 40 kitabın, monoqrafiya və dərsliyin, proqram və metodik tövsiyələrin, 500-dən çox elmi əsərin, 600-dən çox elmi-kütləvi, publisistik məqalənin müəllifidir. Ə.Ağayevin başçılığı ilə müəlliflər qrupu tərəfindən hazırlanan VIII-XI siniflər üçün "İnsan və cəmiyyət" dərslikləri (Azərbaycan və rus bölmələri üçün) on ilə yaxın məktəblərimizdə istifadə olunmuşdur. Bunlar təhsil islahatının ilk mərhələsində yaradılan ən uğurlu dərsliklər kimi qəbul olunmuşdur. Bunlarla paralel Əjdər Ağayevin əsərləri rus, ingilis, Ukrayna, Belarus, başqırd dillərində çap olunmuşdur. Bədii yaradıcılığını da unutmayan Əjdər müəllimin uşaqlar üçün yazdığı şeirlər onun pedaqoji və bədii düşüncəsində yer alan incilərdir. Onun 100-dən artıq şeirinə musiqi bəstələnmişdir. Bütün bunlar onun şair təbiətli bir pedaqoq-alim kimi yetişməsi ilə şərtlənmişdir. Bu məziyyətlər onun tədqiqatçılıq sahəsindəki peşəkarlığına yeni məzmun vermişdir.

Bir haşiyə: 1974-cü ildə ona "Azərbaycan məktəbi"ndə baş redaktorluq vəzifəsi təklif olunanda o, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda şöbə müdiri idi, eyni zamanda institutun elmi işlər üzrə direktor müavini vəzifəsini icra edirdi. O zaman "Azərbaycan məktəbi" jurnalının baş redaktoru vəzifəsi Mərkəzi Komitənin nomenklaturasında olduğu üçün o Mərkəzi Komitənin təbliğat-təşviqat şöbəsinin müdiri, tanınmış şair Teymur Elçinlə görüşməli idi. Onlar arasında çox maraqlı söhbət alınmışdı. Yadda qalan bu görüş Böyükağa Mikayıllının "İşıq" kitabında öz ifadəsini belə tapmışdır: "Mükalimə zamanı Əjdərin pedaqoq olduğunu eşidən Teymur Elçin narazı halda ucadan: "Pedaqoq?", - deyə təəccüblənmiş halda onun üzünə baxdı. Sonra isə sözünə davam edərək dedi: - Dünən bir mərasimdə idim, pedaqoqlar da var idi. Məşhur pedaqoq Suxomlinskidən söhbət düşdü.

Əjdər müəllim Teymur Elçinin ona sual verməsini gözləmədən müzakirəyə girdi:

- Vasiliy Suxomlinski məşhur pedaqoq və gözəl yazıçı olmuşdur. Onun pedaqoji əsərləri Makarenkonun əsərləri üslubundadır. O, "Vətəndaşın doğulması", "Ürəyimi uşaqlara verirəm", "Pavliş orta məktəbi", "Oğluma məktublar" olmaqla, 38 kitab yazıb. "Vətəndaşın doğulması" əsəri Azərbaycan dilinə tərcümə olunub. Sonra müharibədə Suxomlinski və həyat yoldaşının başına gələn əhvalatları danışır. Teymur Elçin Əjdəri dinlədikdən sonra üzündə sevinc hissləri görünür".

Beləliklə, bu söhbət inam yaradır ki, "Azərbaycan məktəbi" etibarlı əllərə tapşırılır. Əjdər Ağayev "Azərbaycan məktəbi"ni təhvil alır və jurnalını formalaşdırmağa başlayır.

Əjdər müəllimin redaksiyanın ilk günlərinə dair sözlərinə nəzər salaq. "Uzun müddət "Azərbaycan məktəbi" jurnalında baş redaktor işləmiş Rüstəm Hüseynovun çox səmərəli iş üslubu barəsində eşitmişdim. Professor M.Muradxanov mənə məsləhətlər verir və Rüstəm Hüseynovdan öyrənməyi tövsiyə edirdi. Bu yönümdə öyrənənlər də işimizin uğurlu qurulmasına kömək edirdi. Güclü redaksiya heyəti yaratmağım da öyrənə-öyrənə təkmilləşməyimizə kömək edirdi. Redaksiya heyətinin üzvlərindən Əbdül Əlizadə elmi məsləhətləri, Samir Şəfiyev, Sərdar Quliyev təşəbbüskarlıq qayğıları ilə jurnalın kütləviliyinə nail olmağa çalışırdılar. Birgə səyin nəticəsi idi ki, "Azərbaycan məktəbi" və ona əlavələrdən biri "İbtidai məktəb və məktəbəqədər tərbiyə" məcmuəsi hərəsi 22000 tirajla nəşr olunmuşdu. Pedaqoji-metodik jurnal olan "Azərbaycan məktəbi" və ona əlavə nəşr edilən məcmuələrin hər nömrəsi müəllimlərin, təhsil işçilərinin gündəlik istifadə etdiyi vəsaitə çevrilmişdi. Jurnalın 1977-ci ildə 50 illik yubileyi keçirilərkən, bu barədə ətraflı bəhs edildi, jurnal o zaman

Azərbaycan Ali Sovetinin Fəxri Fərmanına layiq görüldü”.

Görkəmli pedaqogika tarixçisi və nəzəriyyəçisi kimi o, Ə.Xaqani və N.Gəncəvidən başlamış, F.Köçərli və F.Ağazadəyə qədər Azərbaycan pedaqoji fikir tarixini inadkarlıqla araşdıraraq onun sistemə salınması yollarını müəyyənləşdirən fədakar tədqiqatçılardan biri olmuşdur: "Əjdər Ağayevin adı respublika elmi-pedaqoji ictimaiyyətinə yaxından tanışdır. Onun orijinal tədqiqatlarının elmi nəticələrindən fəlsəfə, hüquq, pedaqogika və ədəbiyyatşünaslıq üzrə tədqiqatçılar, proqram və dərslik tərtibçiləri mənbə kimi istifadə etmişlər" (F.Rüstəmov).

Əjdər Ağayevin “Azərbaycan məktəbi” jurnalındakı fəaliyyətindən bəhs edən Z.Əliyeva (O, 24 il jurnalın baş redaktoru olmuşdur) - Əjdər müəllimə müraciətlə yazırdı ki: “Elmi fəaliyyətə başladığımız illərdən bəri “Azərbaycan məktəbi” jurnalının nüfuzunun yüksəlməsində müstəsna xidmətləri olan bir neçə müasir pedaqoq adını çəkmiş olsaq, birincilər sırasında sizin adınız dayanır. İnamla bildirirk ki, Siz ensiklopedik təfəkkürə malik salnaməçi pedaqoq, yeni fikirli tədqiqatçılar nəslinin rəhbərlərindən biri, şəxsi həyat xoşbəxtliyinin də pedaqogika elminin qaynaqlarını tədqiq və təbliğ etməkdə görən cəfakeş insan kimi dəyərlənirsiz. Vaxtilə baş redaktoru olduğunuz “Azərbaycan məktəbi” jurnalında milli pedaqogikamızı təbliğ etməklə bərabər, Azərbaycan pedaqoji elminin praktikada tətbiqində, milli adət və ənənələrimiz ruhunda gənc nəslin tərbiyə olunmasında çox böyük əmək sərf etmisiniz” (5, 461-462).

Əjdər müəllim “Azərbaycan məktəbi 50 ildə” adlı məqaləsində yazırdı: Azərbaycan elmi, pedaqoji, psixoloji fikrin sürətli inkişaf yolu keçmişdir. Onun inkişafında Ə.Seyidov, M.Mehdizadə, M.Muradxanov kimi qocaman alimlərlə yanaşı, artıq öz dəsti-xətti olan gənc alimlərin də rolu böyükdür. Professorlardan N.Kazımov, H.Əhmədov, Ə.Bayramov və başqaları öz sanballı, elmi-tədqiqat xarakterli yazıları ilə jurnal səhifələrində tanınmışlar.

Müəllimlərin elmi-nəzəri səviyyəsini, pedaqoji məharətini yüksəltmək, sinifdənxaric və məktəbdənkənar işlərin səviyyəsini artırmaq, məktəb, ailə və ictimaiyyətin qarşılıqlı əlaqəsini təşkil etmək sahəsində “Azərbaycan məktəbi” jurnalı xeyli iş görmüşdür. Jurnal respublikamızın pedaqoji həyatını həmişə hərtərəfli əks etdirmiş, müəllimləri xalq maarifinin aktual məsələləri ilə ilhamlandırmışdır. İndi “Azərbaycan məktəbi” jurnalının ətrafında respublikamızın ən yaxşı, təcrübəli müəllim və tərbiyəçiləri, metodistləri, pedaqoq-alimləri toplanmışdır (4, 10-11).

Əjdər müəllim jurnalın fəaliyyət dairəsinin genişlənməsi üçün də çox iş görmüşdür. O jurnalın işinə akademik Həsən Əliyev, mayestro Niyazi, o zamankı SSR AEA-nın Tərbiyənin Ümumi Problemləri İnstitutunun direktor müavinini, məşhur pedaqoq, professor İ.Marlyenkonu, görkəmli bəstəkar D.Kobalevskini, moskvalı musiqişünas V.Dimentmanı və digər görkəmli alimləri cəlb etdi. Məşhur sovet pedaqoqları M.Skatkin, İ.Lerner, M.Maxmutov, Z.Ravkinlə işgüzar məktublaşmalar aparıldı. Rusiya, Ukrayna, Belarus, Tatarıstan, Özbəkistan, Tacikistan, Gürcüstan, Latviya, Litva, Estoniya respublikalarının pedaqoji mətbuat orqanları ilə yaradıcı əməkdaşlıq yaradıldı. Əjdər Ağayev baş redaktor kimi çalışmaqla, axtarıcılıq işlərindən də geri qalmırdı.

Bu bir həqiqətdir ki, Əjdər müəllim 50 ilə yaxındır ki, "Azərbaycan məktəbi" ilə müntəzəm əlaqəlidir, o indi də jurnalla yaxından bağlıdır. Hazırda yenə də jurnalın redaksiya heyətinin üzvüdür. Ən mübahisəli məsələlərdə onun rəyinə, sözünə, məsləhətinə ehtiyac duyulur. Alimin yaradıcılıq yoluna nəzər saldıqda tam qətiyyətlə əmin olursan ki, "Əjdər Ağayev Azərbaycanda

pedaqogika elminin inkişafında, onun metodiki problemlərinin tədqiqi, tədrisi və təbliğində böyük xidməti olan alimdir" (F.Rüstəmov).

Ə.Ağayevin "Azərbaycan məktəbi"ndəki ilk məqaləsi 1970-ci ildə çap olunmuş "Dəyərli vəsait" adlanır. Məqalə nüfuzlu professor, pedaqoji elmlər doktoru Əhməd Seyidovun "Pedaqogika tarixi" (Bakı, Maarif, 1968) kitabı haqqındadır. Tanınmış alimin kitabına rəy yazmaq hər adama müyəssər olmur, həm də gənc alim burada çox cəsarətli fikirlər söyləmişdir. Məlumdur ki, prof. Ə.Seyidov dərsliyin birinci nəşrindəki qüsurları aradan qaldırmış, kitab üzərində yenidən işləmişdir. Əjdər müəllim bu nəşrdəki nöqsan və çatışmazlıqların düzəldilməsinin pedaqoji fikrimizin inkişafına müsbət təsir edəcəyini yaxşı bilirdi.

Azərbaycan mütəfəkkirləri N.Tusinin, M.Füzulinin, A.A.Bakıxanovun, M.F.Axundovun, H.Cavidin, görkəmli pedaqoqlar M.Sidqinin, F.Ağazadənin, A.O.Çernyayevskinin, Rəşidbəy Əfəndiyevin, Rəcəb Əfəndiyevin, Şəfiqə Əfəndizadənin, həmçinin XX əsrin böyük simaları Ü.Hacıbəylinin, Səməd Vurğunun, Mirzə İbrahimovun, Süleyman Ələsgərovun və digər sənətkarların yaradıcılığı haqqında dəyərli fikirlər söyləmişdir.

“Əjdər müəllimin cild-cild kitablarında irəli sürülən problemlərin, klassik Qərb, rus və Azərbaycan pedaqoji irsinin öyrənilməsi məsələlərinə dair araşdırmalarının da ilk rüşeymi "Azərbaycan məktəbi"ndə qoyulmuşdur. O klassik pedaqoji fikrimizə dair məqalələrində 80-90-cı illərdə pedaqoji elmə gələn "əksər tədqiqatçıların yardımçısı, təmənnasız xeyirxahı olmuşdur”. (F.Rüstəmov). O həm elmi rəhbər, rəyçi olması ilə, həm də müzakirələrdəki çıxışları ilə gənclərin himayəçisi kimi çıxış etmişdir.

Təsadüfi deyildir ki, onun haqqında görkəmli pedaqoqlarımız akademik H.Əhmədov və professor F.Rüstəmov tərəfindən yazılmış "Cəfakeş alim" adlı məqalə də məhz "Azərbaycan məktəbi"ndə (1977, № 1) dərc olunmuşdur. Məqalə müəllifləri öz sözlərini çox səmimi və pozitiv notlarla bitirirlər:

"Pedaqogika elmlər doktoru, professor Əjdər Ağayev ömrünün ən xoş, sevinc, səadət dolu məqamlarını yaşamaqdadır. Gərgin zəhmətin və istedadın vəhdətidən doğan sevinc payı şərəfli alim ömrünün töhfəsidir.Azərbaycan pedaqogika elminin inkişafı naminə görüləcək işlər hələ çoxdur. Bu yolda ona tükənməz yaradıcılıq enerjisi, səmərəli və məhsuldar fəaliyyət arzulayırıq. İnanırıq ki, Ə.Ağayevin zəngin təcrübəsi pedaqoji elmlər üzrə tədqiqata başlayan gənc tədqiqatçılar üçün dəyərli açar olacaqdır".

"Azərbaycan məktəbi" jurnalı kimi elm və bilik xəzinəsində baş redaktor vəzifəsində və sonrakı məsul işlərdə Azərbaycan pedaqoji elminin dərinliklərinə baş vuran Əjdər Ağayev öz müasirlərinin dərin rəğbətini qazanmışdır. Müasirləri onu "görkəmli alim və müdrik müəllim" (akademik İsa Həbibbəyli), "Bitməyən universallığı ilə dərin hörmət qazanmış alim" (akademik Budaq Budaqov), "adı böyük hərflərlə yazılmağa layiq ziyalı" (professor Misir Mərdanov), "geniş erudisiyaya malik alim" (H.Əhmədov, F.Rüstəmov) kimi qiymətləndirmişlər.

Əjdər müəllim yeri gəldikcə, bilavasitə “Azərbaycan məktəbi” ilə bağlı məqalələr də yazmışdır. Onun "Azərbaycan məktəbi"ndə dərc olunmuş "Pedaqoji mətbuat və təlimin təkmilləşdirilməsi" (“Azərbaycan məktəbi”,1976, № 1), "Azərbaycan məktəbi" jurnalının 50 illik inkişaf yolu” (yenə orada, 1976, № 6) məqalələri sırf "Azərbaycan məktəbi"nə həsr olunmuşdur.

"Azərbaycan məktəbi"nə həmişə sədaqətli qalan Əjdər Ağayev 1983-cü ildə A.S.Makarenkonun "Seçilmiş pedaqoji əsərləri"ni (I və II cildlər) çapa hazırlayarkən, bu nəşrin müqəddiməsində yazırdı: "A.S.Makarenkonun "Seçilmiş pedaqoji

əsərləri" Azərbaycan dilində 1950-ci ildə "Müəllim kitabxanası" seriyasından "Azərbaycan məktəbi" jurnalı tərfindən buraxılmışdır”.

Ə.Ağayev rus klassik pedaqoji irsinə dair bir sıra məqalələrini də "Azərbaycan məktəbi"ndə çap etdirmişdir. Onun "Görkəmli pedaqoq" (A.S.Makarenkonun 90 illiyinə) (1978, № 9), "Böyük humanist” (L.N.Tolstoy haqqında) (1979, № 9), "A.S.Makarenkonun irsinin saxtalaşdırılmasına dair" (1985, № 8), "N.K.Krupskayanın pedaqoji irsində beynəlmiləl problemlər və onun Azərbaycanda həlli" (1989, № 8) də bu qəbildəndir.

Qeyd etmək lazımdır ki, 1960-80-ci illər arasında Azərbaycanda bütün sahələrdə sanki bir intibah yaşanırdı. Pedaqogika sahəsində də bu canlanma hiss olunurdu. Böyük pedaqoqlar nəslinin davamçıları olan gənc pedaqoqlar pedaqoji fikrin inkişafına öz töhfələrini verirdilər. Bunların arasında öz dəsti-xətti ilə seçilən Əjdər Ağayev də vardır.

Əjdər müəllim həmişə “Azərbaycan məktəbi”nin taleyi ilə maraqlanmış, pedaqoqlarımızın jurnalla bağlı fəaliyyətlərini də izləmişdir. O çox sonralar M.Mehdizadə ilə bağlı “Həyatı örnək olan insan” adlı məqaləsində (“Azərbaycan məktəbi”, 2003, №1, s. 72-78) yazırdı.

Böyük pedaqoqun hələ 1963-cü ildə “Məktəbdə müəllimlərin qabaqcıl təcrübəsi və bu təcrübədən yaradıcılıqla istifadə edilməsi” mövzusunda çap etdirdiyi məqalədə (“Azərbaycan məktəbi”) qaldırdığı ideyaya ömrünün sonunadək sadiq qalmış, həmişə müəllimin işini məktəb təcrübəsini öyrənməyi təbliğ etmişdir. Təlim-tərbiyə işinin təkmilləşdirilməsinə həsr edilən bütün kitablarında qabaqcıl təcrübəyə həm istinad etmiş, həm də onun mahiyyətini aşkarlamışdır”.

Əjdər Ağayev yalnız pedaqogika tarixini araşdırmaqla qalmamış, həm də o müasirlərinin fikirlərinə də münasibət bildirmişdir. Onun "S.Vurğunun pedaqoji fikirlərinə dair" məqaləsi ("Azərbaycan məktəbi", 1976, №2) daha çox diqqət cəlb edir. Gənc nəslin təlim-tərbiyəsindən bəhs edən S.Vurğun müəllim nüfuzuna yüksək qiymət verirdi. Şair pozitiv qarşılıqlı münasibətlərin qurulmasını, səmimi ünsiyyətin yüksək bacarıq potensialının həyata keçirilməsinin əsası sayırdı. Məqalədə şairin "Elmin gücü" adlı məqaləsi xatırlanır və oradan aşağıdakı sözlər misal göstərilir: "Müəllimə diqqətə qulaq asan şagirdlər evə verilən tapşırıqları yerinə yetirməkdə heç bir çətinlik çəkmirlər". "Məktəb təcrübəsinə əsasən, nizam-intizama riayət edən uşaqlar həmişə müvəffəqiyyətlə oxuyurlar.

Tədqiqatçı alim böyük şairi ən mahir pedaqoq kimi dəyərləndirmişdir: "S.Vurğunun pedaqoji irsi içərisində insanın müəyyən məslək və əqidə sahibi olmasına dair fikirləri də qiymətlidir. Şair əsl mənada vətəndaş olmağı məslək və əqidə sahibi olmaqda görür".

S.Vurğuna görə, pedaqoji ustalıq xalqın mütərəqqi ənənələrindən istifadə etmək, yenilikçi olmaq deməkdir.

“Mirzə İbrahimovun təlim-tərbiyəyə aid fikirlərinə dair” məqaləsində (yenə orada, 1982, №6) Əjdər müəllim böyük yazıçının pedaqoji fikirlərinə iki cəhətdən yanaşır: bir tərəfdən M.İbrahimov xalq maarif komissarı kimi maarif işinin təşkili, məktəb və müəllimin qarşısında duran vəzifələrdən, pedaqoji prosesin təkmilləşdirilməsi, təlim-tərbiyənin keyfiyyətinin yüksəldilməsi kimi məsələlərlə məşğul olur, digər tərəfdən yazıçı-alim pedaqoji problemlərlə əlaqədar fikir söyləyir, öz elmi düşüncələrini açıq bildirməklə bir pedaqoq kimi çıxış edir. Müəllif çox haqlı olaraq, onun bu sahədəki fəaliyyətini yüksək qiymətləndirir və göstərir ki, onun bu sahədəki fəaliyyəti, maarif və pedaqoji fikrimizin inkişafında mühüm yer tutur. Mütəfəkkir alim həm də dünya pedaqoji fikrinin görkəmli nümayəndələrinin irsini

diqqətlə öyrənmiş, mütərəqqi nə varsa onu Azərbaycan pedaqogikasına gətirməyə çalışmışdır. Öz çıxışlarında tez-tez pedaqogikaya, İ.Pestalossinin, K.D.Uşinskinin, H.Zərdabinin, M.Mahmudbəyovun, A.Şaiqin, M.Hadinin əsərlərinə müraciət etməsi onun ən yaxşı pedaqoji ənənələrini, fikirlərini yaşatmaq və inkişaf etdirmək meyili ilə bağlıdır. O bu barədə danışarkən, ən incə mətləblərə toxunurdu. M.İbrahimov "xalqın gələcəyini məktəbin düzgün qurulmasında görürdü".

Ə.Ağayev M.İbrahimovun "təlim-tərbiyə insanı xeyirxah etməlidir" fikrini müdafiə edir və bunun klassik pedaqogika ilə bağlı olduğunu da təsdiqləyir.

Məqalədə M.İbrahimovun uşaqların əməyə alışdırılması, ana dilinin mükəmməl mənimsədilməsi, tədrisdə fənlərarası əlaqənin əhəmiyyəti" və b. məsələlərə də toxunulur. Müəllif öz fikrini belə yekunlaşdırır: "Mirzə İbrahimovun məktəb, müəllim, təlim və tərbiyə haqqında fikirləri öz dolğunluğu, elmi-nəzəri, praktik əhəmiyyəti ilə pedaqoji fikir tariximizdə mühüm yer tutur. Onların diqqətlə öyrənilməsi və əməli iş prosesində nəzərə alınması hər bir müəllimin işinin səmərəliliyini artırmağa kömək edə bilər".

Əjdər müəllim nəzəriyyə ilə təcrübənin birləşdirilməsinə böyük əhəmiyyət verir. Həmişə müasirləri ilə birgə nəfəs alan alim təlimin keyfiyyəti məsələlərinə dair öz fikirlərini tez-tez müəllimlərlə bölüşür və gəldiyi nəticələri mətbuata çıxarır. Onun "Məktəbə rəhbərliyin elmi səviyyəsini yüksəltməli" (yenə orada, 1979, № 12), "Kənd məktəbi və müasir tələblər" (1975, № 5), "Hər bir dərsin keyfiyyətini yüksəltməli" (1975, № 9), "Təlimin təkmilləşdirilməsi sahəsində görülən işlər" (1976, № 4), "Qabaqcıl təcrübəni geniş yayaq" (1977, № 2) və başqa məqalələri müəllimləri düşündürən problemlərə həsr olunmuşdur. Eyni sözləri tərbiyə məsələlərinə də aid etmək olar. Şəxsiyyətin tərbiyəsi kimi qlobal problemlərin tədqiqinə aid araşdırmalar aparan Əjdər müəllim öz fikir və mülahizələrini, pedaqoji fikri məşğul edən məsələləri müxtəlif mətbuat orqanları, o cümlədən "Azərbaycan məktəbi" vasitəsilə ictimaiyyətə çatdırır, onları məktəbin zamanın nəbzindən geri qalmasına imkan verməməyə çağırır. Onun "Tərbiyənin metodları" (1980, № 5), "Şagirdlərin vətəndaşlıq kimliyinin tərbiyəsində ailə və cəmiyyətlə əlbir işin metodları" (1978, № 8), "Tərbiyədə kompleks yanaşma tərbiyə işi təşkilinin metodlarının prinsipi kimi" (1981, № 5), "Məktəbli gənclərin mənəvi tərbiyəsi" (1978, № 12), "Məktəblilərin ailədə vətənpərvərlik tərbiyəsi" (1984, № 10) və başqa məqalələri bu gün də öz əhəmiyyətini itirməyən ideyalarla doludur. Onun əmək tərbiyəsi, fiziki tərbiyə, hüquq tərbiyəsi və b. mövzuda yazılan məqalələri də "Azərbaycan məktəbi" jurnalı oxucularının ürəyindən olmuşdur.

Əjdər müəllimin müstəqillik dövründə təhsilimizin taleyinə dair məqalələri, necə deyərlər, "suların durulmasına" kömək etmişdir. Pedaqoji ictimaiyyətimiz həmişə Əjdər müəllimin sözünə, məsləhətinə ehtiyac duymuş və ona pedaqoji aləmdə nüfuzlu sima kimi baxmışdır.

Ə.Ağayevin son vaxtlar pedaqogika elminə dair nəşr olunan ən sanballı kitablar haqqında yazdığı rəylər də pedaqoji elmimizin inkişaf istiqamətinə müəyyən aydınlıq gətirmişdir. Onun "Azərbaycan məktəbi"ndə (2017, № 2) dərc olunan "Pedaqogikaşünaslıqda yeni mərhələ" məqaləsi də bu qəbildən olan dəyərli yazılardandır.

Əjdər Ağayev öz sanballı əsərləri ilə Azərbaycanın pedaqoji fikir tarixinə daxil olan görkəmli alimlərimizdəndir. Onun həyat yoluna Azərbaycan pedaqoji elminin

üç böyük korifeyi işıq salmışdır: Ə.Seyidov elmi rəhbəri, M.Mehdizadə “Azərbaycan məktəbi” jurnalının redaktorunun birbaşa kuratoru, M.Muradxanlı isə, həmfikiri, məslək dostu olmuşdur.

Təsadüfi deyildir ki, Ə.Ağayevin adı “qızıl sacayaqları (M.Mehdizadə, Ə.Seyidov, M.Muradxanov) və sütunları”nın (N.Kazımov, H.Əhmədov, Ə.Həşimov, Y.Talıbov və b.) bir yerdə çəkilir” (6, 173).

Məqaləni pedaqoji elmlər doktoru, professor Y.Talıbovun aşağıdakı sözləri ilə tamamlamaq istəyirik: “Əjdər müəllim çox yaxşı bilir ki, qəhrəman olmaq üçün bütöv bir ömür yaşamaq lazımdır. Otto Bismarkın çox gözəl bir kəlamı var: “O xalq xoşbəxtdir ki, onun yaxşı müəllimləri var. Azərbaycan xalqı xoşbəxtdir ki, onun Əjdər Ağayev kimi müəllimləri var” (“Azərbaycan məktəbi”, 1997, № 6).

Ə.Ağayev öz sələflərini hörmətlə yad etdiyi kimi, müasirlərinə də hörmətlə yanaşır, gənc nəslə ardıcıl qayğı göstərir.

**Əjdər müəllimə müraciətlə deyirik ki:**
**- Siz bizim xalqımıza, təhsilimizə, gənclərimizə lazımsınız. Sizə can sağlığı və pedaqogika elminin inkişafı naminə uzun ömür arzulayırıq.**

***Rəyçi: akad. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Seçilmiş pedaqoji əsərlər. 2 cilddə, I cild. Bakı: Mütərcim, 2011. 470 s.

2. Ağayev Ə. Seçilmiş əsərləri. IV cild. Bakı: Mütərcim, 2015. 376 s.

3. Ağayev Ə. Mirzə İbrahimovun təlim-tərbiyəyə aid fikirlərinə dair. //Azərbaycan məktəbi, 1982, № 6, s. 54-59.

4. Ağayev Ə. Pedaqoji mətbuat və təlimin təkmilləşdirilməsi. // Azərbaycan məktəbi. 1976, №1.

5. Ağayev Ə. “Azərbaycan məktəbi 50 ildə”. // Azərbaycan məktəbi, 1976, № 10, s.6-12.

6. Rüstəmov F. Pedaqoji oçerklər: sələflərim və müasirlərim. Bakı: Elm və təhsil. 2010.

7. Rüstəmov F. Azərbaycan pedaqogikaşünaslığı. Bakı, 2016. 888 səh.

8. Kazımov N. Pedaqoji fikirlərin salnaməsi.// Azərbaycan məktəbi. 1976, №10.

9. Mehdizadə M. “Azərbaycan məktəbi” jurnalının 50 illiyində giriş sözü. // Azərbaycan məktəbi. 1976, №10.

10. Əhmədov H., Rüstəmov F. Cəfakeş alim. // Azərbaycan məktəbi, 1977, №1.

11. Əliyeva Z. “Azərbaycan məktəbi” 60 ildə. // Azərbaycan məktəbi, 1976, №10. s. 6-12.

**Н.Наджафов,**
**Э.Маммедова**

**Аждара Агаева и “Азербайджан мектеби”**

**Резюме**

В статье повествуется о творческом пути известного азербайджанского ученого-педагога, председателя Совета образования Азербайджана, профессора, заслуженного учителя Аждара Агаева, который в 1974-1981 годах работал главным редактором журнала «Азербайджан мектеби». Также рассмотрены статьи А. Агаева, о формировании педагогических идей в Азербайджане.

**N.Najafov,**
**E.Mammadova**

**Ajdar Agayev and “Azerbaijan mektebi”**

**Summary**

The article tells about the creative path of the famous Azerbaijani scientist-teacher, chairman of the Education Council of Azerbaijan, professor, honored teacher Azhdar Agayev, who in 1974-1981 worked as the editor-in-chief of the magazine "Azerbaijan mektebi". Also are considered the articles of A. Agayev, about the formation of pedagogical ideas in Azerbaijan.



# BÖYÜK ALİM VƏ TƏDQİQATÇI

**Nəsrəddin Musayev,**
***"Azərbaycan məktəbi" jurnalının baş redaktor müavini, Azərbaycan Jurnalistlər Birliyinin üzvü, Respublikanın qabaqcıl təhsil işçisi***

Məqalədə böyük alim, tədqiqatçı, tərcüməçi olan A. Gölpınarlının xidmətlərindən danışılır. Onun ümumtürk ədəbiyyatı tarixində mükəmməl tədqiqatçılıq qabiliyyətinə malik nadir şəxsiyyət olduğu, bir-birindən qiymətli əsərləri ilə ədəbiyyatşünaslıq elmini zənginləşdirdiyi qeyd olunur. Elm aləmində 114 kitabı, 400-dən çox məqaləsi ilə tanınan, milliyyətcə azərbaycanlı olan alimin həyatı və yaradıcılığı haqqında respublikamızın müvafiq dərsliklərində məlumatların verilməsi tövsiyə olunur.

***Açar sözlər:*** *A.Gölpınarlı, böyük elm xadimi, ədbiyyatşünaslıq elmi, əxlaq, ədəb, tərbiyə.*

***Ключевые слова:*** *А.Гельпинарлы, великий ученый, литературная наука, нравственность, мораль, воспитание.*

***Key words:*** *A.Gelpinarli, great scientist, literary science, morality, morals, education.*

Abdülbaqi Gölpınarlı nadir yetişən çoxşaxəli yaradıcılıq manerasına malik elm xadimlərindəndir. Alim, şair və ədəbiyyat tarixçisi olan Gölpınarlı ədəbiyyat, ədəbiyyat tarixi və İslam tarixinə dair araşdırmalar aparmış, bir-birindən sanballı kitab və məqalələr yazmışdır. Onun araşdırmaları bir çox mətbuat orqanlarında, o cümlədən Türkiyənin "Azərbaycan Yurt Bilgisi", "Türkiyat", "Şarkiyat", "Türk dili" kimi jurnallarında, Aylıq Ensiklopediya, Türk Ensiklopediyası və İslam Ensiklopediyasında nəşr olunub. Görkəmli alimin bir-birindən qiymətli tədqiqatları ilə türk təriqət və təsəvvüf tarixinə dair məlumatlar zənginləşmiş, Yunus Əmrə, Mövlana və Mövləviliklə bağlı mühüm irəliləyişlər baş vermişdir. Divan şeirinin ən seçmə nümunələrindən bəzilərinin mətnlərini, ön söz və izahlarla yeni nəsillərə çatdırmaq onun çoxşaxəli fəaliyyət dairəsinə aiddir. Mövlana Cəlaləddin Ruminin əsərləri də türk ədəbi ictimaiyyətinə onun xidməti ilə külliyyat halında təqdim olunmuşdur.

Azərbaycan əsilli görkəmli ədəbiyyatçı Abdülbaqi Gölpınarlı 12 yanvar 1900-cü ildə İstanbulda anadan olmuş, İstanbul Universitetinin ədəbiyyat fakültəsini bitirişdir. Onun nəsli Gəncə yaxınlığında olan Gölbulaq kəndindəndir.1877-1878-ci illərdə rus-türk müharibəsində babası Bursaya, oradan da İstanbula köçmüşdür. Atası Əhməd Agah, anası Qafqaz əsilli Aliyə Şöhrət xanımdır. Abdülbaqiyə əvvəlcə babası Mustafa İzzətin adı verilmiş, ancaq ailənin uşaqları yaşamadığı üçün, uğur gətirməsi diləyi ilə, "Abdülbaqi"- deyə çağırılmış, daha sonra isə bu onun əsl adı olmuşdur. Atası ömrünün sonuna qədər dövrünün sayılıb-seçilən qəzeti olan "Tərcümani-həqiqət"in fəal müxbirlərindən olmuş, jurnalistika sahəsindəki xidmətlərinə görə ona "müxbirlər şeyxi" adı verilmişdir.

Abdülbaqi Gölpınarlı ilk təhsilini

İstanbuldaki Yusif əfəndi məktəbində almışdır. Lisey təhsilinə isə Gelembevi liseyində başlamış, amma 1915-ci ildə atasının ölümü səbəbi ilə sonuncu sinifdə oxuyarkən təhsildən ayrılmaq məcburiyyətində qalmışdır. 1918-ci ildə anası ilə birgə Çorumun Alaca mahalına getmiş, burada Kenzülirfan ibtidai məktəbində 4 il baş müəllim və baş muavin olaraq çalışmışdır. 1923-cü ildə Cümhuriyyətin elanından sonra təkrar İstanbula dönmüşdür. Liseyin son sinfini bitirə bilməməsi səbəbindən arzu etdiyi ədəbiyyat fakültəsinə qəbul ola bilməmişdir. Buna görə də Kişi Müəllim Məktəbinə qəbul olmuş, 1927-ci ildə buranı müvəffəqiyyətlə bitirmişdir. Ali təhsil almaq arzusunu reallaşdırmaq üçün 1930-cu ildə İstanbul Universitetinin ədəbiyyat fakültəsini bitirmişdir. Əvvəlcə Konya liseyində, sonra isə Kayseri, Kastamonu, Balıkesir liseylərində müəllimlik etmişdir.

Universitetdə Fuad Köprülünün rəhbərliyi ilə yazdığı “Məlamilik və Məlamilər” adlı buraxılış işinin 1931-ci ildə nəşr olunması ilə akademik həyata başlamışdır. 1937-ci ildə “Yunus Əmrənin həyatı” mövzusunda doktorluq işini müdafiə etmiş, 1939-cu ildə Ankara Universitetinin dil, tarix və coğrafiya fakültəsinə müəllim təyin olunmuşdur. Burada fars dilindən dərs demiş və mühazirələr oxumuşdur. 1942-ci ildə isə İstanbul Universitetinin ədəbiyyat fakültəsinə keçərək burada İslam-türk təsəvvüf tarixindən və ədəbiyyatdan dərs demişdir.

1945–ci ildə Marksist fəaliyyətlə məşğul olmaq bəhanəsi ilə həbs olunmuş, on ay sürən istintaqdan sonra 25 fevral 1946-cı ildə bəraət almışdır. Ömründə bir dəfə evlənib boşanmış, sonra isə heç evlənməmişdir. Övladlığa götürdüyü şəxslə birlikdə uzun illər İstanbulun Çiçəkçi səmtindəki evində yaşamışdır. İnanc etibarı ilə Cəfəri məzhəbinə və Mövləvi təriqətinə mənsub olan Gölpınarlı, kitablarını Mövlana muzeyi ixtisas kitabxanasına bağışlamışdır. 1949-cu illdə İstanbul Universitetinin ədəbiyyat fakültəsindən təqaüdə çıxdıqdan sonra elmi araşdırmalarına davam etmiş və əsərlərinin çoxunu bu dönəmdə yazmışdır. 25 avqust 1982-ci ildə isə İstanbulda vəfat etmişdir.

İslam dünyası ədəbi fikrinin böyük nümayəndələrindən biri olan Abdülbaqi Gölpınarlının elm aləminə 114 kitabı, 400-dən artıq məqaləsi məlumdur. O, 1932-1933-cü illərdə istifadədə olan dərsliklər də yazmışdır. Bunlar arasında din dərslərinə aid olanlar çoxluq təşkil edir. Ədəbiyyatşünaslıq elmi sahəsində çox az alimə nəsib olan bu qədər nailiyyətlərə malik bir soydaşımızın, təəssüflər olsun ki, yaradıcılığı tədqiqatçılarımızın diqqətindən kənarda qalıb. Odur ki, bu elm xadiminin, haqqında məlumat əldə etdiyimiz bir neçə əsər haqqında məlumat verməyi məqsədəuyğun hesab edirik: “Məlamilik və Məlamilər” (1931). Gölpınarlı türk elmi sahəsində ilk olan və ona böyük şöhrət gətirən bu əsərini ədəbiyyat fakültəsindən buraxılış işi kimi qələmə almışdır; “Füzuli Divanı” (1948). Orta əsr Azərbaycan türk şairi, mütəfəkkir və filosof, Azərbaycan və türk ədəbiyyatı tarixində divan janrının ən məşhur və görkəmli nümayəndələrindən biri kimi tanınan, bir çox təzkirələrdə Bağdadi təxəllüsü ilə anılsa da, Bağdadda deyil, onun yaxınlığındakı məşhur Kərbala şəhərində doğulduğu məlum olan Məhəmməd Füzulinin həyat və yaradıcılığına həsr olunub; “Yunus Əmrə. Həyatı” (1936). Yunus Əmrə haqqında məlumatları daha da zənginləşdirən və onun həyatından bəhs edən tədqiqat işidir; “Divan ədəbiyyatı bəyanındadır” (1945). Divan ədəbiyyatını hərtərəfli qüsurlu göstərmək məqsədi daşıyan, geniş müzakirələrə səbəb olan tənqidi səpkili əsərdir. Böyük ədəbiyyatşünas sonralar bu əsəri yazdığına görə peşmançılığını ifadə etmiş, divan şeiri-

ni tanıtma istiqamətində araşdırmalar aparmışdır; "Mövlana Cəlaləddin: həyatı, fəlsəfəsi, əsərləri" (1951, 1985). Mövlana və silahdaşları haqqında ətraflı məlumat verilir; "Mövlanadan sonra mövləvilik" (1953). Mövlanadan sonrakı mövləvilik haqqında ətraflı məlumat verilir; Nəsimi, Usuli, Ruhi (1953). Bu əsərində Nəsimi, Usuli və Ruhinin həyat və yaradıcılığından bəhs edir, şeirlərdən nümunələr verir və onları şərh edir. Rəfinin Nəsimiyə həsr etdiyi məşhur "Bəşarətnamə"sinin izahını verir. Əsərdə Gölpınarlının Nəsimiyə özünəməxsus yanaşmasının şahidi oluruq. Alevi-Bektaşi nəfəsləri (1963); Hürufilik mətnləri kataloqu (1973).

Onun məslək yaşamında Mövlana, mövləvilik və təsəvvüflə bağlı tədqiqatları xüsusi önəm daşıyır. Dərin təhlillərlə qələmə aldığı "Yunus Əmrə" və "Füzuli" divanlarından sonra "Mövlana Cəlaləddin" və "Mövlanadan sonra mövləvilik" adlı kitabları, hətta ədibin əleyhdarları tərəfindən də müsbət dəyərləndirilib. Bu əsərlərində tarixi faktların ədəbi fikir üzərindəki təsirlərini göstərərək, yunan fəlsəfəsi ilə müqayisədə İslam fəlsəfəsinə yüksək qiymət verən Gölpınarlı, Mövlananı və mövləviliyi dövrün xüsusiyyətləri əsasında araşdırıb. Vəhdəti-vücud, Mövlanaya görə fəlsəfə və təsəvvüf, din və insanlıq, Mövlana və müasirləri mövzularında suallara cavab, şeirlərindən nümunələr verərək təhlillər və ümumiləşdirmələr aparıb. "Mövlanadan sonra mövləvilik" isə ədəbiyyatı, musiqisi, ədəb və ərkanı, əsas mənbələri, fəlsəfəsi, formalaşması və təsirləri ilə yalnız bir təriqətin deyil, XIII əsr sonrasının tarixi xüsusiyyətini özündə əks etdirir. Elmi araşdırmaları ilə yanaşı gəncliyindən başlayaraq klassik üslubda şeirlər də yazan Gölpınarlının bir "Divan"ı da var.

Ərəb və fars dilində yazılmış əsərləri türk dilinə mükəmməl tərcümə etməsi onun elmi fəaliyytətinin başqa bir istiqamətidir. Məhəmməd Peğəmbərin həyatına dair yazdığı əsərlər dövrünün və özündən sonrakı elm adamlarının marağına səbəb olub. İslam tarixçisi olmasa da, bu sahədə tədqiqatlar aparmış, tələbələr üçün yazdığı kitablarında kainatın sonuncu peyğəmbərinin həyatını və şəxsiyyətini özünəməxsus tərzdə, fərqli şəkildə izah etmiş, bəzi hadisələrə xüsusi izahlar vermişdir. "Sosial baxımdan İslam tarixi" və "Həzrəti Məhəmməd və hədisləri" adlı əsərlərində peyğəmbərin həyatından bəhs etdikdən sonra, yeni başlıqlar altında onun xüsusiyyətlərini tanıtmağa çalışmışdır. Onun gözəl əxlaqı, zəhmətsevərliyi, qətiyyətliliyi, ədaləti və humanistliyi kimi bəşəri xüsusiyyətləri ilə bağlı qiymətli fikirlər söyləmişdir. İslam tarixinə dair yazdığı kitablarda Həzrəti Əli, on iki imam, Həzrəti Fatimə ilə əlaqəli araşdırmaları da önəmli yer tutur.

Abdülbaqi Gölpınarlı din, təsəvvüf, ədəbiyyat, tarix, sahələrində qiymətli tədqiqatlar aparan, çoxşaxəli yaradıcılığa malik elm xadimidir. Çoxlu sayda kitab və məqalələr yazan, tərcümələr edən Gölpınarlının bütün əsərləri haqqında məlumat vermək bir məqalənin imkanı xaricindədir. Onlardan yalnız İslam tarixi və peyğəmbərin həyatına dair bir neçə əsəri haqqında məlumat verməyi vacib sayırıq.

Abdülbaqi Gölpınarlı universitetdə aldığı təhsil etibarı ilə ədəbiyyat tarixçisi olsa da, təsəvvüf tarixini də öyrənmişdir. Bu səbəblə də bir çox əsərlər yazmışdır.

1. "Sosial baxımdan İslam tarixi, Həzrəti Məhəmməd və İslamın ilk dövrü".

Peyğmbərin həyatını və İslamın ilk dövrünü izah edən, 1969, 1975 və 1991-ci illərdə nəşr olunan, 476 səhifəlik bu kitabın birinci bölümü peyğəmbərin nəslini tanıtmaqla başlayıb, doğumu, peyğəmbərlik öncəsi və sonrasını əhatə edir. İkinci bölümdə səmavi kitablardan Tövrat, İncil və Qurani-Kərim haqqında məlumat verir, daha sonra İslam dininə aid bəzi prinsiplərə yer ayrılır. Böyük ədəbiyytşünas bu bölümdə İslamda insan və ağıl, azadlıq, bərabərlik kimi sərlövhələr altında İslam dinini izah edir. Üçüncü bölümdə dörd xəlifə dövrü haqqında və Kərbəla hadisəsi ilə bağlı geniş məlumat verilir.

2. "Həzrəti Məhəmməd və hədisləri".

1957, 1962, 1964, 1972 və 2010 –cu illərdə nəşr olunan 250 səhifəlik bu kitabda Peyğəmbərin həyatını xülasə şəklində verdikdən sonra onun min bir hədisi çeşidli başlıqlar altında verilir. Bu əsərdə əxlaq, ədəb, tərbiyə və cəmiyyət həyatına aid hədislər yer alıb.

3. “On iki imam”. Şiə məzhəbinin qəbul etdiyi on iki imamın həyatından bəhs edən bu əsər 1958 , 1979 və 1989 –cu illərdə nəşr olunmuşdur. 250 səhifədən ibarət olan bu kitabda şiə inancındakı on iki imamın həyat hekayələri ardıcıllıqla şərh olunur.

4. “Möminlərin əmiri həzrət Əli”. Görkəmli ədəbiyyat tarixçisinin Həzrəti Əliyə həsr etdiyi bu əsəri 1978 və 1993-cü illərdə nəşr olunub. 420 səhifəlik bu kitab 7 bölümdən ibarətdir. Birinci bölümdə Həzrəti Əlinin hicrətdən əvəllki həyatına, ikinci bölümdə Peyğəmbərin vəfatına qədər olan dövrünə, üçüncü bölümdə Peyğəmbərin vəfatından öz xəlifəliyinə qədər olan dövrə, dördüncü bölümdə Əlinin şəhadətinə, beşinci, altıncı bölümlərdə Qurani-Kərim və hədislərdə Həzrət Əliyə, yeddinci bölümdə isə Əlidən yığcam nümunələrə yer verilmişdir.

Ədəbiyyat tarixinin Mövlana, Yunus Əmrə, Xətai və Füzuli kimi çox böyük simaları ilə bağlı apardığı tədqiqatlar və onlara həsr etdiyi əsərlər, bu sahədəki tərcümələr, yazdığı şeirlər də A.Gölpınarlının XX yüzilliyin böyük elm xadimlərindən biri olmasının təsdiqidir. O, Osmanlı mədəniyyətini gələcək nəsillərə çatdıran körpü şəxsiyyətlərdən biri hesab olunur.

Tədqiqatçıların ümumi qənaəti belədir: Abdülbaqi Gölpınarlı çox mükəmməl yaddaşa, Divan ədəbiyyatı və təsəvvüf üçün lazımlı olan İslami biliklərə malik, Quranı əzbərdən bilən nadir şəxsiyyət olub. Təsəvvüf sahəsində öz dövrünün ən qüdrətlisi hesab edilir. O, dəniz dalğaları kimi coşub-qabaran, sonra durulan bir ruha sahib idi. Zəngin söz ehtiyatına malik olması etdiyi bütün tərcümələri orijinalına yaxın bir zövqlə oxumağa zəmin yaradır. Bu xüsusiyət hər tədqiqatçıya nəsib olmur.

Bir-birindən qiymətli əsərləri ilə ədəbiyyatşünaslıq elmini zinətləndirən, milli iftixarımız olan böyük elm xadimi A.Gölpınarlının mənsub olduğu xalqın tədqiqatçılarının diqqətindən kənarda qalması, təhsil müəssisələrində, müvafiq dərsliklərdə həyatı və yaradıcılığı haqqında məlumatların verilməməsi təəssüf doğurur.

***Rəyçi: prof. E.Quliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. A.Alparslan. A.Gölpınarlının bioqrafiyası. Mədəniyyət Nazirliyi, Ankara, 1996.
2. A.G.Sayar. A.Gölpınarlının bioqrafiyası. İstanbul, 2013.
3. A.Gölpınarlı. Sosial cəhətdən İslam tarixi: Hz.Məhəmməd və İslam. İstanbul, 1985.
4. Tanımadığımız böyük ədəbiyyatşünas. // Azərbaycan dili və ədəbiyyatı tədrisi. 2013, № 3.

**Н.Мусаев**

**Великий ученый и исследователь**

**Резюме**

В статье рассматриваются заслуги великого ученого, исследователя и переводчика А. Гельпинарли.

Отмечается, что он был редким человеком с прекрасной памятью, обогативший литературную науку своими ценными работами. Рекомендуется предоставлять информацию, о его жизни и творчестве, в учебных заведениях республики и соответствующих учебниках.

**N.Musayev**

**Great scientist and researcher**

**Summary**

It is noted that he was a rare man with a beautiful memory, enriching literary science with his valuable works. It is recommended to provide information about his life and work, in the educational institutions of the republic and relevant textbooks.



# TƏLİMDƏ FƏALİYYƏTİN AKTUAL MƏSƏLƏLƏRİ



**Şahrza Ağayev,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***ADPU-nun dosenti***

**Samir Mehdizadə,**
***Bakı şəhəri, 286 nömrəli tam orta məktəbin direktoru***

Məqalədə təlim prosesində iştirakçıların insan resursları baxımından idrak fəaliyyətinin təmin olunmasını şərtləndirən mənəvi enerjinin mahiyyəti, ondan istifadənin texnoloji cəhətləri, başlıca amilləri nəzəri və praktiki olaraq təhlil edilmiş, müvafiq tədqiqat nəticələri təsbit olunmuşdur.

***Açar sözlər:*** *təlimdə fəaliyyət, mənəvi enerji, faydalılıq dərəcəsi, resurslar, informasiyalar, taksonomiyalar, mərhələlər.*

***Ключевые слова:*** *учебные мероприятия, духовная энергия, степень полезности, ресурсы, информация, таксономии, этапы.*

***Key words:*** *training activities, spiritual energy, degree of utility, resources, information, taxonomies, stages.*

Bəşəriyyətin ahəngdar inkişafı ilk növbədə bütün şüurlu insanların məqsədyönlü fəaliyyətinin normal enerji təminatları ilə bağlıdır. Aparılan nəzəri və praktik səciyyə daşıyan araşdırmalardan aydın olur ki, dünya təhsilinin keyfiyyət baxımından səviyyəsinin yüksəldilməsində alimlərimiz ümumilikdə fəaliyyət prosesində baş verən əməliyyatların sisteminə daha çox diqqət göstərirlər. Lakin həmin dəyişikliklərin səmərəli həllində iştirak edən tərəflərin (öyrədən və öyrənən) normal iş görmə qabiliyyətlərinin təminatına uyğun enerji amili ilə bağlı elmi fikirlər demək olar ki, pedaqoji mövzu olaraq tədqiqata geniş cəlb edilmir. Pedaqoji prosesdə təlimin başlıca məqsədi öyrənənlərin şüurunda dünyanın düzgün, dolğun mənzərəsini yaratmaq, onların intellektual inkişafını və tərbiyəsini təmin etməkdir. Bir anlığa dərindən düşünsək, məlum olar ki, qarşıya qoyulan məqsədin uğurlu həlli ilə əlaqədar yaranan ziddiyyətlərin müəyyənləşdirilməsi, onların aradan qaldırılmasının qanunauyğunluqları, hərəkətverici qüvvələrin tapılması, müvafiq prinsiplərin və metodların müəyyənləşdirilməsi və s. mərhələlərin hər biri kifayət qədər mənəvi enerjinin hesabına reallaşmış olur (1).

Təsəvvürlər, anlayışlar və qanunlar formasında dünyanı öyrənənlərin (şagirdlər, tələbələr) şüurunda əks etdirilməsi enerji hesabına yaranan qabiliyyətlərlə şərtlənir.

Pedaqoji prosesdə didaktik məqsədə nail olmaq üçün istifadə olunan yollar təlim metodları olub, enerjiyə əsaslanan qabiliyyətlə tənzimlənir. Təlim metodlarının təsnifatında vahidlik olmasa da, onlar bilik mənbələrinə (söz, əyani və praktik); didaktik vəzifəyə (yeni biliyin verilməsi, bilik və bacarıqların möhkəmləndirilməsi, yoxlanılması); öyrənənlərin dərketmə fəaliyyətinə (izahlı-illüstrativ, reproduktiv, problemli

şərh, tədqiqatçılıq) və bir çox cəhətlərə görə ayırd edilir.

İstifadə edilən hər bir metodun özündə müxtəlif tərzlərin (priyomların) birləşməsini nəzərə alsaq, onda bu prosesdə sərf olunan enerjinin tamlığı zərurəti barədə düşünmək olar (2).

Pedaqoji proses dedikdə, tərbiyə, təhsil, təlim və inkişafla bağlı həyata keçirilən texnoloji əməliyyatların məcmusu başa düşülür. Belə olan təqdirdə mənəvi enerji olmadan bu sahədə hər hansı bir məqsədin həllindən danışmaq olmaz.

İctimai münasibətlərin məcmusu olan insan şəxsiyyəti təbiətə və cəmiyyətə müəyyən təsir etməklə (enerji hesabına) özü də dəyişir.

Pedaqoji prosesdə təlim hazırlığının ümumi məqsədi şagirdlərin imkanları, yaş xüsusiyyətləri, yaxın inkişaf səviyyələri ilə sosial formalaşma vəzifələrini təmin etməkdir. Bunun üçün müəllimin pedaqoji təsiri (xarici qüvvə) şagirdin mənəvi aləmi ilə transformasiya (enerji çevrilməsi) olunaraq iş görməyə, fəaliyyətə yönəlir. Burada qarşıya qoyulan məqsəd öyrənənlərin idrak tələbatlarının təmin olunma obyektinə çevrilməsi onların aktiv fəaliyyətə qoşulmasının düz mutənasiblik asılılığı hərəkətverici qüvvədir.

Pedaqoji prosesdə qarşıya qoyulan məqsədin şagirdin marağına çevrilməsinin səviyyəsi təlim hazırlığının enerji baxımından faydalılıq dərəcəsi ilə şərtlənir. Bu mühüm cəhət keyfiyyət göstəricisi olub müasir pedaqoji texnologiyanın predmeti kimi tədqiq olunmalıdır (3). Burada məsələnin bir şagirdin fəaliyyəti və kollektiv üçün (induktiv və deduktiv) tədqiqi xüsusi mahiyyət daşıyır. Təlim hazırlığı prosesində öyrənənlərin dərk edilmiş və dərk edilməmiş motivlərlə bağlı mənəvi enerji məsrəfində faydalılıq müqayisə edildikdə, məlum olur ki, bu nisbət daimi dəyişərək yaranan ziddiyyətlərin mahiyyətindən asılıdır. Ibtidai siniflərdə oxuyan şagirdlərin təhsilə marağı digər mərhələlərlə müqayisədə həmişə yüksək olur. Buna əsas səbəb kimi fənlərin əksəriyyətinin eyni bir müəllim tərəfindən tədris olunması və onların fiziki və zehni əməyin nəticələrindən zövq almalarıdır. Problemlə bağlı konseptual səciyyə daşıyan tələblər irəli sürən akademik Mehdizadənin fikirləri həmişə aktuallığını saxlayır:

- şagirdlərin sərf etdikləri hər növ əməyin ,göstərdikləri hər növ fəaliyyətin təlim-tərbiyə məqsədlərinə, o cümlədən əmək tərbiyəsi məqsədinə tabe edilməsi;
- şagirdlərin sərf etdikləri əməyin ictimai əhəmiyyətini dərk etmələri;
- şagird əməyinin onların qüvvə və imkanlarına uyğun olması;
- ictimai- faydalı işlərin və əmək tapşırıqlarının sistematikliyini və planlığını təmin etmək;
- şagirdlərin əmək fəaliyyətinin müxtəlifliyini təmin etmək;
- şagirdlərin iştimai-məhsuldar əməyinin kollektiv səciyyə daşıması (7).

Müəllim təlim hazırlığı prosesində şagirdin mənəvi gücünün səviyyəsini dəqiq bildiyi üçün onun enerjisini düzgün tətbiq etməyə, faydalılıq dərəcəsini yüksəltməyə nail olur. İnkişaf etmiş ölkələrdə təhsildə kurikulumun tətbiqinə həmişə diqqət göstərilir. Ona görə ki, təlim standartlarla həyata keçirilir, bilik və fəaliyyət arasinda düz mütənasiblik təmin edilir, öyrənənlərin aktiv fəaliyyəti motivləşdirilir, faydalılıq yüksəldilir, enerji itkisi minimuma endirilir.

Valideynlər birmənalı olaraq övladlarının təlim nəticələrinin yüksək səviyyədə olmasını arzu edirlər. Bu istəyi bütün şagirdlər üçün eyni dərəcədə reallaşdırmaq hər bir fərdin düşünməyə yönəltmə, dərketmə və düşünmə kimi idrak fazalarının malik olduqları enerji payı ilə əlaqədardır (3).

İbtidai siniflərdə “Texnologiya”dan təhsil alanların fəaliyyətinin izlənilməsi və qiymətləndirilməsində səviyyələrə uyğun enerji sərfinin tənzimlənməsinə aid nümunə göstərməyi məqsədə uyğun sayırıq.

II –sinif Texnologiya.

1. Emal texnologiyaları.

1.2. Emal prosesində hazırlıq işlərini yerinə yetirir.

1.2.1. Hazırlanacaq məmulata görə iş yerini təşkil edir (alt məzmun standartı).

• Hazırlanacaq məmulata görə iş yerinin təşkilin nümayiş etdirir (təlim məqsədi).

• Təşkiletmə (dərsin gedişində qiymətləndirmə aspekti).

• Məmulat, iş yeri (açar sözlər).

Təlim hazırlığının enerji amili nəzəriyyə ilə praktikanın, yəni biliklə fəaliyyətin (standart) nə dərəcədə bir-birini tamamlamasında özünü aydın göstərir. Qeyd olunan məzmun standartının təlim prosesində reallaşdırılmasına cəlb edilən 100 şagirdin 60%-nin birinci və ikinci səviyyə, 25 %-nin üçüncü səviyyə və 15 %-nin dördüncü səviyyə nümayiş etdirmələri onların mənəvi enerjinin nə dərəcədə faydalı olması barədə təsəvvür yaradır. Bu o deməkdir ki, müəyyən məsafəni qaçmağa cəlb edilən 100 nəfər ikinci sinif şagirdindən 15-i birinci, 25-i ikinci, qalanları isə əvvəlkilərdən sonra tapşırığa əməl etmiş olurlar.

Aparılan tədqiqatlar sübut edir ki, alınan nəticələrin keyfiyyət baxımından yüksəldilməsi üçün nəzəriyyə ilə praktikanın əlaqəsini təmin edən aşağıdakı fəlsəfi, pedaqoji və psixoloji qanunauyğunluqlar mühüm əhəmiyyət kəsb edir, enerjinin faydalılığını artırır, əlavə itkiləri (vaxt, çaşqınlıq, səhvlər) azaldır:

• Təlimin effektivliyi və keyfiyyəti praktika ilə yoxlanılır, təsdiq olunur istiqamətləndirilir.

• Təlimin nəticələrinin tətbiq sahəsi olan praktika həqiqətin meyarıdır, idrak fəaliyyətinin mənbəyidir;

• Böyüməkdə olan nəsli fəal dəyişdirici fəaliyyətə hazırlayan düzgün qurulmuş təhsil-tərbiyə həyatın, praktikanın özündən doğur;

• Şəxsiyyətin formalaşmasının effektliyi təlim hazırlığında enerjinin texnoloji fəaliyyətə cəlb edilməsi, onun məzmunu, növləri, formaları və istiqamətləri ilə müəyyən olunur;

• Şagirdlərin əmək və istehsal fəaliyyəti nə qədər dolğun olarsa, onların ümumi hazırlığının keyfiyyəti bir o qədər yüksək olar.

Bu ideyanın mahiyyətində xüsusi yer alan əmək, istehsalat, fəaliyyət kimi açar sözlərdən bir daha aydın olur ki, qazanılan nailiyyətlər insanda qabiliyyət yaradan mənəvi enerjidən asılıdır.

Hər bir insanın normal fəaliyyəti onun yaşına uyğun olaraq gündəlik rejimə daxil olan tələblərin həyata keçirilməsindən asılıdır. Aparılan müşahidələr göstərir ki, sutka ərzində rejimə əməl etməyən şagirdin təlim hazırlığı aşağı səviyyədə olur. Araşdırmalar göstərir ki, şagirdlərdə gözlənilən qabiliyyətlərin inkişafı məhz öz fəaliyyətini rejimə uyğunlandırmaqla bağlıdır.

Müasir dərsin ilkin mərhələsi motivasiya ilə başlanır. Müəyyən problemlə məktəbə gələn, hər hansı səbəb üzündən normal vəziyyətdə olmayan, istedadlı şagird üçün müsbət motivin olması mümkünsüzdür. Çünki onun rejimi pozulub. Pedaqogika və psixologiya elmləri şagird şəxsiyyətinin inkişafı ilə əlaqədar araşdırmalar aparır yeni-yeni qanunauyğunluqlar müəyyənləşdirir, prinsiplər, metodlar irəli sürür. Bütün məsələlərin nüvəsində hərəkətverici mənəvi güc dayanır. Bu barədə zəruri addımların həyata keçirilməsini kurikulum islahatında görmək olur. Bu da həmin konseptual sənədin inteqrativ, nəticəyönümlü və şagirdyönümlü xarakterə malik olmasındadır. Vaxta qənaət, resursların və informasiyaların insanların maraq və mənafelərinə xidmət etməyə yönəldilməsi məhz faydalılıq əmsalının artırılmasına xidmət edir (3). Ümumtəhsil fənn kurikulumlarının əhəmiyyəti, məqsəd və vəzifələrində qeyd olunan

bu başlıca cəhət aparıcı rol oynayır. Şagirdlərin təlim hazırlığında texnoloji bilik və bacarıqlara yiyələnmələri, öz fəaliyyətlərində itkiyə (faydasız) yol vermədən onlardan səmərəli şəkildə məqsədyönlü istifadə edə bilmələri bütün dünyada qarşıya qoyulan vəzifə kimi diqqətdə saxlanılır. “Texnologiya”nın bir fənn kimi ümumtəhsil məktəblərində tədrisi məhz bu zərurətdən irəli gəlir.

Təlim hazırlığında nümayiş olunan bacarıqlar şagirdlərin qabiliyyətlərinin göstəricilərini əks etdirir. İbtidai sinif şagirdləri “Texnologiya” fənninin məzmun xətləri üzrə aşağıdakı bacarıqları müxtəlif səviyyələrdə nümayiş etdirmiş olurlar.

- Sadalama, adlandırma və tanıma bacarıqları;
- Seçmə, müəyyənləşdirmə, fərqləndirmə, izahetmə, şərhetmə, təşkiletmə və münasibət bildirmə bacarıqları;
- Hazırlama, əmələtmə, tərtibetmə, təqdimetmə, nümayiş etdirmə, təsvirçəkmə bacarıqları;

Məzmun standartları fəaliyyət baxımından idraki, emosional və psixomotor bacarıqlara bölünür (5). Qeyd olunan bacarıqlar deklarativ, prosedural, konteksual biliklər hesabına yaranır. Kurikulum nəzəriyyəçiləri standart (bilik və fəaliyyət) tərtib edənlərə kömək üçün təhsilə yararlı olan idraki, emosional və psixomotor taksonomiyanın mərhələlərini ifadə edən felləri müəyyənləşdiriblər. Enerji ilə bağlı olan, hərəkət bildirən feillər bacarıqların ifadə edilməsində başlıca göstəricidir. Feil bacarığın taksonomiyanın hansı mərhələsinə aid olduğunu əks etdirir.

Taksonomiyalar təlim hazırlığında prosesi ardıcıl və səmərəli qurmağa optimal şərait yaradır. Şagirdlərdə təlim hazırlığı prosesində mənəvi enerjinin canlı biliyin imkanlarının genişlənməsinə nail olmaq, müasir yanaşma texnologiyasına aid edilir. Fəaliyyətdə olan bilik daim faydalılığı ilə seçilir. Bu bilik yeni biliklərin yaranması üçün baza rolunu oynamaqla yanaşı, eyni zamanda müvafiq əməli fəaliyyət sahələrində tətbiq olunur. Cansız bilik yalnız başqalarının təfəkkürünün məhsuludur. Bilik hafizədən fikir faktına, canlı düşüncə prosesinin bir ünsürünə çevrildikdə o özü də canlanır. Daha sonra nəzəri və əməli fəaliyyətin təməlinə yönəlir (6).

İnkişaf etmiş ölkələrin təcrübəsindən məlum olur ki, kurikulumların istinad etdiyi prinsiplərin həyata keçirilməsinə müasir pedaqoji texnologiyalardan səmərəli istifadə etməklə nail olmaq mümkündür. Ona görə ki, yeni pedaqoji texnologiyaların mahiyyəti və məzmununda həmin prinsiplər əks olunmuşdur. Bura daxildir:

- şagirdyönümlülük;
- fəal müstəqil və birgə təlim fəaliyyəti imkanlarının yaradılması;
- təlimin inteqrativliyi;
- təlimin məzmun və nəticələrinin təlim alanların məktəbdən sonrakı həyat fəaliyyəti və cəmiyyətlə əlaqəli olması.

Təlim fəaliyyətinin göstəricilərinin yüksək olması öyrənən üçün lazım olan gündəlik kalorinin təmin olunma miqdarından asılıdır. Aparılan hesablamalara görə əqli işlə məşğul olanlara gündə 3000, mexaniki, fiziki işlə məşğul olanlara 3500, ağır fiziki əməklə məşğul olanlara 5000, idmançılara isə 6500-7000 kalori lazımdır.

Təlim məqsədlərinə nail olmaq dərəcəsini izahetmə, fərqləndirmə, təsviretmə, ümumiləşdirmə, təbliğetmə meyarlar üzrə qiymətləndirmək olar. Hər bir meyara uyğun enerji payının fərqli olduğu nəzərə alınmalıdır.

Dərsdə təlim məqsədlərinə nail olmaq üçün ardıcıl olaraq A, B, C, D, mərhələləri üzrə texnoloji əməliyyatlar aparılmalıdır.

A – Verilən mətn və suallar əsasında maraq oyatma (motivasiya). Mövzu ilə əlaqədar tədqiqat sualının qoyulması.

(düşünməyə yönəltmə).

B – Mətnin dərslik üzrə oxunuşu tapşırığının icrası. Qrupların yaradılması. İş vərəqlərin paylanması. Tədqiqat sualının cavablandırılması (dərketmə).

C – Müəllim tərəfindən təşkil olunmuş müzakirə zamanı təlim məqsədlərinə aid sualların şagirdlər tərəfindən cavablandırılması (düşünmə).

D – Şagirdlərin diqqətinin tədqiqat sualına yönəldilməsi.

Tədris olunan mövzunun tədqiq olunması ilə əlaqədar fərziyyələrə aydınlıq gətirilir, ümumiləşmə aparılır, zəruri tövsiyələr verilir.

Sonda qiymətləndirmə təlim məqsədlərinə müvafiq olan meyarlara əsasən bacarıqlar üzrə aparılır.

Mövzu ilə əlaqədar aşağıdakı nəticələri söyləmək olar.

• Təlimdə subyektlərin fəaliyyətinin onların mənəvi gücünə görə təşkili təhsildə keyfiyyəti yüksəldir.

• Öyrənənlərin pedaqoji prosesdə qarşıya çıxan ziddiyyətlərin aradan qaldırılması ilə hərəkətverici qüvvəsi onların malik olduqları enerjinin faydalılıq dərəcəsi ilə düz mütənasibdir.

• Öyrənənlərin biliyinin bacarığa çevrilmə səviyyəsinə uyğun olaraq fərdi yanaşma enerji amilinin faydalılığını artırır.

• Müasir təhsil proqramlarında inteqrativ, nəticəyönümlü və şagirdyönümlü (tələbəyönümlü) xarakterə malik olması, vaxta qənaət, resursların və informasiyaların öyrənənlərin maraq və mənafelərinə yönəlməsi işgörmə qailiyyətinin artırılmasına xidmət edir.

***Rəyçi: dos. T.Məmmədov***

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi. 2013, № 5.

2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı. // Azərbaycan məktəbi. 2015, № 1.

3. Олешков М., Уваров В. Современный образовательный процесс: Основные понятия и термины. М., 2006.

4. Огородников И. Оптимальное усвоении учащихся знаний и сровнительная эффективност отдельных методов в школе. М., Просвещение, 1969.

5. Ağayev Ə. Təlim prosesi ənənə və müasirlik. Bakı, 2006.

6. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004, 432 səh.


**Ш.Агаев,**
**С.Мехдизаде**

**Актуальные вопросы обучения**

**Резюме**

В данной статье выявлена суть учебного процесса – теоретический и практический анализ сущности духовной энергии, технологических особенностей ее использования и соответствующих результатов исследований, которые обеспечивают когнитивную работу участников с точки зрения человеческих ресурсов.

**Sh.Agayev,**
**S.Mehdizade**

**Topical issues of training**

**Summary**

This article reveals the essence of the educational process - theoretical and practical analysis of the essence of spiritual energy, technological features of its use and the corresponding research results that provide cognitive work of participants from the point of view of human resources.



# TƏHSİLDƏ İKT-NİN PEDAQOJİ-PSİXOLOJİ İMKANLARI

**Ruhiyyə Mehdiyeva,**
*Azərbaycan Respublikası Təhsil İnstitutunun doktorantı*

"Müəllim - şagird - dərslik" tədris modelinə kompüterin də əlavə edilməsi tədris prosesini individual proqram üzrə təşkil etməyə, uşağın dərsə marağını və istəyini stimullaşdırmağa imkan verir. Tədris prosesində informasiya-kommunikasiya texnologiyalarından istifadə innovativ tədris və öyrənmə imkanlarının təmin edilməsi üçün müəllimlərə böyük imkanlar yaradır, onlar səmərəli məktəb idarəçiliyinin təşkil edilməsində əhəmiyyətli rol oynayır. Həmçinin müəllim və şagirdlər arasındakı münasibətlərə müsbət təsir göstərir, müstəqil iş üçün əlverişli şərait yaradır. Təhsilin inkişafı və intizam funksiyaları daha aydın şəkildə ortaya çıxır. Təhsilin keyfiyyətini artırır, istedadlı şagirdləri tapır, inkişafı üçün lazımi şərait yaradır, dünya dünyagörüşünü formalaşdırır, şagirdlərin bilik və intellektual səviyyəsini inkişaf etdirir.

***Açar sözlər:*** *internet, təhsildə müasir texnologiyalar, interaktiv tədris, informasiya və kommunikasiya texnologiyaları, elektron poçt, söhbətlər, forumlar.*

***Ключевые слова:*** *интернет, современные технологии в образовании, интерактивное обучение, информационные и коммуникационные технологии, электронные письма, чаты, форумы.*

***Key words:*** *internet, modern technologies in education, interactive teaching, information and communication technologies, e-mails, chats, forums.*

İnformasiya cəmiyyətinin və rəqabətədavamlı yüksək texnologiyalı milli iqtisadiyyatın yaradılması bir sıra ölkələrin dövlət siyasətinin əsas istiqamətinə çevrilib. Bu ölkələrdə informasiya və kommunikasiya texnologiyaları (İKT) sahəsi inkişafın ən önəmli amili kimi çıxış edir. Bu sahə dövlətlərin siyasi, iqtisadi və sosial fəaliyyətinə aktiv təsir edərək iqtisadiyyatın və ictimai münasibətlərin qloballaşmasını şərtləndirir. İnformasiya cəmiyyətinin təhsil sisteminin necə qurulması, təhsilin modernləşdirilməsi üçün hansı texnologiyalardan istifadə edilməsi hazırda ən aktual məsələlərdən biridir.

Hazırda respublikamızda bütün sahələrdə mütəxəssislərin informasiya və kommunikasiya texnologiyaları ilə işləmək və onlardan düzgün istifadə etmək bacarığına çox böyük önəm verilir. İKT biliyinə mükəmməl yiyələnməyin ən yaxşı yolu isə elə orta məktəbdən başlayır.

Qeyd etmək lazımdır ki, ümumilikdə təhsil sisteminin İKT əsasında təkmilləşdirilməsi informasiya cəmiyyətinin əsas xüsusiyyətlərindən biridir.

Son 20 ildə bir çox sahələrdə dünyada tarixən analoqu olmayan intensiv inkişaf

gedir, xüsusi ilə informasiya silsilə ilə inkişaf edir. Bu intensiv inkişaf bir çox sahələrə, ilk növbədə isə təhsilə ciddi təsir edir. Deməli, təhsilin daxili inkişaf dinamikası dünyanın ümumi inkişaf dinamikasından sürətli olmalıdır. Bu günün təhsili - İnformasiya-Təhsil məkanı mühitində reallaşır. Bu vəziyyət müəllimin peşə hazırlığına, onun metodik ustalığına yeni bir komponenti - "informasiya mədəniyyəti" komponentini əlavə edir. Müasir müəllim öz fənnini tədris etməklə yanaşı, həm də təhsil müəssisəsinin mühüm fəaliyyət istiqamətlərində İKT-nin tətbiqi üzrə praktik işləri təşkil etməli, onları əlaqələndirməli və səmərəli idarə etməlidir. Başqa sözlə, müasir müəllim, xüsusən də informatika müəllimi məktəbdə pedaqoji fəaliyyətlə yanaşı, həm də İT üzrə menecer (İT üzrə inzibatçı) olmalıdır.

İnformasiya kommunikasiya texnologiyalarının imkanları

Təhsilin informatlaşması ənənəvi təhsili yeni çalarlarla zənginləşdirir. Artıq müəllim şagird üçün informasiya mənbəyi deyil. Müəllimin əks-əlaqə yaratmaq, sagirdin biliyini qiymətləndirmək imkanı tədricən məhdudlaşır, bu imkanların bir qismi (bəzən hamısı) İKT vasitələrinə transfer olunur. Bu zaman öyrədən daha çox məsləhətçi-tyutor funksiyası daşıyır. Müəllim şagirdlərinə informasiya ötürülməsinə vaxt sərf etmir. Tədris materialının şagirdlərə nəql edilməsi, fərdi qaydada mənimsənilmiş tədris materiallarının onlardan qəbul edilməsi (tapşırıqların yoxlanılması, dərsin sorğusu və s.) kimi mərhələlərə vaxt itirilmir. Qazanılan əlavə vaxt ərzində şagirdlər digər yaradıcı məsələlərin həllinə imkan qazanırlar. Beləliklə, tədris-informativ qarşılıqlı əlaqənin strukturu tədricən dəyişir, informasiya - təhsil mühiti formalaşdıqca öyrədən, öyrənən və İKT vasitələri arasında yeni səviyyəli informasiya mübadiləsi imkanları yaranır.

Artıq təhsil sisteminin informasiyalaşdırılması ilə əlaqədar əsas hədəflər müəyyənləşdirilmiş, nəzərdə tutulan tədbirlərin xeyli hissəsi həyata keçirilmişdir. Məktəblərin İKT avadanlığı, o cümlədən kompüter, noutbuk, interaktiv lövhələr ilə təchizatı uğurla davam etdirilir.

Daima mürəkkəbləşən və böyük informasiya həcmi ilə xarakterizə olunan müasir cəmiyyətdə yaşamaq, oxumaq və uğurla işləmək üçün şagirdlər və müəllimlər İKT–dən səmərəli istifadə etməyi bacarmalıdırlar (1). Məntiqlə təşkil olunmuş təhsil mühitində şagirdlər aşağıdakı imkanları əldə edəcəklər:

• informasiya texnologiyalarının imkanlarından səmərəli istifadə etmək;

• informasiyanı tapmaq, təhlil etmək və qiymətləndirmək;

• problemləri həll etmək və qərar qəbul etmək;

• əmək qabiliyyətini artıran vasitələrdən səmərəli şəkildə istifadə etmək;

• ünsiyyət prosesində iştirak etmək, əməkdaşlıq etmək, informasiyanı hazırlamaq və yerləşdirmək;

• məlumatlı, fəal və məsuliyyətli vətəndaş olmaq.

İKT innovativ tədris və öyrənmə imkanlarının təmin edilməsi üçün müəllimlərə böyük imkanlar yaradır, şagirdlərə informasiyanın əldə edilməsi, seçilməsi və izah edilməsinə, mülahizələrin modelləşdirilməsinə, proqnozlaşdırılmasına və irəli sürülməsinə, öz bilik və bacarıqlarını qiymətləndirməyə, yaradıcılıq imkanlarını inkişaf etdirməyə imkan verir (3). Eyni zamanda onlar səmərəli məktəb idarəçiliyinin təşkil edilməsində əhəmiyyətli rol oynayırlar.

Təhsildə aşağıdakı müasir informasiya-kommunikasiya texnologiyaları mövcuddur: İnternet, elektron poçt, forum, video-

konfrans, çat, mesencer, web resurslar, kataloqlar, elektron dərsliklər və kitabxanalar, axtarış sistemləri, layihələr və müsabiqələr, distant təhsil, xəbərlər və elanlar, xəbər linkləri, onlayn testlər, sorğu kitabçaları, sorğular, təqdimat, animasiya, multimedia, layihələr, rəsmlər, diaqramlar, sxemlər, xəritələr, elektron dərslik.

Məktəb rəhbərliyi, müəllimlər, şagirdlər və valideynlər üçün İKT imkanları aşağıdakılardır:

Məktəb rəhbərləri üçün İKT imkanları: metodiki dəstək; yenidənhazırlanma və ixtisasın artırılması; informasiya mübadi-ləsi; kommunikasiya; səmərəli menecment; təcrübə və bilik mübadiləsi; partnyorların axtarışı; büdcədənkənar vəsaitlərin cəlb edilməsi; təhsilin keyfiyyətinin artırılması; təlim-tərbiyə tədbirlərinin keyfiyyətinin artırılması; marketinq; məzunlarla əlaqələrin saxlanılması.

Müəllimlər üçün İKT imkanları: metodiki dəstək; yenidənhazırlanma və ixtisasın artırılması; təhlil və monitorinqin operativliyi; təlim-tərbiyə materiallarının hazırlanması və təqdimatının rahatlığı; təhsilin keyfiyyətinin və şagirdlərin marağının artırılması; təhsilin müasir metodlarının istifadəsi imkanları; yerli və xarici həmkarları ilə təcrübə və bilik mübadiləsi; nəşrlər; yeni həmkar və partnyorların axtarışı; kommunikasiya; təkmilləşdirmə və tədris materiallarının daimi yenilənməsi.

Şagirdlər üçün İKT imkanları: tədris-metodiki materialların əldə edilməsi; dillərin öyrənilməsi üçün şəraitin olması; yazılış qaydası; fərdilik; peşə seçimi; əlavə təhsil imkanı; informasiyanın axtarışı, təhlili, emalı və təqdimatı; praktiki bacarıqların və təcrübənin əldə edilməsi; axtarış, təhlili və yaradıcı bacarıqların və təcrübənin inkişaf etdirilməsi; kommunikasiya bacarıqlarının inkişaf etdirilməsi; dost və imkan axtarışları.

Valideynlər üçün İKT imkanları: tədris –metodiki materialların əldə edilməsi; şagirdlər üçün texniki və metodiki rahatlığın təmin edilməsi; ixtisasın artırılması; şagirdlərin nailiyyəti və inkişafının təhlili və monitorinqi imkanları; təhsilin keyfiyyətinin və şagirdlərin marağının artırılması; məktəb rəhbərliyi, müəllim və valideynlərlə əlaqə; uşaqların maraqlarının öyrənilməsi; valideynlər və şagirdlərlə təcrübə mübadiləsi.

İKT – nin təhsilə inteqrasiyasının üstünlükləri.

Dünya təcrübəsi göstərir ki, İKT-dən istifadə etməklə qurulan müasir təhsil modeli məktəbin pedaqoji heyəti qarşısında da yeni tələblər və vəzifələr qoyur. Müəllimlərin tək öz seçdikləri fundamental biliklər pedaqogika və psixologiya sahəsində deyil, həm də informasiya sahəsində yenidən təlim alması olduqca aktuallaşır. Artıq yeni nəslin müəllimlərindən konkret öyrətdikləri fənnin struktur məzmununa və məqsədinə uyğun, uşaqların individual xüsusiyyətlərini nəzərə alan, şagirdlərin harmonik inkişafını mümkün edən texnologiyaları seçib tədrisdə tətbiq etmək tələb olunur (2).

Tədris fəaliyyətində İKT–dən istifadəni interaktiv tədrisin ən yaxşı nümunəsi hesab etmək olar. Tədrisin kompüter vasitələri şagirdin fəaliyyətinə "cavab verdiyi" üçün interkativ hesab edilir.

İKT vasitələri öz geniş imkanları ilə təhsil prosesini xeyli sadələşdirir, onu dinamik və çevik edir. "Müəllim - şagird - dərslik" tədris modelinə kompüterin də əlavə edilməsi tədris prosesini individual proqram üzrə təşkil etməyə, uşağın dərsə marağını və istəyini stimullaşdırmağa imkan verir. Kompüterlə aparılan dərslər uşaqlar üçün çox cəlbedici və yaddaqalan olur. Multimedia vasitələri, avtomatlaşdırılmış öyrədici sistemlər, kompüter tədris proqramları, animasiya qrafikası, rəngarəng illüstra-

siyalar uşaqların idrak aktivliyinə müsbət təsir göstərir və yekun etibarilə şagirdlərin olimpiadalarda, müxtəlif intellektual yarışmalarda göstərdikləri nəticələrin keyfiyyəti xeyli artır.

Tədris prosesində interaktiv lövhədən istifadə edilməsi dərsin əsas prinsiplərindən birini, onun əyaniliyini təmin edir. Elektron lövhənin sensorlu, yəni hissiyyatlı səthinə xüsusi qələmlə və ya barmaqla yavaşca toxunmaqla onun üzərində kompüterdə mümkün olan bütün əməliyyatları interaktiv rejimdə aparmaq olar. "Ağıllı" lövhə, həmçinin kompüterə qoşulan mikroskop, skaner, rəqəmli fotoaparat, videokamera və s. qurğulardan alınan təsvirləri də proyektor vasitəsilə qəbul edə bilir ki, bu da məktəblərdə virtual laboratoriyaların təşkilində mühüm əhəmiyyətə malikdir. Şagirdlər istənilən kimyəvi reaksiyanın, fiziki, bioloji, coğrafi proseslərin izahını və videogörüntülərini, müxtəlif cihazların, qurğuların, texniki vasitələrin işləmə prinsiplərini "möcüzəli" ekranda izləyə bilərlər. Bu isə şagirdlərin nəzəri-metodoloji biliklərini, praktiki bacarıq və təcrübələrini inteqrasiya etməklə tədrisi xeyli canlandırır, uşaqlarda yaradıcı yanaşma, düşünmə, təşəbbüskarlıq, tədris materialını dərindən dərk etmə qabiliyyətini daha da artırır."Ağıllı" lövhənin bir üstün cəhətini də xüsusi qeyd etmək lazımdır ki, onun üzərində aparılan bütün əməliyyatları, dərsin gedişini, hazırlanmış şablonları, modelləri kompüterin daimi yaddaşında saxlamaq və dəfələrlə istifadə etmək olar. Belə imkanlar müxtəlif səbəbdən dərsləri buraxan şagirdlər və ya təlimdən geri qalan uşaqlar üçün xüsusi əhəmiyyətə malikdir. Belə ki, şagird iştirak edə bilmədiyi dərsin elektron variantı ilə sonradan tanış ola bilər və ya təlimdən geri qalanlar həmin materialı tam qavrayana kimi təkrar-təkrar kompüterdə izləyə bilərlər.

İnteraktiv rejimdə keçilən dərslərdə şagirdlərin mərkəzi fiqur olması təmin edilir. Müəllim, əsasən, şagirdin konsultantı, onun fərasətini və orijinal bacarığını qiymətləndirən, şagirdi aktivliyə, müstəqilliyə, təşəbbüskarlığa həvəsləndirən rolunda çıxış edir (3). Elektron tədrisdə uşaqların hamısı lövhəyə çıxıb müəllimin bütün tapşırıqlarını yerinə yetirməkdə həvəsli olurlar. İnteraktiv rejimdə keçilən dərslər bütün uşaqların, o cümlədən passiv, utancaq, müəyyən fiziki və ya psixoloji qüsuru olan şagirdlərin dərs prosesinə aktiv qoşulmasına şərait yaradır. 1-4-cü sinif şagirdlərinin güclü əyani, bədii, canlı təfəkkürə malik olduğunu nəzərə alsaq, onlar üçün keçilən dərslərdə uşaqların görmə, eşitmə duyğularını, emosiya və təsəvvürlərini cəlb edən metodların istifadə edilməsi olduqca əhəmiyyətə malikdir. Dərslərin məhz interaktiv rejimdə deyilməsi bu işdə çox faydalı olur.

İKT–dən istifadə müəllimə aşağıdakıları həyata keçirməyə imkan verir:

-Şagirdləri fəaliyyətə həvəsləndirmək (məsələn, oxumaq, kompüterdə işləmək, çalışmaları yerinə yetirmək, tədqiqatlar aparmaq, prezentasiyalar hazırlamaq, tənliklər həll etmək, qrafik, xəritə, çertyoj qurmaq, mətnlər, mahnılar, layihə və proqramlar yazmaq, rəsmlər çəkmək, obyektlər düzəltmək və s.), müstəqil analitik, yaradıcı və tədqiqat aparmaq bacarıqlarını artırmaq məqsədilə dərsliklərdən, yollardan və vasitələrdən istifadə etmək.

-Şagirdlərlərin və müəllimlərin kompüterdən, internetdən istifadəsi onların bilik və bacarıqlarını inkişaf etdirməyə imkan verir.

-Dərs vaxtından səmərəli istifadə etmək. Dərsi qurmaq, tədris–metodiki vəsaitlər işləyib hazırlamaq və təqdim etmək, tədris fəaliyyətini optimallaşdırmaq və avtomatlaşdırmaq. Tədris prosesini idarə etmək və dəyişdirmək.

-İnteraktiv və dialoq xarakterli tədris prosesindən istifadə etmək. İKT şagirdin və

müəllimin fəaliyyətinə cavab verməк,onlarla dialoqa girmək imkanına malikdir ki, bu da onun əsas xüsusiyyətini təşkil edir. Kompüterlə rahat müstəqil rəftar imkanı yaratmaqla şagirdin fərdi ehtiyaclarını nəzərə almaq.

-Şagirdlərin müstəqil və qrup işlərini səmərəli şəkildə birləşdirmək. Belə ki, tapşırıqların çətinlik səviyyəsini seçmək imkanı var.

-Şagirdlərin nəticələrini səmərəli şəkildə izləmək, bütün şagirdlərin öyrənilmiş materialı mənimsəmə səviyyələrinin ümumi mənzərəsini əldə etmək və şagirdin nailiyyətlərini və qarşılaşdığı problemləri aşkar etmək, şagirdin inkişafı üçün yeni, qeyri-ənənəvi tədris forma və metodları axtarmaq. Bu həm də müəllimin peşəkar inkişafını təmin edir.

-Səhvlərin göstərilməsi ilə şagirdə yoxlamanın nəticələrini obyektiv şəkildə göstərmək.

Beləliklə, İKT–dən istifadə şagirdə daha yaxşı mənimsəməsi üçün informasiyanı tapmağa, mənimsəməyə və ötürməyə kömək edir. Şagirdin idraki fəaliyyətinin güclənməsində mühüm rol oynayır.

İKT vasitəsilə dərsə hazırlaşarkən müəllim dərsin məqsədinə uyğun plan hazırlamalı, tədris materialının seçimində əsas didaktik prinsiplərə əməl etməlidir: sistemlilik və ardıcıllıq, əlçatanlıq, differensial yanaşma, elmilik və s.

Deməli, təhsilin keyfiyyətinin yüksəldilməsində İKT əhəmiyyətli rol oynayır. Müasir şəraitdə cəmiyyətin ən əsas inkişaf istiqamətlərindən biri cəmiyyət həyatının bütün sahələrinin kompüterləşdirilməsi və informasiyalaşdırılmasıdır.

Buna görə də BMT-nin bütün üzv dövlətlərinin qəbul etdiyi Üçüncü minilliyin səkkiz inkişaf məqsədindən biri kimi qlobal tərəfdaşlığın inkişaf etdirilməsi istiqamətində göstərilir ki, İKT-dən bəhrələnmək imkanı yaradılmalıdır. İKT cəmiyyətin və iqtisadiyyatın inkişafına ciddi təsir göstərdiyinə görə dinamik templə sosial və iqtisadi həyatın bütün sahələrinə tətbiq olunur.

İKT-nin təhsildə tətbiqi və inteqrasiyası Azərbaycan vətəndaşlarının müasir biliklərə və bacarıqlara malik olan yeni nəslinin formalaşmasına birbaşa təsir edən yüksək mahiyyətli məsələdir.

Fənlərin tədrisi zamanı İKT-dən istifadə motivasiyasını gücləndirir, şagirdlərin dərketmə fəaliyyətini aktivləşdirir. Dərslərin yüksək estetik və emosional səviyyədə keçirilməsinə imkan verir, əyaniliyi təmin edir, böyük həcmdə didaktik materialların cəlb edilməsinə kömək edir. Bu isə öz növbəsində bir dərsdə şagirdlərlə görülən işin həcmini bir neçə dəfə artırır, şagirdlərə diferensial yanaşmanı təmin edir. Həmçinin, şagirdlərdə müstəqil işləmək, şagirdlərin tədqiqat aparmaq imkanlarını genişləndirir, ən əsası isə, təhsilin keyfiyyətinin artmasına gətirib çıxarır.

Azərbaycanda İKT sahəsində təhsilin tarixi çox gəncdir. Buna baxmayaraq bu sahədə müəyyən tədbirlər və uğurlar qazanılıb.Onu da qeyd edək ki, İKT vasitələri təhsil prosesini xeyli sadələşdirir, onu dinamik və çevik edir.

Ümumilikdə isə təhsil sisteminin İKT əsasında təkmilləşdirilməsi informasiya cəmiyyətinin əsas xüsusiyyətlərindən biridir. Belə ki, tədris prosesində informasiya kommunikasiya texnologiyalarından istifadə innovativ tədris və öyrənmə imkanlarının təmin edilməsi üçün müəllimlərə böyük imkanlar yaradır, onlar səmərəli məktəb idarəçiliyinin təşkil edilməsində əhəmiyyətli rol oynayır. Müəllim-şagird münasibətlərinə müsbət təsir edir, münasibətlərin genişlənməsinə və şagirdlərin sərbəst çalışmalarına şərait yaradır. Təlimin həm təhsilləndirici, həm inkişafetdirici, həm də tərbiyələndirici funksiyaları özünü daha qabarıq şəkildə göstərir. Dərsi zənginləşdirir, istedadlı

şagirdləri üzə çıxarır, onların inkişafına şərait yaradır, mövzunun izahına əyanilik gətirməyə, şagirdlərdə dünyagörüşün formalaşmasına, təlimin keyfiyyətinin yüksəldilməsinə şərait və imkan yaradır, şagirdlərin bilik və intellektual səviyyəsini inkişaf etdirir.

Dünya təcrübəsinə arxalanaraq müasir İKT-dən istifadə edərək xalqımızın milli maraq və xüsusiyyətlərini nəzərə alaraq Azərbaycan təhsil modelini qurmaqla təhsildə uğurlu nəticə əldə edə bilərik.

***Rəyçi: dos. F.Ağayev***

## İstifadə edilmiş ədədbiyyat

1. Mehrabov A. Təhsilin demokratikləşməsi: problemlər, vəzifələr. //Təhsil, mədəniyyət və incəsənət, Bakı, 2001, №4.

2. Mehrabov A. Şəxsiyyətyönümlü təhsil standartlarının hazırlanma texnologiyası. //Azərbaycan məktəbi. Bakı, 2005, №4.

3. Əliquliyev R.M., Mahmudov R.Ş. İnternet-medianın meydana gəlməsi və inkişafı: əsas istiqamətlər və xüsusiyyətlər (ekspress-informasiya). "İnformasiya Texnologiyaları", Bakı, 2012.

5. Полат Е.С., Бухаркина М. Ю. Современные педагогические и информационные технологии в системе образования. М.: //Академия, 2010.

**Р.Мехтиева**

**Возможности педагогического и психологического образования с помощью ИКТ**

Добавление компьютера в модели «Учитель-ученик-преподаватель», позволяет организовать процесс обучения индивидуально и поощрять интерес ребенка к уроку. Использование информационных и коммуникационных технологий в учебном процессе, создает широкие возможности для учителей предоставлять инновационные способы обучения, которые играют важную роль в организации эффективного управления школами.

**R.Mehdiyeva**

**Education with ICT's pedagogical-psychological capabilities**

**Summary**

The The addition of a computer to the teaching model "Teacher – student–textbook" enables to organize the teaching process on the basis of individual programs, stimulate the child's interest in class and his/her intention. The use of information and communication technologies in teaching process generates great possibilities for the teachers to provide innovative teaching and learning potentials, and they also play a significant role in the organization of efficient school management. It also has a positive impact on the relations between the teacher and students, generate favourable conditions for the extensive relations and students' independent work. The educational, developmental and disciplinary functions of learning are manifested more vividly.

It enriches the class, discovers talented students, creates necessary conditions for their development, makes it possible to bring visibility to the explanation of the topic, to form the students' world-outlook and raises the quality in education, develops the students' knowledge and intellectual level.



# TƏDRİSDƏ MÜASİR TƏLİM TEXNOLOGİYALARININ TƏTBİQİ

**Elnur Əliyev,**
***Salyan rayonu, Yenikənd kənd tam orta məktəbinin müəllimi***

**Açar sözlər:** *təlim texnologiyaları, interaktiv metod, idrak fəallığı.*
**Ключевые слова:** *технологии обучения, интерактивный метод, когнитивный деятельность.*
**Key words:** *learning technologies, interactive method, cognitive activity.*

Müasir təlim texnologiyalarından məqsədyönlü istifadə, fəal/interaktiv metodların düzgün seçilməsi və tətbiqi fənlərin tədrisində mühüm tələb kimi qarşıya qoyulur. Fəal/interaktiv təlim şagirdlərin biliyi hazır şəkildə deyil, müstəqil, yaradıcı, tədqiqatçılıq fəaliyyəti nəticəsində əldə etməsinə əsaslanır. Bu təlim şagirdlərin fəal idrak fəaliyyəti zəminində və təhsil prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində həyata keçirilir. Fəal/interaktiv təlimə məxsus metodların seçilməsi fənlərin mahiyyətinin, özünəməxsusluğunun nəzərə alınması zəminində reallaşdırılır. Metodların tətbiqi o vaxt uğurlu olur ki, təlim materialının həcmi, mürəkkəbliyi və çətinlik səviyyəsi kimi xüsusiyyətləri, şagirdlərin onlarla tanışlığı nəzərə alınmış olsun. Deməli, bu gün pedaqoji araşdırmalarda adı çəkilən metodların hamısından ədəbiyyat fənninin tədrisi zamanı istifadə etməyin mümkün olduğunu düşünənlər səhv edirlər.

Fəal/interaktiv təlimdə şagirdlərin idrak fəallığının təmin edilməsi diqqət mərkəzində saxlanılır. Bu məsələdə iki cəhətə önəm verilir. Birincisi, idrak fəallığının yaradılması, ikincisi, onun davamlılığına nail olunmasıdır. Şagirddə idrak fəallığının yaradılması hələ işin bir tərəfidir. Yaradılmış fəallığın şagirdin təlimi fəaliyyətinin və dərsin bütün mərhələlərində, məqamlarında saxlanması, davamlı olması da zəruridir. Buna nail olmaq üçün "problemli vəziyyətin yaradılması", "dialoq və əməkdaşlığın zəruriliyi", "şagird-tədqiqatçı, müəllim–bələdçi", "psixoloji dəstək: hörmət və etibar" tələblərinin – mexanizmlərinin gözlənilməsi vacibdir.

Ədəbiyyat fənninin tədrisində müəllim-şagird, şagird-şagird əməkdaşlığına nail olmaq, öyrənməyi öyrətmək üçün fəal/interaktiv təlimin müxtəlif iş formalarının – fərdi iş, cütlük şəklində iş, kiçik qruplarda iş, bütün siniflə birgə (böyük qrupda) işin uzlaşdırılması daha səmərəli və məqsədəuyğundur.

Məktəb təcrübəsində kiçik qruplarda iş populyarlıq qazansa da, digər iş formalarından istifadə əsla unudulmamalıdır. Bu iş formalarının qarşılıqlı əlaqədə tətbiqi daha səmərəli nəticənin əldə edilməsinə səbəb olur.

Ədəbiyyat fənninin tədrisi zamanı rəqəmləri və meyvə adları saymaqla, həndəsi və rəngli fiqurları paylamaqla

şagirdləri 3-6 nəfərdən ibarət kiçik qruplara bölmə üsullarından istifadə etmək mümkündür.

Ədəbiyyat fənninin tədrisində onun üçün səciyyəvi olan fasilələrlə və proqnozlaşdırılmış oxu, ikihissəli gündəlik, müzakirə (diskussiya), əqli hücum (beyin həmləsi), söz assosiasiyaları, insert (interaktiv qeydetmə sistemi), müqayisə cədvəli (konseptual cədvəl), Venn diaqramı, BİBÖ, debat, şaxələndirmə (klaster), rollu oyun (rollu dialoq), ziqzaq (zəncirvari oxu), problemin həlli, layihələr üzrə iş, qərarlar ağacı, karusel, auksion, müzakirə xəritəsi və "akvarium" kimi metodların tətbiq imkanları genişdir.

Ədəbiyyat fənninin tədrisi zamanı təqdimat mühüm əhəmiyyət kəsb edir. Məktəblilər tədqiq etdikləri məsələ barədə əldə olunan nəticələri sinif qarşısında müxtəlif formalarda və çıxış, məruzə, yazı işi (inşa, esse), cədvəl, sxem, səhnələşdirmə, rollu oyun, layihə şəklində təqdim edirlər.

Təqdimat zamanı şagird problemin mahiyyəti ilə bağlı fikirlərini aydın, ardıcıl şəkildə çatdırmalıdır. Mövzu, problem dəqiq şərh edilməli, informasiya-kommunikasiya vasitələri, illüstrasiyalar, fotoşəkillərdən istifadə olunmalıdır.

Bununla yanaşı, ədəbiyyat fənninin tədrisində özünü doğrultmuş, uzun illərin sınağından uğurla çıxmış ənənəvi metodlardan da yeri gəldikcə istifadə oluna bilər; məsələn: müasir ədəbiyyat dərslərini ənənəvi yaradıcı oxu metodunun tərkib hissəsi olan, kurikulumda alt standart kimi qeyd edilən ifadəli oxusuz təsəvvür etmək qeyri-mümkündür.

Yaxud izahlı oxudan istifadə həmişə faydalı olacaqdır. Şagirdlərin müstəqil izah etməkdə çətinlik çəkdikləri mətləblərin, mətnaltı mənaların izahlı oxu ilə aydınlaşdırılmasına ədəbiyyat fənninin tədrisi zamanı tez-tez ehtiyac yaranır.

Təcrübə göstərir ki, şagirdlərin yaradıcı fəallığının təmin edilməsi baxımından əhəmiyyətli olan ənənəvi təlim metodlarından fəal/interaktiv təlim metodları ilə əlaqəli istifadə müsbət nəticə verir.

Ədəbiyyat fənninin tədrisində müasir təlim texnologiyalarından istifadə Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının və fənn kurikulumun tələblərinə uyğun olaraq tətbiq edilən mühüm yenilikdir.

***Rəyçi: dos. B.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
2. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı: Adiloğlu, 2001.
3. Veysova Z. Ümumi orta təhsil səviyyəsi üzrə yeni fənn kurikulumlarının tətbiqi. Bakı, 2013.

**Э.Алиев**

**Современные технологии обучения в преподавании**

**Резюме**

В статье рассматриваются современные технологии обучения и интерактивные методы обучения. Для этого автор приводит примеры применения в преподавании литературы.

**E.Aliyev**

**Modern technologies of teaching in study**

**Summary**

The article deals with modern teaching technologies and interactive teaching methods. For this, the author gives examples of the application of literature in teaching.

*Arxivimizdən*

# UŞİNSKİNİN DİDAKTİK GÖRÜŞLƏRİ

Uşinskinin didaktik görüşlərindəki əsas və qiymətli cəhətlərdən biri ümumi təhsilin ixtisas təhsildən qabaq verilməsinin zəruri hesab edilməsidir. Uşinski bu tələblərində 60-cı illərin qabaqcıl pedaqoqları olan Piroqov, Pisarev, Stojunin və sairələri ilə birləşir. Lakin bu məsələnin düzgün həllinə gəldikdə, Uşinski onların bəzilərindən daha irəli getmişdir. Piroqov ümumi insani-təhsil anlayışında klassik təhsil götürürdü. Uşinski bunu doğru hesab etmir. Klassik təhsil Rusiyanı Avropanın qabaqcıl həyat və elminə çatdıra bilməyəcəyini göstərir. Uşinski matematika, astronomiya, fizika, kimya və s. real elmlərin verilməsini lazım bilir. Məlumdur ki, Uşinski ana dilini bütün təlimin mərkəzində götürür. Real elmlər içərisində Uşinski xüsusilə təbiət elmlərinə yüksək qiymət verir. Təbiət elmlərinin böyük təhsil əhəmiyyəti olmaqla bərabər, həm də özünün əyaniliyi və praktika cəhətcə elmlə həyatın əlaqəsini yaradır. Təbiət elmləri uşaq təfəkkürünü qüvvətlə inkişaf etdirir, təbiətin məntiqi klassik dillərdən daha aydın, daha sadə və daha qüvvətlidir. Uşinski uşağa ümumi təhsil predmetlərini verməklə həm onlarda məntiqi təfəkkür yaratmağı həm də dəqiq, aydın və düzgün dil inkişaf etdirməyi tələb edir.

Tədris materialının yadda saxlanılması haqqında. Uşinski dövrünün psixoloji və pedaqoji yeniliklərini ciddi izləmişdir, bu yeniliklərin elmi nəticələrini təlim teoriyasına mümkün qədər geniş tətbiq etməyə çalışmışdır. Lakin Uşinski ifratçılıq etməmiş və təhqirlərə çox uymamışdır. Uşinski bugünkü burjua pedaqoqlarından  ən çox yüksəkdə durmuşdur. Uşinski təlimdə yalnız uşağın təbiətini ayrı tutanları doğru hesab etməmişdir. Uşinski birtərəfliyə qarşı inadlı mübarizə etmişdir. Uşinski uşağın həm həvəsinin, təbii qabiliyyətlərinin, həm də düşüncə və iradəsinin çalışmalar vasitəsilə müstəqil inkişafını lazım bilmişdir. Uşinski həm bilik və həm də bacarıq vermənin tərəfdarıdır. Uzun müddət burjua pedaqogikasında bir-birilə mübarizə edən formal bilik ilə material biliyin birtərəfliliyini doğru hesab etməmişdir. Uşinski bu haqda belə deyir: "İnsan hafizəsi ilə rəftar etməyi bacarmadığımız üçün, biz çox zaman tərbiyə və təlimin vəzifəsi – əqli inkişaf etdirməkdir – deyə özümüzə təsəlli veririk; lakin onu biliklə doldurmağı nəzərdən qaçırırıq" ( "İnsan tərbiyənin predmeti kimi" c. 1, səh. 24).

İnsanlığın bilik sərvəti günü -gündən artır, məktəb bu elmin hərəkəti ilə irəli getməli və uşaqlara daha artıq bilik verməli idi, lakin məktəbin bu vəzifənin öhdəsindən gələ bilmədiyini Uşinski yaxşı görürdü. Uşinski o zamankı məktəbi şagirdlərin hafizəsilə vicdansız rəftar etməklə təqsirləndirirdi. Uşinskinin dediyinə görə, şagirdin hafizəsinə hər zir-zibili doldururlar və bunların yüzdə biri də yadda qalsa ona sevinirdilər. Buradan da haqlı olaraq o, köhnə pedaqogikanı, danlayıram. Hafizəni

yüngülləşdirmək üçün pedaqogika hələ çox az iş görmüşdür, bu işin azlığı həm dərsliyə, həm proqrammaya, həm də metodlara aiddir.(yenə orada, səh.24).

Uşinski pedaqogikanın gələcəyini parlaq görürdü, amma düşündüyünə görə pedaqogika uşağı dərindən öyrəndikdə adi bacarıqlı, bir adama, indiki məktəbin ən talantlılarının hafizələrinin qiymətli gücündən istifadə edərək verdiyi və sonra da izi qalmayan min cür bilikdən, on dəfə artıq və həm də möhkəm bilik verə bilər. Şagirdin hafizəsində biliyin tədrici toplanmasını və təkrarlar yolu ilə möhkəmlənməsini Uşinski belə əsaslandırır: "ruhum mənimsədiyi bütün biliklər yenidən şüura qayıdaraq, özü möhkəmlənməklə bərabər, özünə yeni biliklər cəlb etmək qabiliyyətini qazanır və öz möhkəmliyini ona da keçirir". "Bunun əsasında şagirdin başı meşoq kimi pis mənimsənilmiş faktlar və pis həzm olunmuş ideyalarla doldurubnayacaqdır, bunun hər işçisi də orqanı bir sürətdə qəlbə dərin sancılmış bir neçə dənələrdən inkişaf edəcəkdir". ("Pedaqoji əsərləri məcmuu", c. 1, səh. 368-369). Buradan Uşinski elə pedaqoji nəticə çıxarır: birinci, tədris şagirdlərə məntiqcə bağlı bilik sisteması verməlidir, hafizədə bir-birilə olmayan bilik, başqa biliklərin mənimsənilməsinə yaraya bilməz; ikinci, hər bilik qəlbdə dərin sancılmış orqanik bir surətdə və tədrici olaraq bir neçə dənələrdən inkişaf etməlidir. Hər kurs da əsas qanunlardan inkişaf etməlidir. Hər kurs da əsas qanunlar, ideyalar, nəticələr və qaydalar az olduğu üçün onların üzərinə həmişə qayıtmalıdır və yeni biliyi onlarla bağlamalıdır, yalnız belə olduqda uşaq əsas fikirlərin yaradıcı inkişafına alışa bilər. Tədrici biliyin artmasını Uşinski belə təsvir edir: "beləliklə köhnəni arası kəsilmədən təkrar edərək və hər təkrar zamanı bir qədər yeni bilik əlavə etməklə uşaq bir çox faktları yalnız bir-birinin dalınca mənimsəməklə ona sahib oluna bilməz" (yenə orada).

Uşinski biliyin bu cür verilməsi ilə köhnə gimnaziyalarada verilən biliyi qarşılaşdırır və bədii müqayisə ilə təsvir edir: "lakin bu cür təlimi (yəni doğru qurulmuş təlim – Ə.S.) hər il yeni budaqlar əmələ gətirərək həm də kökünü yoğunladan və möhkəmlədən ağacın qüvvətli inkişafı, ilə müqayisə etməyə mümkün olduğu halda, gimnaziyalarımızdakı təlimi yükü pis bağlanmış sərxoş arabaçıya bənzətmək olar o geri baxmadan arabanı qabağa qovur, və çox yol getməsilə loğalanaraq, arabanı evə boş gətirir" (yenə orada). Uşinskinin burada nə qədər doğru fikir göstərdiyi tamamilə aydındır, bütün elmlər keçmişlərin möhkəm mənimsənilməsi əsasında yalnız yenilərin verilməsini tələb edir. Uşinski hafizənin mexaniki tərbiyəsi əleyhinədir. O, hafizənin düşüncəli, məntiqi inkişafının tərəfdarıdır. O, hafizənin sistematik zənginləşməsini təlah etməklə bərabər həm də onun düşüncəliliyini tələb edir. Uşinski bunun əsas şərtlərdən biri olaraq təkrarları lazım bilir.Təkrarları passiv və aktiv təkrar deyə, iki yerə bölür. Passiv təkrarda şagird keçmişdə aldığı materialı yenidən dərk edir, lakin bu dərk etmə əvvəlkinin eyni ilə təkrardır. Burada əsas aktivlik müəllimdə olur, müəllim keçmiş dərsi yenidən nağıl edir, izah edir və sairə.

Aktiv təkrar əsas etibarilə şagirdin

müstəqil işini, onun aktivliyini nəzərdə tutur. Bu, təkrarın daha doğru yoludur. “Öyrəndiyi dərsi şifahi ya yazılı sürətdə dəqiq ifadə etməklə, öyrəndiyi şəkli yaddaşı üzrə çəkməklə şagird öz daxili aləmini sözə və müəyyən dərəcədə işə çevirmək vərdişını qazanır” (yenə orada). Uşaqların yaşı az olduqca təkrarlara çox əl atmalıdır. Möhkəm yadda saxlamaq və öyrəndiklərini yada salmaq hələ bu vərdişə malik olmayan uşaq üçün asan proses deyildir. Burda müəllimdən çox böyük səbr və mətanət tələb edir. Uşinskiyə görə səbirsiz və xırdaca çətinlikdə uşağa pıçıldayan müəllim, uşağın hafizəsini korlayır. “Uşağın gücünə müvafiq olmayan və uşağı işdən qorxudan şeyləri yadda saxlamaq üçün uşağa verməməlidir. Uşağın bilməzliyində və səhvlərində onu çox danlamaq ən bacarıqlı hafizəli uşaqları belə ümmidsizliyə aparar və onu ruhdan sala bilər” – deyir. Uşinski xüsusilə qüvvədən kənar ev tapşırıqlarının əleyhinədir. “Uşağın ürəkdən çalışmasına baxmayaraq bir neçə dəfə dərsini öyrənə bilməzsə öz qüvvəsinə daima inamını itirəcək, bu inamsızlıq da hafizənin zəiflənməsinə müəyyən təsir göstərəcəkdir”. Əgər müəllimlər gündəki beş saatlıq məşğələləri düzgün istifadə etsə idilər və uşaqları sinifdə işlətsə idilər o zaman uşaqlar məktəbdə öyrəndiklərini yalnız evdə təkrar edərdilər. Uşinski, dövründəki məktəblərin müvəffəqiyyətsizliyinə səbəblərdən biri də tapşırığın düzgün verilməməsini hesab edirdi. Uşinski bu işə çox ehtiyatlı yanaşmağı tələb edirdi. Uşinski bəzən ev tapşırığının əleyhinə çıxan kimi görünür, əlbəttə, Uşinskinin bəzi ifratçılığını biz qəbul edə bilmərik, bir də ev tapşırığı xüsusi yer tutmalıdır. Lakin, diqqətlə baxsaq Uşinskinin burada haqlı tərəfini görəcəyik. Uşinski sinifdə yaxşı işlənməmiş tapşırığın evə verilməsi əleyhinədir. Uşinski bu barədə belə deyir: “Dırnaq yaxud karandaşla kitabın səhifəsini işarə edib gələn dəfə öyrənmək üçün müəllimin uşağa tapşırıq verməsindən asan nə var. Lakin baxın, bu əzablı səhifə üzərində çox tezdən özbaşına buraxılmış uşaq necə çabalayır, işə yanaşmağa bacarmadığı, üçün öz əməyini necə birə-on artırır, mənasız əzbərləyir, dəftərini, əlini, üzünü, mürəkkəblə bulayır, müvəffəq olmadığı hərfin üstünə acı göz yaşları tökür... (“Ana dili təliminə rəhbərlik”, səh. 13).

Uşinskiyə görə xüsusən, ibtidai siniflərdə yalnız yeni materialın izahı deyil, həm də onu necə öyrənmək, yadda saxlamaq deyil, həm də o biliyin möhkəm mənimsənilmməsidir. Uşinskinin bu tələbi bizim müəllimlərin də bugün qarşısında duran mühüm vəzifədir.

**Əhməd Seyidov**
***pedaqoji elmlər doktoru, professor***

**“Müəllimə kömək” jurnalı, 1939, № 7-8**

***Arxivimizdən***

# "AZƏRBAYCAN MƏKTƏBİ" JURNALI REDAKSİYASINA

# AÇIQ MƏKTUB

Hörmətli redaksiya! Mən pedaqoq olmasam da sizin jurnalı müntəzəm izləyirəm. Respublikada yeganə elmi-nəzəri pedaqoji jurnal olan "Azərbaycan məktəbi"nin nəinki xalq maarifi işçiləri, habelə geniş ictimaiyyət, o cümlədən valideynlər arasında oxucuları çoxdur. Mən də onlardan biriyəm. Məktəb islahatı sənədlərində gənc nəslin təlim-tərbiyəsi ilə bağlı bir çox məsələlər bir valideyn kimi məni də düşündürür. Onlardan biri barədə öz mülahizələrimi sevimli jurnalımızın oxucuları ilə bölüşdürmək istəyirəm.

Hazırda ölkəmizdə məktəb islahatını əməli olaraq həyata keçirməyə başladığımız bir vaxtda gənclərin əməyi və coşğun ictimai fəaliyyətə daha yaxşı hazırlanması ilə əlaqədər olaraq məktəb qarşısında qoyulan tələblər artır.

Böyüməkdə olan nəslə dərin və əsaslı biliklər vermək, həmin bilikləri təcrübədə tətbiq etmək vərdişləri aşılamaq, materialist dünyagörüşü formalaşdırmaq, onların müstəqil fikrinin və yaradıcılıq qəbiliyyətlərini inkişaf etdirmək məktəbin ən mühüm və daimi vəzifəsi olaraq qalır. Lakin burada təkmilləşdirilməyə ehtiyacı olan məsələlər az deyildir. Onlardan biri şagirdlərin təlimdə həddən artıq yüklənməsi ilə mübarizə məsələsidir.

Belə bir mənzərə kimə tanış deyil: şagird məktəbdən qayıdan kimi, bir qədər istirahətdən sonra, evə verilmiş tapşırıqların icrasına başlayır. Saatlarla stol arxasında oturub, fasiləsiz sürətdi iri həcmli tapşırıqları yerinə yetirməli olur. Açıq havada oynamağa, istirahət etməyə, ailənin məişət əməyində iştirak etməyə vaxtı qalmır. Adamın uşaqlara yazığı gəlir: onların bir çoxunun üzündən yorğunluq, çaxışlarından süstlük tökülür. Fikirləşirsən: axı uşağın təqsiri nədir? Onu oyun və əyləncədən, mütaliə və tamaşalardan nəyin naminə məhrum edirik? Məktəb Nizamnaməsinə əsasən şagirdlər ev tapşırıqları üzərində gündə aşağı siniflərdə 1–2 saatadək, yuxarı siniflərdə isə 3–4 saatadək işləməli olduqları halda nə üçün onları 6–7 saat işləməyə məcbur edirik? Nəyə görə böyüyən nəslin sağlamlığını və ümumi inkişafını onun zehni inkişafına qurban veririk?

Təlim tapşırıqları üzərində bütün günü gərgin əmək sərf edən uşaq bunun müqabilində bəzən növbəti dərsdə aşağı qiymət alır. Bu da şagirdin dərsə olan marağını azaldır, tədricən onu təlimdən soyudur.

İlk dəfə böyük həvəslə məktəbə gedən balaca oğlan və qızların gözlərində

şölələnən sevinc qığılcımlarının kim şahidi olmayıb? İlk vaxtlar uşaqlar müəllimin tələblərini necədə həvəslə və səylə yerinə yetirirlər! Lakin bu tələblər günbəgün çox sürətlə artır, onların miqyası şagirdin imkanlarını aşır. Uşaqda təlimə qarşı bir laqeydik, soyuqluq baş qaldırır. O, tapşırıqları icra etməmək üçün hər cür bəhanə gətirməyə, hətta valideyn və nüəllimləri aldatmağa belə hazırdır.

Bəzən başqa hal müşahidə olunur: şagirdlərin bir qismi təlim çətinlikərinin öhdəsindən gələ bilməyib, ev tapşırıqlarının icrasına heç girişmir, yazılı tapşırıqları yoldaşlarından mexaniki köçürməklə kifayətlənir, şifahi tapşırıqları isə icrasız qoyur. Belələrindən verilən tapşırıqları nə üçün yerinə yetirmədiklərini soruşduqda, adətən, belə cavablar eşitmək olur: “Onsuz da xeyri yoxdur; nə qədər çalışıramsa bir şey alınmır”. Uşağın öz qüvvəsinə inamsızlığı belə yaranır. Bu cür inamsızlıq isə təlim işində ən dəhşətli haldır.

Mən pedaqogika mütəxəssisi deyiləm. Ancaq təlimlə əlaqədər bir cəhət valideyn və ziyalı kimi həmişə məni düşündürmüşdür: nə üçün uşaqlarımız on il ərzində hər gün 5–6 saat dərs keçmələrinə baxmayaraq, onların böyük qismi dərs öyrənməyə çoxlu vaxt sərf edir, mexaniki əzbərçiliklə özünü yorur. Əzbərçilik isə ağlı şikəst edir, çoxlu vaxt itirilməsinə baxmayaraq heç bir səmərə vermir. Əzbərlənmiş biliklər tezliklə yaddan çıxır və beləliklə, təlim səmərəsiz bir işə çevrilir. Təəssüflə qeyd etmək lazımdır ki, əzbərçilik bəlası təkcə ibtidai siniflərdə yox, hətta yuxarı siniflərdə, ali məktəblərdə də özünü göstərir. Orta məktəbi bitirən məzunların bir çoxu bəzən adi məsələlərə dair öz müstəqil fikirlərini söyləyə bilmir, hətta vaxtilə “4” və “5” qiymət aldığı mövzuları həyata tətbiq etməkdə çətinlik çəkir.

Təcrübəli bir pedaqoqun öz tələbəsi haqqında təşvişlə söylədiyi bu sözlərə laqeyd qalmaq olmur: “O, bir neçə dil bilir, amma bundan başqa daha heç nə bilmir. Adi həyat hadisələrinin izah edə etnəyi bacarmır”. Haqqında danışılan tələbə bu qəribə, supermen tipi pedaqoji işdə məhdudluq və birtərəfliliyin ifratlarından birini ifadə edir. Bu ifratın əlamətləri, məncə lap orta məktəbdən, ibtidai siniflərdən başlayır. Hələ parta arxasından çox ağır kitab və infromasiya “çantası” ilə evə qayıdan, evdə də mavi ekranlı çərçivədən yayılan “bilik selinə” məruz qalan balaca məktəblini həmin “intellektual supermena” sabahkı namizəd etmək olar. Şagird şəxsiyyətinin mənəvi təkamülünün pedaqoji təşkilinin indiki ev və məktəb modeli təxminən belədir. Elmi-texniki informasiya və riyazi intellekt baxımından maksimalist proqram və onun indiki tədirisi tərzi bu gün özünü doğrultmur, bəzən isə hətta hərtərəfli inkişaf etmiş ahəngdar şəxsiyyətin yox, süni manikenin, robotun meydana çıxmasına imkan yarardır. Necə etməli ki, təlim təkcə söz və kitabla məhdudlaşmasın, məktəb və mənzil öz divarları ilə şagirdi təbiətdən və dünyadan ayırmasın, əksinə, dünyanı tam halda dərk etməkdə, həyat hadisələrinin elmi əsasda izah etməkdə ona kömək göstərsin?

Məktəb islahatı bütünlükdə humanizm işıqı və məktəbi ilə aşılanmışdır. Məqsəd elmi informasiyanın həcmini nəhayətsiz artırmaq deyil, mənəvi mədəniyyətin, əxlaqi kamilliyin səviyyəsini yüksəltməkdir. Təhsillilik məfhumuna birtərəfli münasibəti

aradan qaldırmaq, bu zaman məlumat-idraki amillə mənəvi-əxlaqi amilin vəxdətini təmin etmək vacibdir. Mənəvi-əxlaqi amili arxa plana çəkməklə biz təhsillilik meyarlarını təhlükəli həddə qədər endirmiş olmuruqmu? Fikrimizcə, ən yaxşı müəllim şagirdi həddən artıq informasiya ilə yüklənən müəllim yox, ona mühakimə etməyi öyrədən müəllimdir. Bu an yaxşı məktəb yalnız yaxşı dərzi, dülgər, mexanik, fəhlə hazırlayan, yaxud ali məktəb üçün namizəd yetişdirən məktəb yox, yüksək intellektual və ideya-mənəvi keyfiyyətlərə malik, bəsləyən ahəngdar şəxsiyyət, fəal vətəndaş hazırlayan məktəbdir.

Hörmətli redaksiya! Məktəb islahatlının yüksək ideya və prinsipləri baxımından şagirdlərin təlimdə həddən artıq yüklənməsi ilə mübarizə problemi, güman edirəm ki, başqa valideynləri də düşündürür.

**Yaşar Qarayev,**
***Azərbaycan SSR Dövlət laureatı, filoloji elmlər doktoru, Azərbaycan SSR EA Nizami adına Ədəbiyyat İnstitutunun direktor müavini***

**"Azərbaycan məktəbi" jurnalı, 1985, №3**

* * *

**Hörmətli abunəçilər!**

**"Azərbaycan məktəbi" jurnalının 2017-ci ildə ilboyu normal fəaliyyətinin tənzimlənməsindən ötrü Sizi abunə yazılışına qoşulmağa çağırırıq. İldə 6 nömrə nəşr olunur. Bir nüsxənin abunə haqqı 2 manat 50 qəpik, illik abunə haqqı 15 manatdır.**

**Abunə respublikamızda fəaliyyət göstərən**

| | |
|---|---|
| **"Azərmətbuatyayımı" ASC** | **440-39-83** |
| **"Qasid" ASC** | **493-23-19** |
| **"Qaya"** | **565-67-13** |
| **"Səma"** | **594-09-59** |
| **"Xpress-Elita"** | **437-28-10** |
| **"Kaspi"** | **432-39-55** |

**mətbuatyayımı firmalarında qəbul edilir. Böyük ənənələri olan pedaqoji jurnalımıza abunə yazılmağa tələsin. Rayonlarda isə "Azərmətbuat-yayım" ASC-nin yerli şöbələrinə müraciət etmək olar.**

**İndeks: 1002**

# BİZƏ YAZIRLAR

**İsmayıllı təhsilinin uğurları respublika ictimaiyyətinə yaxşı tanışdır. Rayonda təhsillə bağlı rəngarəng tədbirlər həyata keçirilir. Belə tədbirlərdən biri haqqında təhsilimizin veteranı Valeh Salehov xəbər verir.** Ölkədə yaranan yeni ənənələrdən biri də təhsil bayramıdır. Azərbaycanın hər bir bölgəsi sosial-iqtisadi inkişafda təhsilin, mədəniyyətin, sosial xidmətlərin təşkilində fəallıqla iştirak edir. Rayonlar arasında fərqli cəhətlər də vardır. Hər rayon inkişafın bir istiqaməti ilə daha çox fərqlənir. İsmayıllı rayonu təhsil sahəsində daha yüksək nəticələrə çatır, ənənələri novatorluqla davam etdirərək uğurları ilbəil artırır. Dövlətin təhsil siyasətini geniş miqyasda həyata keçirməsi, bütün təhsil müəssisələrini əhatə etməsi üçün rayon icra hakimiyyəti məhsuldar şərait yaradır. Müəllimə, məktəbə xüsusi qayğı ilə yanaşır.

Bu günlərdə keçirilən Təhsil bayramı da məhz bu mövqedən irəli gəlib, uğurların təntənəsinə çevrilib.

Tədbirdəki çıxışlarda qeyd olunub ki, rayonun tam orta məktəblərini bu il 777 nəfər gənc bitirib. 440 nəfər qəbul imtahanında iştirak etmək üçün sənəd verib. Çox fərəhli haldır ki, onların 354 nəfəri tələbələr sırasına daxil olub. Bu da Respublikada ən yüksək göstəricilərdən biridir. Bunlara səbəb məktəb və müəllimlərimizin səylə çalışmasının, müasir təlim metodlarına, innovativ və elektron təhsil üsullarına yiyələnməsinin nəticəsidir. 22 məktəbimiz “Ən yaxşı məktəb”, 26 müəllimimiz “Ən yaxşı müəllim” müsabiqəsinin qalibi olub. İnformasiya texnologiyaları əsasında məktəblərimizin beynəlxalq əlaqələri və bu tipli layihələrdə iştirakı daha geniş miqyas alıb.

Əməkdar incəsənət xadimi, şair Baba Vəziroğlu və Belarus nümayəndə heyətinin rəhbəri, Minsk vilayəti xalq deputatları sovetinin sədri Vasiliy Lazyuk bayramda iştirak etmişlər.

Lahıc qəsəbə tam orta məktəbini bitirən, test imtahanlarında 700 bal toplayan Qızıl medallı Vahab Cəbrayılov səmimi və düşüncəli çıxışı ilə diqqəti cəlb edib. O, ölkəmiz üçün gərəkli mütəxəssis olacağını və elmin ardınca inamla gedəcəyini bildirib.

695 bal toplayıb hüquqşünaslıq ixtisasını seçən Murad Ağazadənin atası Rövşən Ağayev çıxışında oğlunu bu səviyyəyə çatdıran müəllimlərə, nümunəvi təhsil şəraiti yaradan dövlətimizə minnətdarlığını bildirib. Şagirdləri yaxşı oxumaqla yanaşı ictimai fəallığa çağırıb.

600-700 və 500-600 bal toplayan məzunlara rayon icra hakimiyyətinin qiymətli hədiyyələri və mükafatları verilib.

Təhsil bayramı bir daha göstərdi ki, İsmayıllı rayonu Respublikamızın sürətli inkişafında öz yerini dəqiqləşdirib və möhkəmləndirib. Rayonda Prezidentin sərəncamı, tapşırıq və tövsiyələrini məsuliyyətlə icra edilir. Nəticələr də bütün istiqamətlərdə yüksələn xətt üzrə davam edir.

**Bakı şəhəri, Səbail rayonu 162 nömrəli tam orta məktəbin kimya müəllimi Mahirə Nuriyeva “Labdisk”**

**rəqəmsal laboratoriya avadanlığından tədris prosesində istifadənin əhəmiyyətinə həsr etmişdir.**

Hər bir dövrün insanları zamanın tələbinə uyğun bacarıq və biliklər əldə edib yaşamağa çalışıblar. Yaşadığımız əsrin də özünəməxsus bacarıqları vardır ki, mən də bir müəllim kimi bu bacarıqları qazanmağa və daim fəaliyyətimdə istifadə etməyə çalışıram. Çünki müasir dövrümüzdə cəmiyyətdə yeni ictimai münasibətlərin yaranması, planlı iqtisadiyyatdan bazar iqtisadiyyatına keçid, informasiya əsrinin tələbləri, dünya təhsil sisteminə inteqrasiya, təhsilin məqsəd və vəzifələrinə yeni baxış və yanaşmaların meydana gəlməsi əsrimiz üçün yeni bacarıq və kompetensiyaların formalaşmasına gətirib çıxarmışdır.

XXI əsr bacarıqları:

Yaradıcılıq və innovativlik, tənqidi təfəkkür və problemi həll etmə bacarığı kommunikativ və əməkdaşlıq qabiliyyəti, informasiya ilə işləmək bacarığı, texnologiya vərdişləri, çeviklik, hesabatlılıq, dəqiqlik və s. kimi bacarıqlar XXI əsr üçün təhsilimizdə üstünlük təşkil edir.

Elə bir dövrdə yaşayırıq ki, elm, texnika bir arada sürətlə inkişaf edir. Biz də bu sürətə, dəyişən həyat şəraitinə çevik uyğunlaşmalıyıq. Təsadüfi deyil ki, BMT-nin 3-cü minillik üçün təşkil etdiyi 8 inkişaf istiqamətindən biri İKT-nin inkişafı ili bağlıdır. Belə bir zamanda bir müəllim olaraq mən də bu bacarıqlardan istifadə etməklə şagirdlərimin maraq və diqqətini təhsilə, elmə çəkməyə çalışıram. Buna görə də kimyanın tədrisində əyani vəsaitlərdən, elektron materiallardan istifadə edirəm. Belə vasitələrdən biri də "Labdisk rəqəmsal laboratoriya avadanlığı"dır.

"Labdisk rəqəmsal laborotoriya avadanlıqları" İsrail firması olan "Globisens" şirkətinin məhsuludur. Azərbaycana Təhsil Nazirliyi və Edumadia-Azərbaycan təşkilatı tərəfindən gətirilmişdir.

Bu qurğu ilə işləmək şagirdlərə olduqca maraqlı gəlir. Ən çətin saydıqları dərsi belə asanlıqla qavraya bilirlər. Görəsən niyə?

Labdisk ilə təlim zamanı çeviklik, əyanilik, praktiklik təmin olunur. Çox qısa zaman kəsiyində təcrübə aparıb nəticə əldə etmək olur. Kimya dərslərində praktik işlər aparan zaman asanlıqla hesablamalar aparmaq mümkündür.

Bu cihazla aparılan tədqiqat işləri nəticəsində şagirdlərdə bir çox bilik, bacarıq və vərdişlər formalaşır ki, bütün bunlar onların gələcək həyatlarında mühüm rol oynayacağını sübut edir.

**Səhifəni hazırladı:**
**Aygün Mürşüdova,**
***"Azərbaycan məktəbi" jurnalının şöbə redaktoru***